Qasirin ədəbi irsini toplayan:
İshaq Səbih oğlu Axundov

Qasirin həyat və yaradıcılığını tədqiq edən:
Aybəniz Mustafa qızı Rəhimova

Qasirin ədəbi irsini ərəb əlifbasından çevirib nəşrə hazırlayanlar:
Tahirə Nurulla qızı Nurəliyeva və Paşa Əli oğlu Kərimov

Farsdilli şeirləri tərcümə edən:
Məmmədağa Sultan Məhəmməd oğlu Sultanov

Kitabı tərtib edib çapa hazırlayan:
Tufan İshaq oğlu Axundov

Kitab oxucuları Azərbaycanın XIX əsr klassik ədəbiyyatının parlaq nümayəndələrindən biri olan Axundzadə Mirzə İsmayıl Qasirin həyat və yaradıcılığı ilə tanış edir. Dövrünün şairi və ziyalısı olan Qasir Azərbaycanın Cənub bölgəsinin mərkəzi olan Lənkəranda "Fövcül-füsəha" adlı ədəbi məclis yaradaraq ona rəhbərlik etmişdir. Ədəbi fəaliyyəti ilə yanaşı Mirzə İsmayıl tədrisə də meyl göstərərək pedaqoji fəaliyyətlə məşğul olmuşdur. O, "Üsuli-cədid" məktəbinin əsasın qoyaraq uzun illər burada məktəbdarlıq etmişdir.

Kitab tədqiqatçı alımlər, Azərbaycanın klassik ədəbiyyatı və XIX əsr mədəni-ictimai mühitilə maraqlanan geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

# TƏRTİBÇİDƏN ÖNSÖZ ƏVƏZİ

Çox zaman bəşəriyyətin inkişafında müstəsna yeri olmuş şəxslərdən günümüzə çatan yalnız adlarıdır. Bunlar arasında ədəbiyat sahəsində yazıb yaradan şəxslər də az deyil. Onların yazdığı əsərlər müxtəlif səbəblərdən və müxtəlif yollarla məhv olaraq günümüzə gəlib çatmayıb və onlar haqqında ən yaxşı halda yalnız digər müəlliflərin əsərlərindən müəyyən məlumatlar əldə edə bilirik. Belə aqibətin XIX əsrdə yaşayıb yaratmış Azərbaycanın klassik şairlərindən biri, pedaqoq Mirzə İsmayil Qasir Axundzadənin yazılı irsinin də başına gəlmə təhlükəsi olduğu halda, bir hadisə baş verdi.

XX əsrin 20-ci illərinin əvvəlləri idi. Qasir iyirmi ildən çox idi ki, rəhmətə getmişdi. Azərbaycanda yeni qurulmuş Şura höküməti yeni qaydalar, yeni davranış tərzi tətbiq edirdi. Çox ailələrin üzərini qara buludlar almışdı. Qasirin varislərinin ailələri də belələrdən idi. Şairin böyük oğlu Azərbaycan Cumhuriyyətinin yaradıcılarından, müstəqillik bəyannaməsinə imza atanlardan, Zəngəzur mahalını daşnak ordusundan azad edənlərdən biri olan və Milli Parlamentdə bu mahalı təmsil edən Hacı Səlim Axund Axundzadə Lənkərandan çox-çox uzaqlarda mühacirət həyatı sürürdü. Kiçik oğlu Məşədi Mirzə Səbih daim təqib olduğundan, gah meşələrdə gizlənir, gah bir gün, gah bir həftə, gah da bir neçə aylıq həbs edilib buraxılırdı. Nəticədə o da ata yurdunu tərk edib Bakıya köçməyə məcbur olmuşdu.

Bu hadisələrin ən qızğın cəryan etdiyi zaman, təqribən 1923-25-ci illərdə Mirzə Səbihin ortancıl oğlu məktəbli İshaq bir tədbirin iştirakcısı olur. Komsomol təşkilatı, aralarında İshaq da olmaqla bir dəstə məktəblini Lənkəranın Qəmişəban kəndinə aparır. Orada XIX əsrdə bölgənin tanınmış şairlərindən olmuş və həmin vaxt çoxdan dünyasını dəyişmiş Molla Fəttahın evindən şairdən qalmış bütün əlyazmalarını alaraq bir arabaya yığırlar və üstünə qara parça örtərək “Keçmişi basdırırıq” şuarı altınma dəfn mərasimi keçirirlər. Nəticədə şairin bütün yazılı irsi hardasa kəndin kənarında bir xəndəyə boşaldılaraq basdırılır.

Bu dəhşətli tədbirin şahidi olmuş İshaq, evə qayidan kimi, körpəlikdən gördüyü və şair babasından qaldığını eşitdiyi bütün əlyazmaları yığaraq boxçalara bükür və qalxıb evin banında bir küncdə gizlədir. İllər keçir, Lənkərandakı ev gah boş qalır, gah kirənişinlərə verilir. 1937-ci ildə Mirzə Səbih də Bakıda həbs olunaraq sürgünə göndərilir. İshaq atasının həbsi zamanı onun "bir yekə gön portfel" dolusu əlyazmalarının aparıldıgının şahidi olur. O, atasının da babası kimi müxtəlif şer və xüsusən də mahir həcv yazan olduğunu bilirdi. Burada İshaqın heç nə etməyə gücü çatmır, özünə yalnız babasının yazdıqlarını gizlətməkdə təsəlli tapır. Beləliklə, İshaq xalq düşməni oğlu olur, üstəlik təzəcə evləndiyi Tahirə xanım da xalq düşməni, əksinqilabçı Heybət bəyin qızı idi. O dövrdə bunun nə olduğu hamıya bəllidir.

İkinci cahan müharibəsi başlanır. Neft sahəsində calışan İshaq müharibənin ən qızğın çagında,1942-ci ildə "povestka" alır və getmiş olsa, qayıdıb-qayıtmayacağının sual altında olduğunu dərk edərək, özünü Lənkarana çatdırır. Uşaqlıqda gizlətdiyi "əlyazma boxçaları"nı götürüb, Bakıya Əlyazmalar fonduna gətirərək təhvil vermək istəyir. O zaman fonda başçılıq edən Məmməd Arif rəsmiyyəti pozmamaqdan ötrü əlyazmaları yoxlamağa ehtiyac olduğunu deyərək, 3-4 gün gözləməyi xahiş edir. Nəticədə akt yazılır və əlyazmalara qiymət qoyulur. Həmin məbləğ ordaca "Novruz əminin əli ilə" paylanılır.

Aşağıda təqdim olunmuş Mirzə İsmayıl Qasiri Axundzadənin şeir nümunələri həmin "əlyazma boxçaları"nda olanların bir hissəsidir.

Mirzə İsmayıl Qasirın həm həyat və fəaliyyəti, həm ədəbi irsi tədqiqatçı alimlər tərəfindən müəyyən qədər araşdırılsa da, hələ də geniş oxucu kütləsinə az tanışdır. Bugünə qədər onun yalnız bir şeirlər kitabı nəşr edilmişdir. Bunun da səbəbkarı şairin nəvəsi İshaq olmuşdur. Mühəndis-geoloq olan İshaq Axundov təqaüdə çıxandan sonra bütün səylərini babasının ədəbi irsinin tədqiqi və nəşrinin təşkilinə yönəltmişdir. Onun gərgin səyi nəticəsində şairin "Şeirlər" kitabı 1988-ci ildə işıq üzü görmüşdür. Sevindirici haldır ki, Qasirin ilk kitabının nəşrindən sonra, tədqiqatçı-alim Aybəniz Mustafa qızı Rəhimova tərəfindən şairin həyat və yaradıcılığına həsr edilmiş "Mirzə İsmayıl Qasir" adlı kitab da nəşr edilmişdir. Lakin İshaq həmin zaman dünyasını dəyişdiyindən, həmin sevinci yaşamaq ona nəsib olmamışdı.

Qarşınızda olan kitab Mirzə İsmayıl Qasirin anadan olmasının 210 illiyi ilə əlaqəli nəşr edilib. Bu nəşr Aybəniz Rəhimovanın tədqiqat əsəri və şairin 1988-ci ildəki nəşrinin tərtibatçıları Tahirə Nurəliyeva və Paşa Kərimov tərəfindən bir qədər yenidən işlənmiş və redaktə edilmiş "Şeirlər" kitabı əsasında tərtib edilmişdir.Yeni nəşrə şairin birinci kitabında yer tapmamış bəzi əsərləri də əlavə edilmişdir.

Mirzə İsmayıl Qasir klassik Azərbaycan ədəbiyyatı dövrünün ədəbi ənənələrinə uyğun olaraq, eyni zamanda üç dildən istifadə edib. O zaman şairlər tərəfindən Azərbaycan dili ilə yanaşı, bu dilin qanunlarına uyğunlaşdırılmış ərəb və fars sözləri də geniş istifadə olunurdu. Belə yanaşma klassik ədəbi dilin zənginliyi və çevikliyinə xidmət etmiş olsa da, bu əsərlər müasir oxucu tərəfindən çətin anlaşılır və mənimsənilir. Deyilənləri nəzərə alaraq, təqdim edilən kitaba 1966-ci ildə Azərbaycan EA tərəfindən nəşr edilmiş "Ərəb və Fars sözləri Lüğəti (Azərbaycan klassik ədəbiyyatını oxumaq üçün)" əsasında tərtib edilmiş geniş lüğət də əlavə edilmişdir. Güman edirik ki, lüğət Qasirin istifadə etdiyi söz ehtiyatını tam əhatə etməsə də, yazdığı şeirlərin dərkində müasir oxucuya müəyyən qədər kömək edə biləcəkdir.

# MİRZƏ İSMAYIL QASİR
# AXUNDZADƏ

## DÖVRÜ, HƏYATI,
## ƏDƏBİ YARADICILIĞI
## VƏ
## PEDAQOJİ FƏALİYYƏTİ

# MİRZƏ İSMAYIL QASİRİN HƏYAT VƏ FƏALİYYƏTİ

Şərqşünaslıq elmi daha əhatəli tərzdə başlıca olaraq orta əsrlər Azərbaycan ədəbiyyatı ilə maraqlanmış və bu ədəbiyyatın ümümdünya mədəniyyətinin formalaşmasındakı yerinə və xidmətlərinə diqqət yetirmişdir. XVIII, ələlxüsus da XIX əsr Azərbaycan ədəbiyyatı isə hələ indiyədək üzünün layiqli qiymətini ala bilməmiş, rus və sovet alimləri onu kifayət qədər öyrənmədən əsasən epiqonçu ədəbiyyat hesab etmişlər. Bunun obyektiv və subyektiv səbəbləri vardır.

Subyektiv səbəbi onda görmək olar ki, XVIII əsrə qədər rus ədəbiyyatının özündə yüksək qiymətə layiq ədəbi sima və bədii şedevrlərə rast gəlinmədiyindən sovet ədəbiyyatşünasları həmin dövrün dünya ədəbi xəzinəsini axtararkən əsas diqqəti istər-istəməz Şərqə, o cümlədən Azərbaycana yönəltməli olmuş, onu layiqincə qiymətləndirməyə məcbur olmuşlar. XIX əsrdə rus ədəbiyyatının dünya səviyyəsinə qalxması ilə artıq ədəbiyyatşünaslıq əsas diqqətini onun üzərində cəmləyir, Qeyd edək ki, artıq koloniyaya çevrilmiş Şərqə qarşı təkəbbürlə yanaşır, onu layiqincə qiymətləndirmək hissiyyatını itirir. Bu dövrdən etibarən Azərbaycan ədəbiyyatı Qərbə rus təhlil süzgəcindən keçirilərək təqdim olunur və nəticədə Qərb də XIX əsr Azərbaycan ədəbiyyatını əsasən epiqonçu kimi qəbul edir. “Formaca milli, məzmunca sosialist” partiya tələbi Azərbaycan alimlərinin özlərinin də XIX əsrə düzgün qiymət verməsində bir əngələ çevrilir. F.Qasımzadə kimi görkəmli ədəbiyyatşünasımız “XIX əsrin ikinci yarısında yetişən şairlərdən Mirzə İsmayıl Qasir, Hacı ağa Fəqir Ordubadi, Məmmədtağı Sidqi, Seyid Rza Sabir, Məmmədtağı Bayramzadə, Bakılı Bala Sadıq və başqaları az-çox tənqidi realist şerlər yazırdılarsa da, bunlar realizmə yaradıcılıq metodu kimi yiyələnə bilmirlər. Poeziyada yenə köhnə forma öz hökmünü sürürdü” [26, s.18] yazmağa məcbur idi.

Bütün bunların, əlbəttə, obyektiv səbəbi də var idi: orta yüzilliklər Azərbaycan ədəbiyyatı dünya mədəniyyətinə Nizami, Xaqani, Nəsimi, Xətai, Füzuli kimi nəhənglər verdiyi halda, XVIII-XIX əsrlər ədəbiyyatının inkişaf istiqaməti ictimai-siyasi tarixin burulğanında hissediləcək dərəcədə

dəyişmişdi. Bu ədəbiyyat artıq ümumbəşəri məsələlərdən daha çox milli dərd-sərlə məşğul olmağa üstünlük verirdi. Ədəbiyyatımızdakı bu mövzü dönüşünün isə bir sıra ictimai səbəbləri vardı. XIX əsrin başlanğıcında Rusiyanın Azərbaycanın şimal ərazilərini işğal etməsi və buradakı türk-islam mədəniyyətini və deməli, bütövlüklə cəmiyyəti süni-siyasi üsullarla çürütməyə cəhd göstərməsi elə bir şəraitin yaranmasına təkan vermişdi ki, Azərbaycan ədəbiyyatının artıq eşq-məhəbbət fəlsəfəsi, tərki-dünyalıq və cəfakeşlik mövzuları ilə maraqlanması tədricən arxa plana keçməli idi. Tarixi şərait təbii olaraq bu ədəbiyyatda mövzü ənənələrinin, sufilik, romantizm, lirik məhəbbət hisslərinin yavaş-yavaş öz yerini satiraya, realizmə verməsinə səbəb olurdu. Həyat ədibləri xalqın milli dərdlərinə müraciət etməyə, həm bütövlükdə Azərbaycan üçün, həm də ayrı-ayrı bölgələr üçün nadürüst halları ifşa etməyə təhrik etdi.

Belə bir şərait üçün rus və Qərb alimlərinin Azərbaycan ədəbiyyatından yeni-yeni nizamilər, füzulilər, nəsimilər umması əslində yersizdir. Bu şəraitdə bütün yaradıcılığı daha çox Azərbaycanın daxili problemlərinə həsr olunmuş Vaqif, Seyid Əzim, Mirzə Fətəli, Qasir, Sabir kimi şəxsiyyətlər yetişə bilərdi. Onların və adları ədəbiyyat tariximizdə hələ də öz layiqli yerini tutmamış başqa çoxsaylı şairlərin yaradıcılıqları, müraciət etdikləri mövzular və sənətkarlıq xüsusiyyətləri obyektiv təhlil edildikdə məlum olur ki, XVIII-XIX əsr ədəbiyyatımıza "sosializm realizmi" baxımından başdansovdu qiymət verən sabiq sovet elmi konsepsiyası özlüyündə yerli-dibli səhvdir. Bu dövrə qiymət vermək üçün Nizami və Füzuli yüksəkliyindən deyil, Azərbaycanın real ictimai-tarixi vəziyyətindən, eyni zamanda həmin dövr ədəbiyyatımızın yeniləşmiş maraq dairəsindən çıxış etmək lazımdır.

XVIII-XIX əsr ədəbiyyatımıza bütövlükdə düzgün qiymət vermiş alimlərimiz qeyd etmişlər ki, "Füzuli dövrü üçün şer ədəbiyyatımızda proqressiv rol oynayan qəzəlçilik XVIII-XIX əsrdə öz əhəmiyyətini qeyb etmişdi. İlk öncə Vaqif və Zakirlə (şeirdə), daha sonra Mirzə Fətəli ilə, ümumiyyətlə ədəbiyyatımız daha başqa xətt üzərində inkişaf etməyə başladı" [51, s. 5].

Tarixi dəyişikliklər milli ədəbiyyatımızın təbii olaraq yeni inkişaf yolu tutmasına səbəb oldu. Orta əsrlər ədəbiyyatı sanki "yuxuya dalaraq" ənənəviləşmiş xətt boyu yetirdiyi dahi sənətkarların və islam dininin təqdim etdiyi mövzular üzrə eyni janr və cərəyanlar içərisində yaranırdısa, Gülüstan

və Türkmənçay müqavilələrindən sonra Azərbaycanın düşdüyü vəziyyət, cəmiyyətin tədricən, əlaltından çürüdülməsi, yad rus elementinin minillik tarixi olan Azərbaycan-islam mədəniyyətinə yeridilmiş sanki bu ədəbiyyatı silkələyib oyatdı. Artıq XIX əsr ədəbiyyatı Azərbaycan türklərinin yadelli elementə qarşı müqavimət heysiyyatının, ictimai özünümüdafiəsinin təşəkkülünə kortəbii olaraq başçılıq etməyə başladı. Bu halda isə ədəbi hərəkatın zənginləşməsi, onun yeni əlamətlər əldə etməsi və janr, mövzü cəhətindən varlanaraq, yeni inkişaf yolu tutması qanunauyğun bir haldır. Azərbaycan ədəbiyyatı da bu yolu keçməli oldu.

Bu nöqteyi-nəzərdən "XIX əsr ədəbiyyatımızın ümümi tarixində yeni və coşğun bir inkişaf mərhələsini təşkil edir" [10, s.3]. Azərbaycan ədəbiyyat tarixinin ayrı-ayrı mərhələlərini araşdırdıqda XIX əsrə vulqar sosialogizm konsepsiyasından xali olan yeni qiymət vermək aktual məsələdir.

XIX əsr ədəbi simaları içərisidə bütün yaradıcılığı kifayət qədər geniş tədqiq edilmiş və öz yaradıcılıqları ilə klassiklər cərgəsinə düşmüş Zakir, Seyid Əzim, Mirzə Fətəli Axundov kimi şəxsiyyətlərlə yanaşı, yaradıcılığı, ədəbi irsi kifayət qədər öyrədilmədiyindən ədəbiyyat tarixində layiqli yerini tutmamış, yaxud yalnız adları və yaradıcılıqlarından ancaq bəzi nümunələr məlum olan, əsərlərinin mühüm hissəsi hələ də əlyazma şəklində qalan bir sıra ədiblərimiz vardır. Əlyazma irsini araşdıran alim və tədqiqatçıların ümdə vəzifəsi belə ədəbi şəxsiyyətlərin bütün yaradıcılığını üzə çıxarmaq, onların irsini tam şəkildə xalqa çatdırmaqdır.

Əsərlərinin bir hissəsinin hələ də tədqiq və nəşr olunmadığı, daha dərindən öyrənildikdə XIX əsrin korifeyləri Zakir və Seyid Əzimlə bir pleyadada durmalı olduğunu qət etdiyimiz şairlərdən biri də Mirzə İsmayıl Qasir hesab oluna bilər. Onun Azərbaycan MEA Əlyazmalar İnstitutunda mühəsasında aparılmış ilkin tanışlıq, həyat yolu haqqında toplanmış məlumatlar göstərmişdir ki, "bütün XIX əsr boyu yaşamış Qasir ədəbiyyat tariximiz üçün tədqiq olunmağa layiq bir sənətkardır" [34, s.37]. Onun yaradıcılığının və ədəbi irsinin araşdırılması XIX əsr ədəbiyyat tarixinin yeni faktlarla zənginləşdirilməsi və Qasir sənətkarlığının burada yerinin müəyyənləşdirilməsi baxımından aktuallıq kəsb edir.

Ədəbiyyatşünaslıq tələb edir: "Sənətkarın həyatı, tərcümeyi-halı, ona olan ictimai təsirlər təhlil obyektində əhatə olunmalıdır. Tədqiqatın bu cəhəti

elmi, tarixi əhəmiyyətdən başqa, xüsusən tərbiyəvi məna kəsb etmiş olur" [37, s.57].

Buna görə də Qasirin keçdiyi həyat yolunu və fəaliyyətini öyrənib, düzgün nəticə çıxarmaqdan ötrü onun yaşadığı dövrün - XIX əsr Azərbaycanının ictimai-siyasi mənzərəsini bir daha yada salmaq və ədəbi-mədəni mühitin əlamətdar xüsusiyyətlərinə diqqəti cəlb etmək lazımdır.

## MİRZƏ İSMAYIL QASİRİN YAŞADIĞI XIX ƏSR AZƏRBAYCAN ƏDƏBİ-MƏDƏNİ MÜHİTİ

Kifayət qədər uzun bir həyat yolu keçmiş Mirzə İsmayıl Qasirin yaradıcılığı XIX əsr Azərbaycan ədəbi-mədəni mühitinin aynası hesab edilə bilər. Onun yaradıcılığında orta əsrlərə məxsus ənənəvi qəzəlçilik, füzuliyanə eşq-məhəbbət ünsürləri ilə yanaşı, daha qabarıq tərzdə yeni Azərbaycan ədəbiyyatı özünü göstərmişdir. Bunun ortaya çıxmasında isə dövrün ictimai-siyasi və ədəbi-mədəni mühiti xüsusi rol oynamışdar. Ayrıca qeyd etməyinə dəyər ki, XIX əsrin içtimai-siyasi mühiti Qasir yaradıcılığına təsir edib onun püxtələşməsinə yol açmışdırsa, Qasir yaradıcılığı da özlüyündə dövrünün ədəbi-mədəni mühitinin yüksəlişinə, satiranın sonrakı inkişafına mühüm töhfə olmuşdur.

Azərbaycanın Rusiyaya ilhaqı və iki yerə parçalanması Qasirin uşaqlıq və gənclik illərinə təsadüf etmişdir. Hadisələrin içində olan xalq kütləleri vətənin faciəsini hələ isti-isti tam dolğunluğu ilə hiss etmirdilər. Torpağın parçalanması əvvəlcə imperatorlar arasında həll olunurdu. Şimal ərazilərində qalmış əhali tarixi dönüşü hələ hiss etmir, yeni işğalçıdan nə isə yeni və daha ədalətli idarəçilik gözləyirdi. Azərbaycanlıların Krım müharibəsində, rus-türk, rus-İran çəkişmələrində rus qoşununun tərkibində rəşadətlə vuruşmalarını, ayrı-ayrı ədəbi simaların rus soldatını mədh etməsi faktlarını da bununla izah etmək lazım gəlir. Azərbaycanlılar talenin istehzasını yalnız mənfur çarizmin asta-asta yeritdiyi istsmar siyasəti sayəsində milli cəmiyyətin çürüməyə başladığı sonrakı dövrlərdə dərk etməyə başladılar. Azərbaycan ədəbiyyatında satiranın XIX əsrin ibtidasından deyil, məhz əsrin ortalarına doğru meydana gəlməsinin kökləri də elə bununla əlaqələndirilə bilər. Yada salaq ki, milli satiramızın banisi Zakirin yaradıcılığında bu janra

meyl 30-cu illərin ikinci yarısından [26, s.218] - yaşı 50-ni keçdikdən sonra ətrafda baş verənləri hərtərəfli dərk etdikdən sonra formalaşmışdı. Türkmənçay və Gülüstan müqavilələri yenicə bağlandığı dövrlərdə isə Azərbaycan mühiti hələ əvvəlki əsrlərin inersiyası üzrə milli zəmində və ənənəvi idi. Sonralar xalq öz köklərini itirməyə, öz-özünə yadlaşmağa başlayanda, öz mədəniyyətinin və ictimai-münasibətlərinin məhv edilərək, yerində yad dünyagörüşünün baş qaldırdığını görəndə onun qabaqcıl nümayəndələri hamıdan tez qəflət yuxusundan ayılaraq, yeni milli ədəbiyyatı yaratmağa girişdilər. Ə.Mirəhmədov Zakir haqqında göstərir ki, "şairi satira yazmağa təhrik edən başlıca amil cəmiyyəti başına almış "fisqü fücur"dur, "zülmi-bihesab"dir, çirkin əxlaq normalarıdır. Gözü qabağındakı tarixi şərait belə bir dözülməz halda olduğu üçün o yalnız lirik janrla, məhəbbət və gözəlliyə dair yüksək insani fikir və duyğuların tərənnümü ilə kifayətlənə bilmir" [38, s.124]. Bu sitatın əhəmiyyəti ondadır ki, onu XIX əsr şairlərinin əksəriyyətinə şamil etmək mümkündür. XIX əsr şairinin böyüklüyü onun qəzəl yazıb-yazmaması ilə ölçülə bilməz. XIX əsrdə mövzu və janr dəyişiklikləri vardı, ancaq klassik üslub da hələ sıradan çıxmamışdı və bu da təbii idi. Məsələn, ədəbiyyatşünas N.Qarayev yazır: "Məclis şairlərinin klassik üslubda yazmaq məsələsinə gəlincə, demək lazımdır ki, bunun əsas səbəbini onların fars və ərəb dillərində təhsil aldıqları məktəb- mədrəsələrdə axtarmaq lazımdır" [24, s.6].

Əksinə, XIX əsr şairinin böyüklüyü onun qəzəllə yanaşı, həm də yeni ədəbiyyatın yaranmasında iştirakı, tarixi-ictimai fikrin təşəkkülündə oynadığı rolla ölçülməlidir. XIX əsr şairlərinin isə əksəriyyəti bu ədəbi hərəkatdan kənarda qalmamış, klassikaya meyli yeniləşmə ilə çulğalamışdı. Bu dövrdə yalnız qəzəl yazan epiqonçu şairlərin sayı sovet ədəbiyyatşünaslığının zənn etdiyindən qat-qat az idi. XIX əsr qəzəlçiliyində orta əsrlərə məxsus romantizm ənənələri hələ də özünü göstərirdi, "lakin bu romantizm mücərrədlikdən daha çox konkretliyə yaxındır" [11, s.26] və belə konkretləşmə prosesi qəzəl yazanların özlərinin satira və həcvə meyl etməsində özünəməxsus rol oynamamış deyildi.

İctimai-tarixi şəraiti hərtərəfli araşdırmayan sovet ədəbiyyatşünaslığı XIX əsrdə ədəbi məclislərdə toplaşmış şairlərə irad tuturdu ki, "bu şairlər çox məhdud bir dairədə şeirləşərək dərdləşirdilər; başqa sözlə, onlar milyonlara

xitab etmirdilər. Geniş xalq kütlələrinin bu şeirlərdən xəbəri yox idi" [26, s.470].

Əlbəttə, sovet demaqogiya ünsürləri duyulan bu fikirdə həqiqət yoxdur. Əvvəla, minillik ədəbiyyatımız heç də "milyonlara xitab etmirdi" – şairlər yazıb yaradır, şerləri dillərdə əzbər olurdu, mədrəsələrdə, kitab emalatxanalarında köçürülüb yayılırdı. Azərbaycan əlyazma kitabı tarixinin araşdırılması [bax: 28, s.5-19; 29, s.5-12; 65, s.5-17] göstərir ki, əlyazma kitabı mədəniyyəti məhz XIX əsrə qədər – Azərbaycanın işğalına qədər yüksəlişdə olmuş, XIX əsrdən isə, bir yandan da, tədricən çapçılığın Azərbaycana yol tapması ilə tənəzzülə doğru getmişdir. Çarizmin Azərbaycanda xanlıq-bəylik statusunu ləğvetmə siyasəti nəticəsində kitab sənətkarları sifariş mənbəyindən yavaş-yavaş məhrum olmuş, mədəniyyətimizin bu qolu tənəzzülə uğramışdar. XIX əsrdən artıq kitabçılıq xətti ilə şairlik əl vermirdi. Mədrəsələrdə Qur'anın, Hafizin, Sədinin əsərləri köçürülürdü. Yeni meydana çıxan satiriklərin əsərlərini heç kəs köçürmürdü. Məsələn, Seyid Əzim kimi şəxsiyyətin əsərlərinin cəmi 7 nüsxəsi (Azərbaycanca divanın 3 nüsxəsi, fars divanının, təzkirəsinin bir nüsxəsi və iki şerilər toplusu nüsxəsi) məlumdur [bax:76].

Belə bir şəraitdə əsərlərinin əlyazma kitabı şəklində yayılmadığını və hətta çap etdirmək imkanlarının olmadığını görən XIX əsr şairləri özlərinin ayrı-ayrı regional birliklərini yaradıb, ədəbi məclislərdə toplaşmağı qərara aldılar. Yalnız bu yolla məşhurlaşıb tanınmaq, şerlərinə əbədilik qazandırmaq olardı. Bu məclislərdə isə şairlərin bir-birinə təsiri olduqca güclü idi. Lakin məclis şairlərinin şerləri heç də məhdud dairədə qapanıb qalmır, xalq kütlələrinin dilində əzbər olurdu. Məsələn, Mirzə İsmayıl Qasirin özünün şerlərinin böyük bir qismi onun vəfatından çox-çox sonralar, XX əsrin hətta II yarısında Lənkəran ziyalılarının dilindən toplanıb, təzədən yazıya köçürülmüşdür.

Deməli, XIX əsrin ədəbi məclislərinə, həmin məclis üzvlərinin fərdi yaradıcılıqlarına qarşı daha obyektiv fikir söyləmək və bu mühiti lazımınca qiymətləndirmək vaxtıdır.

Ümumiyyətlə, XIX əsr ədəbiyyatı özünün məclisləri ilə məşhurdur. Düzdür, hələ orta əsrlərdə də Azərbaycan ərazisində ədəbi məclislərin olduğu bəllidir. Məsələn, XII əsrdə Təbrizdə Eldəgizlər və Şamaxıda Şirvanşahlar saraylarında ədəbi məclislər fəaliyyət göstərmiş, Xaqani, Fələki, Beyləqani

kimi şairlər bu məclislərdə şerləşmişlər [3, s.67]. Xətai sarayında Məliküşşüəra Həbibinin başçılıq etdiyi və Süruri, Şahi, Matəmi, Tüfeyli, Qasımi kimi şairlərin iştirak etdiyi ədəbi məclisin fəaliyyəti tarixə düşmüşdür [bax:3,s.308-341]. Lakin "saray ədəbi məclisləri nəzərə alınmasa, Azərbaycanda XIX əsrə qədər şairlərin müstəqil bir məclisi olmamışdır" [24, s.2]. Bu dövrün ədəbi məclislərinin əsas əlamətdar cəhəti onda idi ki, "mənsub olduğu sinifdən, varlı və ya kasıb olmasından asılı olmayaraq, hər bir şair, şer-sənət həvəskarı rəğbət bəslədiyi, yığıncaqlarında iştirak etmək istədiyi məclisin üzvü ola bilərdi. Buna görə də XIX əsr ədəbi məclisləri bir növ demokratik kütləvi yaradıcılıq ittifaqları səciyyəsi daşıyırdı" [24, s.2-3].

Bütün Azərbaycanda məclisçilik sayəsində ədəbi dirçəliş, yenilik sezilirdi. Yeni Azərbaycan ədəbiyyatının formalaşmasında XIX əsr ədəbi məclislərinin xüsusi rolu mütləq qeyd olunmalıdır. Bir yerə toplaşan şairlərin bir-birinə təsirinin artacağı təqdirdə ədəbiyyatda yeknəsəqlik meydana çıxa bilərdi. Bunu nəzərə alan məclis üzvləri öz yaradıcıqlarında həm forma, həm də məzmun yeniliyi axtarır və daim ədəbi axtarışda bulunurdular. Bir məclis üzvlərinin öz aralarında şerləşməklə yanaşı, ölkənin başqa məclislərindəki yenilikləri əxz etmək səyləri bununla əlaqədar idi. Həmid Araslı göstərir ki, belə məclislərdə ən çox müəmmalara, yəni şerin forma və məzmununda qeyri-adilik yaratmağa fikir verilirdi [7, s.95]. Şairlərin bir yerə toplaşması ilə orta əsr şerinə məxsus tərkdünyalıq hissləri, sufilik motivləri sıradan çıxır, "ələmdən nəşəyə", daha ciddi desək, real gerçəkliklərin tərən - nümünə keçid üstün gəlirdi. Burada dinib-danışma, müşairə əsas idi. Klassik üslub müşairəyə bir o qədər də geniş imkan vermədiyi üçün bu cür məclislər mühitində istər-istəməz sıradan çıxmağa meyl edirdi. Ədəbi məclislərin əsas məziyyətlərindən biri də onların son nəticədə Azərbaycan şerindən sufilik ruhunun uzaqlaşdırılmasında, ədəbiyyatın həyata dönüşündə rolu ilə şərtlənə bilər. Digər tərəfdən, "bu məclislər təkcə yaradıcılıq işləri ilə deyil, elmi-nəzəri məsələlərlə də məşğul olur, ədəbiyyat tarixini, xüsusən görkəmli sənətkarları müntəzəm surətdə öyrənirdilər" [10, s.4]. Məsələn, Seyid Əzim təzkirəsinin yaranmasında Şamaxıdakı "Beytüs-səfa"nın fəaliyyətinin müəyyən rol oynadığını söyləmək olar. Üçüncü tərəfdən, bu məclislər anadilli şerimizin inkişafında, deməli, müasir Azərbaycan dilinin ədəbi üslubunun təşəkkülündə mühüm xidmət göstərmiş, onun leksik və üslubi həcminin xəlqiləşməsinə güclü təkan vermişdir. N.Qarayev XIX əsr

məclislərinin fəaliyyətini dərindən öyrənərək, belə nəticəyə gəlmişdi ki, "bu dövrdə Azərbaycan dilində yazmaq meyli çox qüvvətlənmişdi. Məclis şairlərinin, demək olar ki, hamısı öz şerlərini əsasən Azərbaycan dilində yazırdılar" [24, s.5-6]. Bu isə o demək idi ki, ədəbi məclislər rus işğalı altında olan Azərbaycanda vətənpərvərlik, milli dilimizi və mədəniyyətimizi qorumaq ideyalarının başlanğıcını qoyurdu. Artıq məclis üzvü olan şairlər ana dilinin imkanlarından milli mədəniyyətin yaşadılmasının rəhni kimi faydalanır, təhsil aldıqları fars və ərəb dillərindən uzaqlaşırdılar. Bu şairlərin əksəriyyətinin yaradıcılığındakı fars-ərəbdilli şer nümunələri əsas etibarilə ya məclisdən qabaqkı dövrün məhsulu kimi qiymətləndirilə bilər, ya da onlar bu şeirlərini məclisdən kənardakı mühitdə yazırdılar. Məclis dili-ana dili idi.

XIX əsrdə Azərbaycan ədəbiyyatının xoşbəxtliyi onda oldu ki, Azərbaycanın bütün bölgələrində belə ədəbi məclislər yaradılıb fəaliyyət göstərdi və bu məclislər, bir tərəfdən, ədəbiyyatın özünü köhnəlməyə qoymadı, ikinci tərəfdən, özünün minillik qüdrəti ilə çarizmin Azərbaycanı axıradək məhv etmək siyasətinə qarşı sinə gərən ədəbiyyat amilinin gücü ilə özünəməxsus müqavimət hərəkatına çevrildi.

Ədəbi məclis hərəkatının başlanğıcı böyük mütəfəkkir-pedaqoq Mirzə Şəfi Vazeh tərəfindən 1820-ci ildə Gəncədə qoyulmuşdu. Onun yaratdığı, sonralar Tiflisdə fəaliyyətini davam etdirdiyi "Divani-hikmət" məclisi 1852-ci ilədək yaşamış və digər məclislərin ortaya çıxmasında əsas rol oynamışdı. A. Bakıxanovun 1825-ci ildə Qubada yaratdığı "Gülüstan" məclisi əsrin sonuna qədər işini davam etdirmişdi. 30-cu illərdə Ordubadda Şıxəli Naibin başçılığı ilə daha bir "Əncümanüş-şüəra" məclisi yaradılmışdı. Nəhayət, Mirzə İsmayıl Qasir Lənkəranda yaşayarkən buradakı şairləri başına toplayaraq, məclis hərəkatının bu bölgəyə gəlib çıxmasına nail olmuş, "Fövcül-füsəha" ədəbi məclisini yaratmışdı. "Fövcül-füsəha"nın sonralar Şamaxıda və Bakıda "Beytüs-səfa" (1867) və "Məcməüş-şüəra" (1880) məclislərinin yaradılmasına müsbət təsiri olmuşdur. Belə ki, həmin məclis üzvləri Lənkəran məclisi ilə tez-tez əlaqə saxlayır, onun üzvləri ilə mənzum məktublaşırdılar. Hətta Qasirin "Məcməüş-şüəra"nın məclislərinə dəvət olunduğu da məlumdur. Əsrin 60-70-ci illərində Şuşada Mirzə Rəhim Fəna və Mir Möhsün Nəvvab tərəfindən əsası qoyulan "Məclisi-üns" və "Məclisi-fəramuşan"ın da XIX əsr Azərbaycan ədəbi-mədəni mühitinin yeniləşməsində, ədəbiyyatın müasirləşməsində xüsusi rolu olmuşdur [47a,

s.8, 32, 50, 72, 110, 166, 238, 346]. Həmin məclislərin təsiri altında Şəkidə, Qazaxda, Ağdaşda, Dərbənddə, İrəvanda, Təbrizdə, Ərdəbildə ədəbi dərnəklər meydana çıxmışdı [47a, s.430]. N.Qarayev qeyd edir ki, Qasir "Fövcül-füsəha"nı "Divani-hikmət", "Gülüstan" və "Əncümanüş-şüəra" ədəbi məclislərinin zəiflədiyi bir vaxtda təşkil etmişdi [24, s.60], bu isə onu göstərir ki, Lənkərana qədər Azərbaycanın çox yerlərini dolaşmış şair belə məclislərin hər cəhətdən əhəmiyyətini başa düşürdü və məclis hərəkatının sönməməsi üçün əlindən gələni edirdi. Tarixən "Fövcül-füsəha"dan sonra yaranmış məclislərlə və ədəbi dərnəklərlə əlaqə saxlamaqla onların XIX əsr ictimai-siyasi zəminində yeganə milli qüvvə kimi yaşamasına dərin maraq göstərmişdi. "Qasir Şamaxı, Bakı, Ərdəbil, Dərbənd, Şuşa şairləri ilə yaxından əlaqə saxlamış" [24, s.60], onları daim şerləşməyə, ədəbi mübarizədən əl çəkməməyə ruhlandırmışdır. Mücrimə "Şuşidə idim, namə-pəyamın mənə gəldi / Ol əmrə dedim mən də cəvabın sənə, gəldi", - beytilə başlanan məktubdan Qasirin Şuşada olması, orada çox qalması [24, s.57] və deməli, Şuşa ədəbi məclislərində iştirak etməsi bəlli olur.

Ümümiyyətlə, Qasir və ədəbi-mədəni mühitini öyrənərkən şairin istər "Fövcül-füsəha"dakı fəaliyyətini, istərsə də Azərbaycanın digər yerlərindəki ədəbi məclislərlə əlaqələrini, onların işləməsində öz köməyini əsirgəməməsini ayrıca araşdırmaq lazımdır. Bu onun XIX əsr ədəbi-mədəni mühitindəki rolunu başa düşməkdən ötrü vacib məsələdir.

Dövrün mühitini müəyyənləşdirən komponentlərdən biri kimi ölkədə maarifçiliyin, təhsil sisteminin vəziyyəti də nəzərdən keçirilməlidir.

İşğaldan sonra Rusiyanın Azərbaycanı minillik tarixi olan Şərq inkişaf təmayülündən çıxarmaq siyasəti nəticəsində ənənəvi təhsil, təlim-tərbiyə sistemi bərbad hala düşməkdə idi. Nizamilər, vaqiflər, qövsilər yetirmiş köhnə mədrəsə təhsil sistemi artıq öz rolunu başa vurmaqda idi. Əsrin birinci yarısında hələ köhnə elm və maarif inersiya üzrə yaşamaqda davam etsə də, artıq Avropada və Rusiyada təhsil modern vəziyyətə keçməyə başlamışdı, bu isə yeni imperiya ilə tanış olmağa başlamış qabaqcıl ziyalıları düşündürməyə bilməzdi. XIX əsrdəki ictimai-siyasi dəyişiklərin əsas müsbət cəhətini bunda görmək olar ki, Azərbaycan ziyalıları Qərb inkişaf xətti ilə təmasa qovuşdular. Bu elə bir dövr idi ki, bir qəbil dindarların fitvası ilə Azərbaycanda hətta kartof və pomidor əkilməsi belə "şeytan əməli" elan olunmuşdu. "Əkinçi"nin və ayrı-ayrı ziyalıların tövsiyələrinə baxmayaraq,

əhali fanat ruhanilərin təbliğatına uyub bu mədəni bitkilərin əkilməsinə və yeyilməsinə tərəddüd göstərirdi. Hətta Qasirin də başına bununla bağlı bir əhvalat gəlmişdi. “Qasir və Mirzə Sadıq Mehmandarov (A.R.) pomidor və kartofun əhəmiyyətindən danışırmışlar... Bu bitki ancaq şəhərin müsəlman olmayan əhalisi tərəfindən “Fəriştad” məhəlləsində əkilər və həmin bitkini “haramdır”, “murdardır” – deyə yeməzmişlər. Şəhərin cahil ruhaniləri hətta həmin bitkiləri maşa ilə götürüb atarmışlar. Qasirin və Mirzə Sadığın təklifləri ruhani dairələrinin böyük narazılığına səbəb olur. Onların hər ikisinin Lənkərandan qovulması üçün qərar çıxarılır. Hər iki ziyalı əlacsızlıqdan o dövrün müctəhidinə məktub yazaraq ondan kömək istəyirlər. Alınan cavabda deyilir ki, bu bitkiləri məsləhət görənləri Lənkərandan qovmamalı, bəlkə, əksinə, onlara hörmətlə yanaşmalı, dediklərinə riayət etməli, çünki müctəhidin özü də bu bitkilərdən istifadə edir” [57]. Bu kiçicik fakt o zamankı Azərbaycan mühitinin necə rəzil vəziyyətə düşdüyünü, xalqı belə vəziyyətdən çıxarmaq üçün zəmanə ziyalılarının maarifçilik sahəsində necə böyük çətinliklərlə qarşılaşmalı olduğunu göstərir.

İmperiya strukturlarında məmurluğa yol tapmış M.F.Axundov, A.Bakıxanov, H.Zərdabi kimi qabaqcılların səyi ilə Azərbaycanın bütün bölgələrində yeni təhsil sisteminin yaradılması uğrunda mübarizə gedirdi. Əsrin sonlarına doğru ölkənin hər yerində mollaxana və mədrəsələrlə yanaşı, artıq “üsuli-cədid” məktəbləri (“uşkollar”) fəaliyyət göstərməyə başlayırdı.

1861-ci ildə rus çarı təhkimçilik hüququnu ləğv etdikdən sonra imperiyanın hər yerində, o cümlədən Azərbaycanda yeni kapitalist münasibətləri yaranmağa başladı. Bacarıqlı ziyalılarımızın səyi ilə Qori seminariyasında Azərbaycan (türk) şöbəsinin açılması vətənimizin maariflənməsi, yeni təhsil sisteminin sonrakı qələbəsi yolunda mühüm hadisəyə çevrildi. Bununla bərabər, qəflət yuxusunda olan geniş xalq kütlələri uzun müddət yeniliyi qəbul etmir, “üsuli- cədid”də bir “küfr” görürdülər. Hətta Bakının özündə də yeni məktəblərə qarşı müqavimət buzunu sındırmaq lazım gəlirdi. Əlabbas Müznib xatiratında yazırdı: “Bu zamanlarda Mirzə Məcid Qənizadə ilə Həbiblinin 1887-də hökümətdən icazə alıb üsuli-cədid üzrə təsis etdikləri məktəb davam edirdisə, forma cəhətindən ruslara təqlid edildiyi üçün xalq arasında sevilməyirdi” [92].

İstər yeniliyin ab-havasını duyan zamanın* nəbzini tutan yerli ziyalıların, istərsə də Qori seminariyası məzunlarının şəhərlərdə üsuli-cədid məktəbləri yaratmaq cəhdləri çox böyük çətinliklərlə rastlaşırdı.**

1881-ci ildə Qoridən qayıdan Teymur bəy Bayraməlibəyov "tərcumeyi-hal"ında yazırdı: "Mən bu məktəbə gələndə cəmi 4 şagird oxuyurdu. O zaman azərbaycanlılar öz uşaqlarını rus məktəblərinə (yəni dövlət tərəfindən açılmış məktəblərə – A.R.) qoymaq istəmirdilər. Belə hesab edirdilər ki, rus məktəbində oxumaq günah və dini cinayətdir. Avam valideynlərin, dindarların ciddi təsiri olduğunu görüb, mən müsəlman qardaşlarıma kömək etməyi mənəvi borc bilib, qapı-qapı gəzərək uşaqları məktəbə toplamaq məqsədilə təbliğata başladım. Təəssüf ki, çox vaxt təhqir və təqibə məruz qalırdım. Dindar valideynlər məni danlayaraq deyirdilər: "Özün kafir və allahsız olduğun bəs deyil, bizim uşaqları da yoldan çıxartmağa çalışırsan. Rədd ol, kafir!" Belə qəti etiraz cavabı məni ruhdan salmadı" [50, s.115-116].

Beləliklə, "oxutmuram, əl çəkin" zamanında maarifçilik hərəkatı kütləviləşməsə də, ayrı-ayrı yerlərdə məhəlli ziyalıların işə qarışması ilə müəyyən irəliləyişlərə nail olmaq mümkün idi. Məsələn, T.Bayraməlibəyovun tərəfini saxlayan "Fövcül-füsəha" üzvlərinin, ilk növbədə Qasirin yaxından iştirakı ilə Lənkərandakı təhsil sisteminə "əl gəzdirilir" və "Lənkəran məktəbi 5 sinifli olub genişlənir" [6, s.40; həmçinin bax: 55, s.8-26 və s.].

Ümümiyyətlə, istər bundan qabaqkı illərdə, istərsə də həmin illərdə Mirzə İsmayıl Qasirin Lənkəran əhalisi arasında maarif və mədəniyyətin yayılması sahəsində xidmətləri, onun pedaqoji fəaliyyəti ayrıca qeyd olunmalıdır.

Qasir dövrünün təhlilindən aydın olur ki, XIX əsr ziyalıları özləri köhnə mədərəsə təhsili almalarına baxmayaraq, "üsuli-cədid" sisteminin daha mütərəqqiliyini başa düşür, ölkənin maariflənməsi üçün onun daha perspektivli olduğunu hiss edirdilər və beləliklə, köhnə təhsilli ziyalıların dünyagörüşlərində yeniləşmə baş verir, onlar cəmiyyətin də qabaqcıl inkişaf

---

**Şamaxıda S.Ə.Şirvani, Şuşada M.M.Nəvvab, İrəvanda M.K.Əsgərzadə,Naxçıvanda M.T.Sidqi "Üsuli-cədic" məktəbi açmışlar [47,s.104].*

*** *Həmin vəziyyət XX əsrin 10-cu illərində də müşahidə olunurdu [bax.52]*

yoluna qədəm qoyması uğrunda mübarizə aparırdılar. Belə mütərəqqi fikirli, müasirləşməkdə olan ziyalı təbəqəsinin nəzərəçarpacaq nümayəndələrindən biri də Mirzə İsmayıl Qasir idi.

## MİRZƏ İSMAYIL QASİRİN HƏYATI

Şairin həyatı haqqında indiyədək ayrı-ayrı tədqiqatçılar tərəfindən müxtəlif səpkili məlumatlar toplanmışdır. Lakin onların hamısının biryerdə xronoloji düzümünün verilməsi, ayrı-ayrı məqam və tarixlərə qarşı tənqidi münasibət, müxtəlif əlyazma mətnlərindəki faktların təhlili və öz yaradıcılığındakı faktlara əsasən bir sıra dəqiqləşdirmələr aparılması yolu ilə Qasirin həyatı bəhsinin yenidən və mükəmməl işlənməsi hələ də aktual olaraq qalır. Çünki “ədəbiyyat klassiklərinin çoxunu şəxsi həyatı, məişəti, zövqü, rəftarı, insanlara münasibəti, ünsiyyəti həmişə böyük maraq doğurur” [37, s.57] və buna görə də bütün bunlar haqqında məlumatlar dəqiq və ya həqiqətə maksimum dərəcədə yaxın olmalıdır.

Əlyazma qeydlərində və mətbu ədəbiyyatda Mirzə İsmayıl Qasirin anadan olma və vəfatı tarixləri haqqında bəzən fərqli məlumatlar verilmişdir. Bu barədə hətta indinin özündə də fikir müxtəlifliyi ilə rastlaşırıq.

Qasirin adı ilk dəfə müxtəlif təzkirələrdə [23 (mündəricatda) 80, 81, 83, 84 və s.] və ayrı-ayrı şairlərin mənzum məktublarında çəkilir, lakin təzkirə müəllifləri (görünür, məlumatsızlıqdan) onun həyatı haqqında, demək olar ki, heç nə göstərmir, şerlərindən bəzi nümunələr verməklə keçinirlər.

Qasirin həyatı haqqında ilk, həm də bir-birinə zidd məlumatlara yalnız XX əsr ədəğiyyatşünaslarının (M.S.Ordubadinin, S.Mümtazın, Ə.Müznibin) şəxsi arxiv materiallarında rast gəlirik. Bu qeydlərdən məlum olur ki, tədqiqatçılar onun həyat və yaradıcılığı ilə əsasən bu dövrdə maraqlanmağa başlamış, kimliyi, həyatının ayrı-ayrı ictimai maraq doğuran səhifələri barədə məlumatları vaxtilə şairi şəxsən tanıyan qocaman müsahiblərdən onların xatirələri əsasında yığmışlar. Təbiidir ki, şifahi yolla toplanmış faktlarda bir sıra qüsurlar və sual doğuran məqamlar özünü göstərir.

Əlabbas Müznibin arxivində saxlanan qeyddən məlum olur ki, “Mirzə İsmayıl Qasir Şirvan sahili Araz kənarında 1824-cü ildə təvəllüd etmişdir” və “1897-ci ildə ürək ağrısından ölmüşdür” [91]. Görünür, bu məlumat bir ara

məşhur olduğundan F. Qasımzadə də Qasirin 1824-1897-ci illərdə yaşadığını göstərmişdir [26, s.501].

M.S.Ordubadinin arxivində olan daha geniş məlumatda isə Qasirin 1241-ci hicri (1825-ci miladi) tarixində Cənubi Azərbaycanda Əhər şəhərinin Hüran qəsəbəsində anadan olduğu və 1317-ci (1900-cü miladi) ildə vəfat etdiyi göstərilir [97]. Göründüyü kimi, geniş məzmunundan Qasiri şəxsən tanımış olduğu duyulan anonim müəllif şairin ölüm tarixi haqqında dəqiq məlumat verir (ola bilsin ki, o, Qasirin vəfatının və dəfninin şahidi olmuşdur A.R). lakin təvəllüd ili digər faktlarla tutuşdurulduğu irəliyə çəkilmişdir. Yazı müəllifinin Qasirin nəsli haqqında müfəssəl məlumat verməsi onun şairin yaxın adamlarından və ya qohumlarından biri olması ehtimalına əsas verir.* Həmin məlumatın qasirşünaslıqdakı ənənəviləşmiş standartdan kənara çıxdığını və şairin həyatı üçün əlavə faktlar verdiyini nəzərə alaraq, onun əsas tezislərini ayrıca qeyd etmək maraqlıdır. Burada göstərilir ki, "Mirzə İsmayıl Qasir Axund Hacı Molla Səlim Şirvaninin oğludur. Hacı Molla Səlim şirvanlı olmağı məşhurdur. Lakin əsli Ləki əhlindən Kərbəlayı Dövlətxan, o da Mülkünxan, o da Əlixan, o da Əzim ağanın oğludur. Hacı Molla Səlim təhsil edib, fəzilət və kəmalat sahibi olub, Nəcib paşa Kərbəlanı qarət edəndən sonra Kərbəlada təhsil etdiyi zaman öz vətəni–mərufuna qayıdıb, fəsiləsinə nisbət Ləkidə qalmayıb, Şirvan şəhərinə ixtiyar edibdir... Rus dövləti Qafqaz cəbhəsinə qələbə edəndə Hacı Molla Səlim öz əqvam və əşirəsi ilə Mustafa xan xidmətində İrana mühacirət edibdir. Mustafa Hacı Mirzə Ağasinin kəcrəftarına və pis xasiyyətindən rəncidə olub, dübarə Şirvana övdət edibdir (Bu fakta diqqət yetirək, çünki tarixlərin dəqiqləşdirilməsi üçün istinad etmək olar – A.R.). Amma Hacı Molla Səlim Əhər şəhərində qalmağı özü üçün qərar verib... Hacı xan Şükuyi Səlim xan oğlu ki, Məhəmməd şah tərəfindən sahibi-ixtiyar ləqəbi ilə müfəxxər idi, Hacı xanın xidmətinə cəmi məsləkisilkində müntəzəm olublar. Bu halda Hacı xan səltənət tərəfindən Kərnit şəhərinə hökumətə təyin olub. Hacı Molla Səlim ziyarət qəsdi ilə... Kərnitdən gedən vaxtı Hacı xan–mərhum həmvətəninin mühafizəsi və Hacı Molla Səlim qardaşı Məşədi Əzim bəy Hacı xan hüzurunda pişxidmətə xass olub və sair əmioğlanları qulluğunda olmaq üçün Hacı Molla Səlimin xahişi ilə neçə gün Kərnidə təvəqqəf etməyə vadar edir. Bu vaxta Kərnid camaatı

---

* *Qeydlərin müəllifini müəyyənləşdirmək mümkün olmamışdır.*

Hacı xana şuriş edib, Hacı xanı və cəmi onun əqvam və ənsarını qətl edirlər. Hacı Molla Səlim də orada şəhid olur. İcmalən bu əhvalat lazım olduğu üçün yazmağı münasib gördüm. Mirzə İsmayıl təvəllüd edibdir Hüranda – Əhər şəhərinin qəsəbəsidir. Tarixi-1248 hicridə (1832/33) atası Hacı Molla Səlim Kərnidə şəhid olandan sonra 7 yaşında ikən anası Əhərdə olan ev və bağı satıb, Təbrizdə şirvanlıların çox artıq olmaq münasibətilə oraya, yəni Təbrizə hərəkət və orada bir nəhv ilə dirilik ediblər. Mirzə 16 sinninə yetişərkən (? – Qasirin, müəllifin göstərdiyi kimi, 1824/25-ci illərdə anadan olduğunu qəbul etsək, 16 yaşı 1840-cı ildə tamamlanmalı idi. Halbuki dəqiqləşdirilmiş faktlara əsasən, Qasir 40-cı illərdə artıq Şimali Azərbaycanda idi – A.R.) nə olduğu və kimin oğlu oldugünü biləndən sonra şövqlənib Xacə Ələsgər mədrəsəsində təhsilə məşğul olubdur. 4 il təhsil aldıqdan sonra nəsx, təliq xəttini bir qədər gözəl yazdığına görə, bir də xətti yaxşı yazıb, qəşəng və əcib bədii nəqşlər tərtib etdiyi üçün şöhrət edib, tainki Hacı Seyid Hüseyn İsfahani Tabatabani nazimi-tüccar Mirzə İsmayılı öz oğlanları üçün müəllimliyə istəyib. Müşar əleyh də çox artıq fəlakət və yoxsulluğa davam etmədiyi halda müəllimliyi qəbul edibdir... Sonra nədən isə öz vətəni-əslisini arzu edib, Şirvan tərəfinə nazil olubdur. Şirvan xanzadələri Araz kənarında sakin olmaq münasibəti ilə öz əmioğlanları orada sakin olduqları üçün həmin məqamda bir az müddət qalıb. Allahqulu xan ki, Mustafa xanın oğludur, onun oğlanlarına təlim və tərbiyə edibdir. Allahqulu xanın böyük oğlu İbrahim xan idi. Bu arada Abbas bəy Qarabağlı ki, onlara “para uşaqları” deyiblər. Muğana morğu olub, əhli-hal və sahibi-mərifət olduğu üçün Mirzə İsmayılı özünə yoldaş və katib veribdir. Mirzə İsmayıl də əmmaməni papağa təbdil, Abbas bəylə həmsöhbət və bəzi ümuratda iştirak edibdir. Knyaz Tarxanov zamanında Şamaxı quberniya olub, hamı morğular orada cəm olduğu üçün... (Mirzə İsayıl da oraya köçübdür)... Morğuluq dəsgahı münqəriz və sud idarəsi açılandan sonra Mirzə İsmayıl ziyarət etməkdən ötəri Lənkərana gəlib. Qəzayi-ittifaqiyyədən ortancıl dayısı Molla Əli Məhəmməd – mərhumun səbiyyəsini ixtiyar edibdir. Maaşı təng keçdiyi üçün Mirzə Sadıq bəy Mehmandarov Qarabaği Mirzə İsmayılın irəlidəki yaxşılıqlarını görüb Lənkəranda pristav (?-A.R.) olduğu üçün Mirzə İsmayıla artıq dərəcədə hörmət edibdir. Bir mərtəbədəki öz iş otağını Mirzə İsmayıla verib, o da orada həmən Mirzə Sadıq bəyin oğlanlarına təlim və tərbiyə edibdir və sair ətfallardan orada cəm olub, həqiqətdə bir məktəbxana bina olubdur. Necə ki,

mərhum özü buna şerlə təsir edibdir. Bu qərar ilə Lənkəranda sakin olub, əvaxiri-ömründə 17 il şəhərdə rus məktəbxanasında şəriət müəllimi olubdur... Zira ki, artıq yazmağa çox sözlər xatirimdən məhv olubdur" [97].

Göründüyü kimi, təqdim olunan parça qocaman bir şəxsin yadında qalanlardır. Bununla belə, söylənilənlər Qasirin həyatının müxtəlif çağları haqqında fakt verir və tədqiqatçıya yalnız bu faktların dəqiqləşdirilməsi qalır. Qeyd edək ki, Qasirin həyatının burada xatırlanan məqamlarının doğruluğuna əsaslı şübhə qalmır: onlardan bir çoxu, şairin həyatının, məsələn, təhsil illəri və Cənubi Azərbaycanla, eyni zamanda Lənkərana gəlib çıxmazdan qabaqkı illərlə bağlı səhifələri barədə məlumatların genişləndirilməsi baxımından bu yazı olduqca maraqlıdır. Bununla bərabər, Qasirin anadanolma yeri və ili haqqında dəqiqləşdirmə aparmağa ehtiyac vardır, çünki bunlar digər tədqiqatçıların göstərdikləri ilə üst-üstə düşmür.

Yazının müəllifi Qasirin atası Hacı Molla Səlimin tarixçəsini yazarkən göstərir ki, Kərbəla təhsilindən Şirvana qayıdandan sonra rusların gəlişi ilə yenidən vətəni tərk edib, ona hörmətlə yanaşan Şirvan xanı Mustafa xanla birgə İrana mühacirət edir. Sonradan Mustafa xan Şirvana qayıtsa da, Hacı Molla Səlim Əhərdə qalır. Bu fakta diqqət yetirək. Məlumdur ki, 1791-ci ildə Şamaxıda hakimiyyəti ələ almış Mustafa xan "1796-cı ildə Azərbaycandakı rus qoşunlarının komandanı general V.Zubovla aralarında ixtilaf baş verdiyinə görə hakimiyyətdən salınıb, əmisi oğlu Qasım bəylə əvəz olunmuşdu. Rus qoşunları Azərbaycandan çəkildikdən sonra yenidən hakimiyyəti ələ almışdı. 1805-ci il dekabrın 25-də Şamaxı xanlığı Rusiyaya birləşdirildikdən sonra Mustafa xana general-leytenant rütbəsi verilmiş, 1820-ci ildə xanlığın ləğvindən sonra hakimiyyətdən salınmışdı" [74].

Beləliklə, Hacı Molla Səlimin Mustafa xanla İrana mühacirəti dəqiq olaraq 1796-cı ilə düşür. Bu vaxt hələ İsmayıl anadan olmamışdı və həmin mühacirət faktı onun həyat tarixçəsinə düşə bilməz.

Eyni zamanda Qasir haqqında toplanmış başqa məlumatlardan aydın olur ki, "o, təhsilini başa vurduqdan sonra Şamaxıda sakin olan anasının yanına gəlir" [6, s.37]. Məlum olur ki, Qasirin anası heç də həmin naməlum müəllifin göstərdiyi kimi Təbrizdə şirvanlılar məhəlləsində birdəfəlik məskünlaşıb "dirilik etməyib", Şirvana qayıdıb. Ümumiyyətlə, ailəsi ilə bağlı göstərilənlərin hamısının Qasirdən qabaq baş verdiyini güman etməyə əsas var. Yuxarıdakı tarixi fakta qayıtsaq, məlum olur ki, Mustafa xan Şamaxıya

dönəndən sonra yenidən taxtına əyləşmişdi. Belə ehtimal daha inandırıcı görünür ki, Mustafa xan vətənə qayıdanda, yəqin ki, Hacı Molla Səlim Şamaxıda onu nə gözlədiyinin qaranlıq olması səbəbindən xana qoşulmayıb bir müddət Əhərdə və Kərnitdə qalmışsa da, sonradan öz dostunun yenə taxta sahib olduğunu görüb, Şirvana qayıtmağa macal tapmış, heç də Kərnit iğtişaşında qətlə yetirilməmişdir. Çünki məlum fakta görə, "Qasirin atası Molla Səlim Cavad mahalında (indiki Sabirabad, Saatlı rayonlarını əhatə edir) mədrəsə açaraq 1812-ci ilədək müdərrislik etmişdir" [39, s.5]. Şairin nəvəsi İshaq Axundovun öz əli ilə yazdığı və bizdə olan bir səhifəlik qeyddən məlum olur ki, onun böyük bibisi, yəni Qasirin böyük qızı Humra xanım həmin faktı təsdiqləmiş və hətta əlavə etmişdir ki, 1812-ci ildə babası Hacı Molla Səlim "yatdığı yerdə səhvən başqasının yerinə onu toppuzla vurub öldürmüşlər". Bütün bunlar naməlum xatirə sahibinin Molla Səlimin Kərnitdə ölümü və Qasirin Əhərdə anadan olması haqqında verdiyi məlumatı təkzib edir. Belə çıxır ki, 1805-ci ildə Mustafa xana ruslar tərəfindən general-leytenant rütbəsi verilərkən Hacı Molla Səlimin ailəsi artıq Şirvanda yaşayırdı. Bu halda isə Mirzə İsmayıl Qasirin digər tədqiqatçıların əksəriyyətinin qəbul etdikləri təvəllüd tarixi həqiqətə daha uyğun gəlir. Həmin xatirə müəllifi də daxil olmaqla əksər qasirşünaslar belə bir faktdan çıxış edirlər ki, atası qətlə yetiriləndə Mirzə İsmayıl 7 yaşında olmuşdur [6, s.37; 39, s.5] Deməli, Mirzə İsmayıl Qasir "1805-ci ildə Şamaxı qəzasının (indiki Ağdaş rayonunun) Ləki kəndində ruhani ailəsində anadan olmuşdur" [6, s.37]. Tədqiqatçı M.Talışlının "şair 1900-cü il mayın 10-da, anadan olduğu tarixdə Lənkəran şəhərində vəfat etmişdir" [56] deyərək, Qasirin təvəllüd gününü də dəqiqləşdirməyə can atması başqa heç bir mənbədə müdafiə edilmədiyindən əsassız görünür.

M.S.Ordubadi arxivindəki qeydlərin müəllifi bizə Qasirin təhsil illəri və Lənkərana qədər keçdiyi həyat yolu haqqında söz deməyə imkan yaradır və bu baxımdan daha artıq qiymətlidir. Məsələn, Qasirin şairliyə təhsil illərində başlaması fikri təsdiq olunur. Əlyazmalar İnstitutunda saxlanılan və 1802-ci ildə yazılmış M-264 şifrəli çüngdə Qasir İsfahani adlı bir şəxsin şerlərindən parçalar verilmişdir [82, vər.13b, 53a]. Qasir İsfahaninin Mirzə İsmaylın atası Hacı Molla Səlim ola biləcəyini də ehtimal etmək olar, çünki o da öz zəmanəsinin yaxşı təhsil görmüş ziyalılarından biri olmuş, şer yazmışdır. Yuxarıdakı xatirat sahibi göstərir ki, Qasir "özü deyərdi ki

(Qasirlə şəxsi yaxınlığına ən yaxşı sübüt-A.R.), mənim təxəllüsüm əvvəl Məcnun idi. Lakin bəzi yazılarda amın ərəbi, farsi, türki əşarını mülahizə edib, o mərhumun təxəllüsünü Qasir görüb, mən də özümü Qasir adlandırdım. Deməli, Qasir əsildə Hacı Molla Səlimin təxəllüsüdür. Mirzə İsmayıl özü üçün o təxəllüsü əxz edibdir” [97].

Beləliklə, bir tərəfdən, “nazimi-tüccar” Hacı Seyid Hüseyn İsfahaninin “Qasir İsfahani” təxəllüslü şair tanışının yadigarı Mirzə İsmayılı təhsildən sonra axtarıb-tapması faktı təsdiq oluna bilər, ikinci tərəfdən, Qasirin “Məcnun” təxəllüsü ilə tələbəlik dövründən şairliyə başlaması, “Qasir” təxəllüsünü şair kimi yetişəndən sonra götürməsinin “sirləri” aşkar olur. Doğrudan da, zakiranə-sabiranə satirikin XIX əsrin II yarısında “Allah taalanın yanında qüsurlu, nöqsanlı” mənasını verən “Qasir” kimi təxəllüsə üstünlük verməsi kimisə düşündürə bilərdi: bu təxəllüsün ənənəviliyi heç bir şəkk-şübhə yeri qoymur, sufizmin ədəbiyyatımızı tərk etməyə başladığı çağlarda bu təxəllüsün seçilməsinin əsaslı olduğu üzə çxır.

Qasirin təvəllüd tarixi haqqında ən maraqlı faktı şairin nəşr edilən “Şərhi-hal”ından əldə edirik. Farsca yazdığı bu əsərdə Qasirin belə qeydi diqqəti cəlb edir:

بود در ريخ وتاريخ از هجرت كه منتا

(Ömür tapdım hicrətin تاريخ و tarixində ki, mən.

Bu misradakı تاريخ - müəmmasına ilk dəfə diqqət verən tədqiqatçı X.Mehdiyev qeyd edir ki, burada “sənətkar özünün hicri 1217-ci (1802) ildə doğulduğunu aydın şəkildə göstərmişdir” [31, s.95]. Təəssüf ki, bu fakt uzun müddət qasirşünaslığın diqqətindən kənarda qalmış, ədəbiyyat tarixinə düşməmişdir. Hazırda, demək olar, bütün mənbələrdə – ədəbiyyat tarixində, ensiklopedik mənbədə, Qasirə həsr olunmuş elmi və elmi-kütləvi məqalələrdə və s. onun təvəllüd ili 1805-ci miladi ilindən hesablanmış və bu, artıq ümumməqbullaşmışdır. Digər tərəfdən, X.Mehdiyevin üzə çıxardığı müəmma hər nə qədər qiymətli olsa da, XIX əsrin əvvəllərindəki şəraitdə hansı məqamdasa şərtilikdən uzaq olmaya da bilərdi və ümumiyyətlə ədəbiyyat tarixində klassiklərin ayrı-ayrı tarix göstəricilərində müəyyən şərtiliyə yol verilməsinin labüdlüyünü yada salmaq olar. Məsələn, Nizaminin, Füzulinin, Nəsiminin anadan olma və ya vəfat tarixləri uzun müddət şərti

olaraq göstərilmişdi. Həyat yoldaşı Hənifə xanımın öz əli ilə Həsən bəy Zərdabinin tərcümeyi-halında onun 1837-ci il noyabrın 12-də anadan olduğunu [98] göstərməsinə baxmayaraq, Azərbaycan ədəbiyyatı tarixində 1842-ci il kimi təsbit olunmuşdur. Belə faktlar çoxdur. Bütün bunlar ədəbiyyat tarixində analoji faktların cüzi tərəddüdünə yol verir, başqa sözlə rəsmi pasportun olmadığı bir şəraitdə tarixi rəqəmlərin "yuxarı-aşağı" olması təbii idi.

Yeri gəlmişkən, mətnşünaslıqda da etiraf olunur ki, "müəllifin göstərdiyi tarix mətnşünas tərəfindən qeyd-şərtsiz qəbul oluna bilməz. Bu yoxlanılmalıdır. Çoxdan yazılmış əsəri çap etdirərkən (bizim məsələdə: çoxdan baş vermiş hadisəni xatırlayarkən – A.R.) müəllif tarixdə səhv edə bilər [70, s.203].

Buna baxmayaq, Qasirin atası Hacı Molla Səlimin vəfatı ilində 7 yaşında olması və onun 1812-ci ildə vəfat faktından çıxış edərək, 1805-ci ildə anadan olması haqqında toplanmış məlumatları qəbul etsək də, X.Mehdiyevin tapıntısına diqqəti xüsusi cəlb etməli oluruq. Yəqin ki, Azərbaycan ədəbiyyatı tarixinin Mirzə İsmayl Qasirə həsr olunmuş hissəsində gələcəkdə şairin təvəllüd tarixinə bir daha nəzər yetiriləcəkdir.

Şairin anadan olma yeri haqqında da müxtəlif fikirlər mövcüd olmuşdur. Haqqında yuxarıda qeyd etdiyimiz anonim xatirəsinin Qasirin Əhərdə doğulması haqqında məlumatı dəqiq sayıla bilməz. Qasir şerlərindən nümunələri ilk dəfə "El şairləri" kitabında nəşr etdirmiş Salman Mümtaz "burada qeyd edilən el şairləri barəsində məlumatı olan şəxslərdən rica edirəm ki, qəzetə və məcmuələr vasitəsi ilə öz məlumatlarını tənqid və ya məqalə tərzində yazmaqdan çəkinməsinlər. Bu kibi yoldaşlara indidən təşəkkür edirəm" [43, s.7], - deyə səmimi müraciət etmiş, bu yolla şerlərindən əlinə keçənləri ilk dəfə nəşr etdirdiyi və haqqında məlumatı olmayan klassiklər haqqında məlumat toplamağa çalışmışdısa da, bir qədər sonra çox kobud tərzdə hücümlara məruz qalmışdı. Onun arxivindən tapdığımız və çap üçün nəzərdə tutulmuş bu yazının nə yolla Mümtaz arxivinə düşdüyünü müəyyənləşdirə bilmədiyimiz latın qrafikası ilə makina çapında oxuyuruq: "Birinci dəfə olaraq Qasirin haqqında az-çox təlimat verənlərdən birisi Salman Mümtaz olmuşdur. "Azərbaycan ədəbiyyatı. El şairləri" adlı Mümtazın əsərlərindən verilən məlumat tamamilə yanlışdır. Mümtaz Qasiri şirvanlı hesab edir. Bu qətiyyən düzgün deyildir. Qeyd etmək

lazımdır ki, Mümtaz tərəfindən dərc edilmiş ... şerləri şairin lənkəranlı olduğunu isbat edərək Salman Mümtaz məzkurun şirvanlı olmasını isbat etmək istəyir ... S.Mümtaz tərəfindən Azərbaycan ədəbiyyatı tarixini təhrif etmək heç kəsə gizlin olmasa gərəkdir. Ucuz xaltura, yeni kəşf etmək, təzələrə səthi yanaşmaq, bu yaxud digər bir şairin əsərlərini öyrənməmək və onları ictimai, siyasi və ədəbi cəhətdən qiymətləndirməmək Salman Mümtazın xasiyyətlərindən birisidir. Qasiri Lənkərandan Şirvana köçürməklə Mümtaz isbat etmişdir ki, o, Azərbaycan ədəbiyyatına bir gəlir mənbəi kimi yanaşır... Qasirin haralı olub-olmaması xırda bir məsələ deyildir... Görünür, bu məsələ Mümtaz üçün o qədər də əhəmiyyətli deyildir" [Arx. 38, q.17 (358)].

Düzdür, Qasir kimi bir sənətkarın uğrunda ədəbi "vuruşmağa" dəyər, lakin yazının başqa bir yerində "Şairin tərcümeyi-halını yazmağa müvəffəq olmadıq... Onun anadan olduğu və vəfat etdiyi il (?! – A.R.) məlum deyildir. Onu qeyd etmək kifayətdir ki, Qasir XIX əsrin sonuncu illərindən başlayaraq (?! – A.R.) ədəbi fəaliyyətdə bulunmuş, XX əsrin əvvəllərində vəfat etmişdir", - deyə öz profanlığını etiraf edən 37-ci il qoxulu* yazı müəllifinin görkəmli ədəbiyyatşünasa hücumuna Qasir haqqında yalnız 50-ci illərin sonları – 60-cı illərdən genişlənməyə başlayan araşdırmalar cavab verdi.

Digər repressiya qurbanı, istedadlı ədəbiyyatşünas Əlabbas Münzib də Qasir haqqında bioqrafik məlumat toplamağa girişmiş, onun şerlərini toplayaraq, yəqin ki, özünün ayrı-ayrı şairlərin müfəssəl şerlər toplusunu buraxmaq ənənəsinə müvafiq tərzdə Qasir yaradıcılığını nəşrə hazırlamağa başlamışdı. Qasirin nəsli və haralı olması haqqında o da məlumat toplayırdı. Şairin öz əcdadları və anadan olma yeri haqqında "Şərhi-hal"ında getmiş

نسله دولت خان اسماعیل از صلب سل
منشتم گیلان زمین اصلیم ز خاك شیروان

misrasına ilk dəfə məhz Müznib diqqət yetirmişdir [91].

Bu beyt həmçinin Qasirin birinci (birbaşa) babasının Mülküm xan olması haqqında məlumatı [6,s.37; həmçinin onun əlimizdə olan qeydi və s.]

---

* *Eyni yazını əski əlifbadada variantı var [Arx.38,q.-35].*

inkar edir və M.S.Ordubadi arxivindəki xatirə müəllifinin Qasirin şəcərəsi haqqında göstərdiklərini təsdiqləyir: Əzim ağa – Əli xan – Mülküm xan – Dövlət xan – Hacı Molla Səlim – Mirzə İsmayıl Qasir. Qasir Dövlət xanın nəslindən Səlimin oğlu olmasını, əslinin İrandan köçməsini və Şirvanda anadan olmasını "Şəhri-hal"ın həmin hissəsində yazmışdır.

Beləliklə, indiyədək aparılmış tədqiqatları və dəqiqləşdirilmiş məlumatları bir yerdə götürərək şairin tərcümeyi-halını aşağıdakı kimi təsvir etmək olar.

Mirzə İsmayıl Hacı Molla Səlim oğlu Qasir 1802-1805-ci illər arasında Şirvan xanlığının Ləki kəndində ruhani-ziyalı ailəsində anadan olmuşdur.

Qasirin ulu babası Molla Mülküm xan öz ailəsi və oğlu Dövlət xanla birlikdə 1750-60-cı illər arasında İrandan (ola bilsin ki, İsfahan və ya Əhrəm şəhərindən) Araz çayı kənarındakı Ləki kəndinə köçmüş və həmişəlik burada sakin olmuşdur [6, s.37; həmçinin onun əlimizdə olan qeydi və s.]. İranda onların qohum- əqrabaları qalmış və sonralar Qasir onlarla əlaqə saxlamışdır. Qasirin bacılarından birinin Əhrəmdə, ikisinin isə Təbrizdə ərdə olmaları haqqında məlumat vardır [İ.Axundovun öz bibisi Humra xanımın dedikləri əsasında yazdığı və əlimizdə olan qeydi].

Dövlətxanın oğlu, Qasirin atası Molla Səlim dövrünün mükəmməl təhsil görmüş, Kərbəlada oxumuş ziyalılarından biri olmuşdur. Onun "Qasir" təxəllüsü ilə türk, ərəb və fars dillərində şerlər yazdığı məlumdur. Kərbəlada təhsilini başa vurandan sonra Hacı Molla Səlim vətəni Şirvana dönmüş, sonra ailəsi ilə bir müddət İrana köçüb, Əhrəm xanlığında qarşıdurma səngiyəndən sonra Hacı Molla Səlim yenidən şimala qayıtmış, Cavadxan mahalında mədrəsə açaraq şagirdlərə dərs demişdir.

"M.İ.Qasirin nəvələrinin və böyük qızı Məşədi Hümranın vermiş olduğu məlumata əsasən, Molla Səlimin yeddi qızı, bir oğlu olmuşdur" [6, s.37].

İsmayıl hələ balaca ikən atası 1812-ci ildə vəfat etmişdir. "Atasının ölümündən sonra 12-13 yaşlarında Cənubi Azərbaycanın Əhər qəsəbəsində yaşayan bacısıgilə getmiş və təhsilini davam etdirmişdir. 4 il burada oxuduqdan sonra Təbrizə getmiş, ərəb və fars dillərini, Şərq ədəbiyyatını və fəlsəfəsini mənimsəmişdir".[6, s.37].

Qasirin ilk təhsilini Əhərdə alması fikri [34, s.38] dəqiq deyildir, ən azı ona görə ki, ruhani-ziyalı ailəsində böyümüş Mirzə İsmayıl 12-13 yaşlarında İrana gedənə qədər yazıb-oxumağı bacarmaya bilməzdi.

Ə. Məmmədovun göstərdiyi kimi, "Qasirin şer yazmağa nə zaman başladığı dürüst məlum deyildir. Lakin hələ cavan yaşlarında Təbrizdə təhsil alarkən Balaxanım adlı bir qızı sevməsi və nakam məhəbbətini şerlə ifadə etməsi çox gənc yaşlarından yaradıcılığa başlamasına sübüt ola bilər" [34, s.40]. Həmin ehtimalı inkişaf etdirən türk ədəbiyyatşünası Xəlil Açıqgöz göstərir ki, Təbrizdə təhsil alarkən "Hafizi, Füzuliyi, Cığatay şairlərini oxuyan Qasir bir tərəfdən şerlər də yazmağa başlar" [59, s.36].

Beləliklə, Qasirin təhsil illərini səmərəli keçirməsi, təhsillə yanaşı, "Məcnun" təxəllüsü ilə bədii yaradıcılığa başlaması məlum olur.

"Qasir Təbrizdə təhsil alarkən bəzi vaxtlarda Ordubada (dayısı Hüseyn Sultangilə), bəzən də Lənkəranın Sütəmürdov kəndində yaşayan ikinci dayısı Molla Əliməmmədgilə gedər" [39, s.5-6] və tətil vaxtını buralarda keçirərdi. Qasirin haqqında samballı məlumat toplamış tədqiqatçılardan biri qeyd edir ki, "Təbrizdə yaşadığı illərdə Qasir yaxın dostu Əsgərxan bəylə birgə rus dilini öyrənməyə səy göstərir" [56]. Bu fikri dəqiqləşdirmək lazımdır. Təbirdən elə çıxır ki, Qasir və Əsgərxan bəy rus dilini Təbrizdə öyrənməyə başlamışlar. Halbuki Təbrizdə belə bir imkanın ola biləcəyi şübhəlidir. Belə demək daha doğru sayıla bilər ki, Qasir Təbrizdə təhsil illərində tətil zamanı qohumlarının yanına qayıdarkən "Ordubadda yaşayan dayısı Hüseyn Sultanın təkidi ilə rus dilini öyrənmiş, rus ədəbiyyatı ilə tanış olmuşdur" [6, s.37] və ola bilsin ki Ordubada öz dostu Əsgərxan bəylə birgə getmişdir. Rus dilini öyrənməyə girişməsi Qasirin sonrakı həyat yolunda öz izini buraxmış, o, tərcümanlıq etmiş, hətta rus ədəbiyyatından tərcümələr də etmişdir.

Beləliklə, Mirzə İsmayıl Qasirin 1815-1818-ci illərdə təhsil almaq üçün Əhərə, dörd il sonra Təbrizə köçməsi, burada təhsilini kamilləşdirməsi məlum olur. Təxmin etmək olar ki, Qasir cənubda 8-10 il müddətində təhsil almışdır.

Təhsili başa vuran Mirzə İsmayılın xəttatlıq sənətinə dərindən yiyələndiyi və geniş məlumatı şəxs olduğu üçün İsfahanlı Seyid Hüseyn Təbətəbai İsfahana dəvət etmiş, ömrünün müəyyən hissəsini onun oğlanlarının təlim-tərbiyəsinə, təhsilinə həsr etmişdir. Beləliklə, Mirzə İsmayıl Qasirin pedaqoji fəaliyyətinin başlanğıcı qoyulmuşdur. "Nazimi-

tüccar" Seyid Hüseynin evində müəllimmliyə başlaması Qasirin sonrakı pedaqoji müvəffəqiyyətlərində, şagirdlərə fərdi yanaşma metoduna yiyələnməsində müsbət rol oynamışdır. Mirzə İsmayıl Qasir öz ana vətəninə şair və müəllim kimi qayıtmışdır.

Qasirşünasların hamısı bundan sonra onun həyatının 40-cı illərinə diqqət yetirmişlər. Mərhum alimimiz Əzizağa Məmmədov Qasirin 1840-cı ildə (artıq 35-38 yaşlrında) rus təbəəsi sayıldığı üçün Qaradonlu sərhəd idarəsinə tərcüməçi təyin olunması faktının sabiq Azərbaycan Neft və Kimya İnstitutunun müəllimi Əli Muxtar Qasımovun "Jüngi-mən"indən götürüldüyünü qeyd edir [34, s.38]. Halbuki Mirzə İsmayıl, İsfahanda da müəyyən müddət yaşadığını nəzərə alsaq, 1830-cu illərin ortalarında artıq Şirvana qayıtmışdı. Məlum faktdır ki, təhsildən sonra o, bir müddət Şamaxıda, anasının yanında yaşamış [6, s.37; 41 və s.], sözsüz ki, Şamaxının yenilikçi ziyalıları ilə ünsiyyət saxlamış, ədəbi yaradıcılığını davam etdirmişdir. Naməlum müəllifin onun həyatının bu illəri haqqında verdiyi məlumat da maraq doğurur [97]. Bu dövrdə Qasirin əmioğluları və Şirvanın bir sıra xanzadələri Araz kənarında sakin olmuşdular və artıq möhkəmləndirilməyə başlamış Rus-İran sərhədindəki gömrükxanalarda morğuluq edirdilər. Müəyyən vaxt anasının yanında qaldıqdan sonra Qasir də, görünür, əmioğlularının dəvəti ilə sərhəd rayonlarına gəlir. Burada axırıncı Şirvan xanı Mustafa xanın oğlu Allahqulu Qasiri öz oğlu İbrahimə dərs deməyə, onun təlim-tərbiyəsi ilə məşğul olmağa dəvət edir. Maddi ehtiyac şairi bu dəvəti qəbul etməyə məcbur edir. Beləliklə, Qasirin pedaqoji təcrübəsi artmaqda davam edir.

Bu illərdə Azərbaycanın ictimai-siyasi həyatında bir sıra yeniliklər baş verir. 1840-cı il aprelin 10-da Peterburq Zaqafqaziyada inzibati islahat haqqında qanun verir [75, s.662]. Şamaxı Xəzər vilayətinin mərkəzi elan olunur [72, s.257]. Vilayətin divanxanası Şamaxıda yerləşdiyi üçü ndövlət qulluğunda olan məmurların çoxu oraya axışır. Gömrükxanadakı morğularda Şamaxıya köçdüklərindən sərhəd idarəsində boş vəzifələr ortaya çıxır və gömrükxananın rəisi "əhli-hal və sahibimərifət" Abbasbəy Qarabağlı Mirzə İsmayılı özünə katib və dilmanc götürür. Zəmanəsinin yaxşı təhsil görmüş ziyalılarından biri olan "parauşaqları"ndan Abbas bəylə "əmmaməni papaqla dəyişmiş" Qasir arasında səmimi dostluq münasibətləri yaranır və təxminən on ilə yaxın müddətdə şair burada rəsmi dövlət qulluğunda məmurluq edir.

Qasir Qaradonluda olarkən Həcər adlı qızla evlənir.

Qasirin Qaradonluda keçən həyatı ilə bağlı ayrı-ayrı müəlliflərin topladığı faktlar maraq doğurur. Ə.Məmmədov göstərir ki, Qasir Qaradonluya gələrkən "Muğan səhrasında uzun yolu piyada getməli olur. O, sərhəddə yığılmış İran qoşununa rast gəlir. Həmin vaxt İran tərəfi ilə Rusiya arasında mübahisəli sərhəd məsələsinin həlli üçün danışıqlar aparılırmış. Qasir İran qoşunları düşərgəsində vəzirin çadırı qarşısından keçərkən onun münşisi tərəfindən şahmat qutusunun çadıra aparmağını görür. Qasir münşiyə şahmat taxtasının bir xanasında vəzirə çatdırmaq üçün şer yazmaq istədiyini söyləyir. Münşi əvvəl etiraz etsə də, şairin təkidindən sonra razılıq verir". Qasir farsca yazır ki, "əgər məni mat eləsən, sənə fil nəslindən əmələ gələn bir at bağışlaram, əks halda vətənə piyada getməlisən". Sonra məlum olur ki, "Qasir oyun əsnasında vəziri bir neçə dəfə mat edir. Kəsilən şərtə görə vəzirdən bir yaxşı at alıb Qaradonluya gəlir" [34,s.38-39].

Əlbəttə, bu nağılvari rəvayətdə hansısa məqam şişirdilmiş ola bilər. Ancaq bizim üçün hadisənin özü maraq doğurur. Çünki, bir tərəfdən, bu, Qasirin yaxşı şahmat oynadığı, ikinci tərəfdən, vəzirlə görüşü, onun tərəfindən hörmətlə qəbul olunması haqqında fakt verir. Qasirşünas M.Talışlının fərziyyəsinə görə isə, Qasir Muğan səhrasındakı çadırda vəzirlə deyil, onunla danışıqlar aparmağa gəlmiş Mirzə Fətəli Axundovla şahmat oynamışdı. Doğrudan da, Qasirin Mirzə Fətəli ilə yaxın tanışlığı olmuş, Məşədi Hümranın söylədiyinə görə, dəfələrlə o, Lənkəranda Qasirin qonağı olmuşdur. Nəhayət, Qasirin Lənkərana gəlib çıxması tarixçəsində bir-iki məsələyə diqqət yetirmək lazımdır. Qasir haqqında tədqiqat aparmış müəlliflər göstərirlər ki, Qaradonluda məmurluq vəzifəsi Mirzə İsmayılın ürəyincə deyildi. "Şair daha çox ictimai xeyir verən işlə və bədii-elmi yaradıcılıqla maraqlandığından rəsmi dövlət qulluğu mənəvi cəhətdən onu təmin etmirdi" [41]. Görünür, Qasiri uzun müddət Qaradonluda saxlayan onun Abbas bəy Qarabağlı ilə dostluğu və Həcər xanım olmuşdur. Təxminən 50-ci illərin başlanğıcında tale onu XIX əsrin digər tanınmış ziyalısı Sadıq bəy Mehmandarovla görüşdürür və bu, şairin həyatında dönüşə səbəb olur.

Bəzi tədqiqatçıların fikrincə, 60-70-ci illərdə, bəzilərinin yazdığına görə isə, 50-ci illərin əvvəllərində Sadıq bəy Mehmandarov Lənkəran qəzasında məhkəmə katibi təyin olunduğu üçün Şuşadan Lənkərana gedərkən

yolüstü Qaradonluda Mirzə İsmayıl Qasirlə tanış olub, onu müəllimlik etmək üçün Lənkərana dəvət edir. Bu məsələ bir qədər dəqiqləşdirilməlidir.

M. Talışlı və V. Fərzəliyev göstərirlər “keçən (XIX- A.R.) əsrin 60-70-ci illərində Qaradonluda sərhəd idarəsində tərcüməçi işləyən Qasir Mirzə Sadıq bəy Mehmandarovun dəvəti ilə Lənkərana müəllimliyə gəlir”[57].

Halbuki M.Talışlı bundan əvvəlki məqaləsində Qasirin 1840-cı ildə Qaradonluda tərcüməçilik vəzifəsinə dəvət olunmasını, on ilə yaxın bir müddətdə orada işlədiyini göstərmişdi [56].

Yuxarıdakı iki sitatda verilmiş bəzi faktlara razılaşmaq çətindir. Belə ki, Sadıq bəy Mehmandarov Lənkərana məhz 50-ci illərin ibtidasında köçmüşdür. Ensiklopediyada onun oğulları İbrahim bəyin 1852-ci, Səməd bəyin 1857-ci, İsaq bəyin 1858-ci ildə məhz Lənkəranda anadan olmaları qeyd olunmuşdur [73, s.469-470]. Deməli, Sadıq bəy Qasirlə də məhz 50-51-ci illərdə tanış ola bilərdi. İkincisi, Sadıq bəy Qasiri məhz müəllimliyə dəvət etmişdisə, onun üçün münasib bir şərait də yaratmalı idi. Halbuki öz məktəbini yaradana qədər Qasirin məktəbdarlıqda nə qədər əzab-əziyyət çəkməsi onun öz şerlərindən məlumdur.

Bütün bunlar Sadıq bəy Mehmandarovun Qasiri Lənkərana müəllimliyə dəvət etməsi fikrini şübhə altına alır. Görünür, şairi Lənkərana dəvət edərkən Sadıq bəy onun ərəb, fars və rus dillərini bilməsini, gözəl xəttat olduğunu görüb yüksək qiymətləndirmiş, Lənkəran qəza məhkəməsinin katibliyində işləməsini istəmişdi. Sözsüz ki, Qasir kimi mirzələr praktiki işdə məhkəmə katibinə, dövlət qulluğuna çox lazımlı idilər.

Anonim yazı müəllifi Qasirin yaxşı şahmat oynaması məsələsinə toxunaraq yazır: “Qasir şətrənci çox yaxşı bilərmiş. Hətta Peterburqdan Lənkərana hər il bir nəfər komissar gəlib, İran və rus sərhəddi məsələsini həll edərmiş və həman komissar Qasiri tələb edib, onunla şətrənc oynarmış” [91]. Güman etmək olar ki, imperiyanın paytaxtından durub gələn səlahiyyətli “komissar” dövlət qulluğunda olmayan, hansısa başqa bir işlə məşğul olan rəiyyət adamı ilə şahmat oynamağı şəninə sığışdırmazdı.

Belə faktların təhlili göstərir ki, 50-ci illərin əvvəllərində Mehmandarovun təklifi ilə Lənkərana köçən Qasir müəyyən vaxt ərzində qəza məhkəməsinin katibliyində, dəftərxanada işləmişdir. Lakin hələ Qaradonluda buna bənzər işdə işləmiş müəllim və şairin “daha çox ictimai

faydalı işlə və bədii-elmi yaradıcılıqla" maraqlanması və dövlət qulluğunun onu təmin etməməsi məsələsini yada saldıqda, belə qənaətə gələ bilərik ki, məhkəmədəki vəzifəsi də Qasirə mənəvi zövq verməmiş, o, ya dövlət qulluğunda ola-ola, ya da bu vəzifədən imtina edərək, tezliklə məktəbdarlığa üz tutmuşdur. Ancaq bir şey faktdır ki, Mehmandarov Qasiri Lənkərana müəllimliyə dəvət etməmişdir və həqiqətən də, məhkəmə katibinin yenicə işə təyin olduğu bir şəhərə öz tanışını məhkəmə işinə deyil, müəllimliyə dəvət etməsi heç məntiqi cəhətdən də ağlabatan sayıla bilməz.

Beləliklə, Mirzə İsmayıl Qasir Lənkəranda fəaliyyətini mirzəliklə başlamış, bir necə ildən sonra Lənkərandakı köhnə üsullu məktəblərdən birində dərs deməyə üstünlük vermişdir. Lakin mütərəqqi fikirli pedaqoqu buradakı tədris üsulu təmin etmədiyindən özü yeni bir "üsuli-cədid" məktəbi açmaq fikrinə düşür.

İki-üç il sonra Qasirin həyat yoldaşı vəfat edir və o, Sütəmürdov kəndində yaşayan dayısı Əliməmmədin qızı Bibixanımla evlənir.

Sonrakı illərdə Qasir Lənkəran məktəbinin formalaşmasında yaxından iştirak etmiş, pedaqoq kimi fəaliyyət göstərmişdir. O, vaxtının böyük bir hissəsini özünün təsis etdiyi ədəbi məclisin fəaliyyətinə həsr etmişdir.

Beləliklə, Qasirin həyatının bu sahələri haqqında ayrıca danışmaq lazım gəlir.

"İrandan təhsildən qayıtdıqdan sonra (? – A.R.) bütün həyatı boyu Lənkəranda yaşamışdır" [35, s.122] fikri yerli-dibli səhvdir. Əvvəla, ona görə ki, Qasir İrandan öz ana vətəni Şamaxıya qayıtmışdı. İkincisi, ona görə ki, Lənkəranda yaşadığı illərdə də Azərbaycanın müxtəlif şəhər və kəndlərini gəzmiş, Şamaxıda, Şuşada uzun müddət qalmış, hətta qocalıq illərində Bakıya da köçmüşdü.

Mirzə İsmayıl Qasir XIX əsr Lənkəran ziyalıları mühitinin sayqılı nümayəndələrindən biri olmuş, mərifət dünyasında xətri əziz tutulmuşdur. Şəhərin seçilmiş qonaqları Lənkərana gələndə Qasirlə də görüşər, onunla yaradıcı ünsiyyətdə olardılar. Məsələn, akademik B.V. Miller akademik B.A.Dornun Lənkərana tez-tez gəlməsindən, burada Mir İbrahim bəy, Mirzə Ələkbər və Molla İsmayıl Qasirlə* əlaqə saxlamasından danışır [68, s.16-17].

*S.Mumtaz da onu "Molla İsmayıl Qasir" kimi təqdim etmişdi [43,s.174].*

İkinci tərəfindən, Lənkəranın xurafat qüvvələri şairi həmişə ələ salır, onun maarifçilik sahəsində canfəşanlıq göstərməsini lağa qoyurdular. Ruhani və fanatiklər Qasiri "babi" adlandırıb addımbaşı təhqir edir, onunla əl verib görüşməkdən qaçırdılar. İ.Axundov qeyd edir ki, Qasirin həcv yazmağa başlamasında Lənkəran ruhanilərinin ona pis münasibəti də rol oynamışdır [6, s.42]. Belə haqsız hücumlardan zinhara gəlmiş qoca şair dostlarının köməyi ilə Bakıya köçmüş və bir müddət orada yaşamalı olmuşdur. Yaradıcılığını izlədikdə Qasirin Bakıda "Məcməüş-şüəra"nın işində iştirak etdiyinin şahidi oluruq. Bakı şairlərinin təhriki ilə Qasir Seyid Əzim Şirvanini həcvlə mənzum məktublar yazır. Seyid Əzim onun bir mənzuməsini cavabsız qoyur, ikincisinə cavab verir və "Bakı əhlinə əgər dəymiş idi əşarım /Özləri qoy eləsin dərdinə dərman, Qasir/ Şükr lillah Bakı əhlində neçə şair var", - deyə Qasiri "Məcməüş-şüəra"nın təsirinə düşüb həcv yazdığı üçün tənələyir. Qasir ona cavab yazır. Beləliklə, bu yazışmanın tarixçəsi də Qasirin Bakıda nisbətən çox qaldığı haqqında məlumat verir. Bir qədər sonra isə Seyid Əzimin onu Lənkərandakı evinin viran qalması, maarifçilikdən əl çəkməsi üstündə səmimi tənqidi və Bakı şəraiti öz təsirini göstərir. "O zaman cəhənnəmi xatırladan Bakıda şairin işi düz gətirmir. Buraya gəlməsinə peşiman olur" [42]. Nəhayət, XIX əsrin son illərində "Qasir yenidən Lənkərana gəlib, müəllimlik fəaliyyətini davam etdirmişdir" [6, s.43].

Mirzə İsmayıl Qasir 1900-cü ildə mayın 10-da Lənkəranda vəfat etmişdir. "Şair Lənkəranın cənub-şərqindəki Sütəmürdov qabiristanlığında dəfn olunmuşdur... Ədəbiyyatımızın müqtədir klassiki olduğundan 1983-cü ildə məzarı səliqəyə salınmış və üzərində şairin heykəli ucalmaqdadır" [42].

## MİRZƏ İSMAYIL QASİR VƏ "FÖVCÜL-FÜSƏHA"

Mirzə İsmayıl Qasirin müqtədir bir şair kimi tanınması başlıca olaraq onun Lənkəran həyatı ilə bağlıdır. Məhz Lənkərana gələndən sonra Qasir yaradıcılığı yeni keyfiyyətlər qazanır. Yaratdığı "Fövcül-füsəha" ədəbi məclisinin təsiri ilə Qasir poeziyası yeni mərhələyə qədəm qoyur, o getdikcə daha artıq satirik şair kimi məşhurlaşmağa başlayır. Müşairə məclisləri onun və "Fövcül-füsəha"nın digər üzvlərinin yaradıcılığında mühüm rol oynayır.

Qeyd edək ki, Lənkəran ədəbi məclisində iştirakı məsələsini ayrıca nəzərdən keçirməklə, bir yandan, Qasirin həyatının ən əhəmiyyətli parçasını araşdırmalı oluruqsa, ikinci tərəfdən, bununla Qasirin öz müasirləri olmuş tanınmış ziyalılarla münasibətinə toxunulur. Məsələ burasındadır ki, qasirşünaslıq üçün onun öz müasirləri ilə əlaqələrinin daha çox ictimai motivləri maraq doğurur və belə motivlər daha artıq şəkildə Qasirin "Fövcül-füsəha"da fəaliyyəti ilə əlaqəli götürüldükdə üzə çıxır. Yada salaq ki, "Fövcül-füsəha"nın başqa şəhərlərdəki ədəbi məclislərə müntəzəm əlaqəsi olmuşdur. Bu əlaqədə Mirzə İsmayıl Qasir xüsusilə fərqlənirdi" [24, s.57].

"Fövcül-füsəha" məclisinin yaranma tarixi haqqında tədqiqatçılar arasında fikir müxtəlifliyi vardır: onların bir qismi məclisin ümumiyyətlə 1850-ci illərdə, bəziləri isə konkret olaraq 1855-1860-cı illərdə yaradıldığını göstərirlər [14]. N.Qarayev dissertasiyasında 1850-1855-ci illərdə yarandığını qeyd etsə də,* biz onun sonradan nəşr olunmuş kitabındakı tarixə istinad etməyi üstün tuturuq: "Fövcül-füsəha" ("Natiqlər yığıncağı") ədəbi məclisi təxminən 1850-ci ildə Mirzə İsmayıl Qasirin təşəbbüsü ilə Lənkəranda təşkil edilmişdir" [47, s.72]. Tədqiqatçıların hamısı "Fövcül-füsəha"nın Qasirin təşəbbüsü və iştirakı ilə yaradıldığı faktını qəbul edirlər.

"Fövcül-füsəha"nın digər məclislərdən fərqli cəhətləri onun strukturu və fərdi tərkibi ilə bağlı idi: məclisin işində şer ədəbiyyatından başı çıxan hər bir sənət sahibi iştirak edə bilərdi. Burada varlı və yoxsula fərq qoyulmur, əsas meyar məclis üzvünün ədəbi qabiliyyəti, şerləşmə bacarığı, fərdi poeziyası və elmi müzakirlərdə iştirak etmək səviyyəsi sayılırdı. Ömründə şer yazmayan müxtəlif peşə sahibləri də mənəviyyatca zənginləşmək, milli ədəbiyyatı öyrənmək, həmçinin ictimai-tarixi vəziyyətdən baş çıxarmaq üçün məclisin işində iştirak edə bilərdi. Güman etmək olar ki, "Fövcül-füsəha"nın belə demokratikliyi onun yaradıcısı Mirzə İsmayıl Qasirin sayəsində təmin olunmuşdu. Məlumdur ki, Lənkərana köçəndən sonra Qasir heç də "yağ-balın içərisində" dolanmamış, demək olar ki, həmişə maddi ehtiyac hiss etmişdir. Nümunə üçün Qasirin "Odun" şerinə diqqət yetirmək olar:

> Vay, mən Qasiri-İsmailin əhvalına vay
> Ki, odunsuz çıxarır başa qışı Hacər ilən...

---

* *Görünür, belə tərəddüdlər Qasirin Lənkərana gəlişi tarixinin dəqiqləşməsi ilə baglı idi.*

Lənkəranda neçə ildir edirəm nəşvü nüma
Burda mən anlamadım, doğrusu, xeyri şər ilən.

Təbiidir ki, özü kasıbçılıqla dolanan bir ziyalı şair təsis etdiyi ədəbi məclisin fərdi tərkibində, onun iştirakçıları arasında ictimai-sinfi ayrı seçkilik salınmasını istəməzdi. Özündən qabaq "Fövcül-füsəha" haqqında aparılmış araşdırmaların nəticələrini də nəzərə alan məclisşünas N.Qarayev göstərir ki, Lənkəran ədəbi məclisi iki bölümdən ibarət olmuş, birinci bölümü ancaq şer yazan, məclisdəki şerləşmələrdə iştirak edən şəxslər, ikinci bölümü isə məclis üzvlərinin şerlərini dinləyən, ədəbi-elmi müzakirələrə qoşulan, öz bilik və təsəvvürlərini genişləndirməyə toplaşan şəxslər təşkil etmişlər.

Beləliklə, o, "Fövcül-füsəha" məclisinin 35 üzvünün dəqiqləşdirir: Mirzə İsmayıl Qasir, Molla Fəttah Səhban, Ağababa Bixud, Usta Məhəmmədhəsən Nəccar, Mirzə İsa Xəyali, Usta Hüseynqulu (Dubəndiduz) Şuri, Mirzə Mütalib Ərcivani, Molla Ələkbər Aciz, Molla Məhəmməd Mücrim, Mirzə Əziz Əliyev, Kəblə Baxşəli Axundov, Mirzə Əhməd Kəmin (Taib), Mirzə İsrafil Həmid oğlu Mahir, Sərvi, Pünhan, Tahirli, Mühibb, Mirzə Ələkbər Mühəqqir, Mirhəsən Səyyad Seyidzadə, İbrahim bəy Talış, Mirəli bəy Talışinski, Mirsadıq Talışınski, Mirzə İsmayıl Sürurі, Mirzə Əbdüləhəd Növrəs, Sadıq bəy Mehmandarov, Mirzə Səidəli Kazımbəyov, Mirzə Əhməd Xudaverdi oğlu, Mirzə Ələkbər Axundov, Şirəli bəy Nəsirbəyov, Molla Məhəmməd Həkim, Çarıqçı Məmmədqulu, Mirqasım Talışınski, Teymur bəy Bayraməlibəyov, Molla Məhəmməd Əczaçı, Hacı Möhsün və b. [24, s.53-54] Bu şəxslərin hamısı heç də həmişə bir vaxtda toplaşmamışlar, məsələn, T. Bayraməlibəyov, yəqin ki, 1881-ci ildən sonra məclisə qoşulmşdu. Təxminən 50 illik bir dövrdə fəaliyyət göstərmiş məclisin üzvlərinin yaş tərkibi müxtəlif olmalı idi. Lakin onların hamısı ilə Mirzə İsmayıl Qasirin bu və ya digər dərəcədə ünsiyyət saxlaması danıla bilməz. Bu, Qasirin Lənkərandakı əsas əhatəsi idi. Şair onlara qarşı münasibətini öz şerlərində də bildirmiş, bir çoxuna (məsələn, Molla Fəttaha, Əbdüləhədə, Pünhana, Növrəsə, Şirəli bəyə və b.) mənzum məktublar həsr etmişdir. Qeyd etmək lazımdır ki, eyni məclisin üzvləri olsalar da, Qasir onlarla "poetik zarafatlaşmış" və çox vaxt mənfi bir cəhət tapıb, ya satirik, ya yumoristik tərzdə onları tənqid etmişdir. Məsələn, Molla Fəttaha ərklə müraciətində əslində ictimai motivlər axtarmaq da olar:

Molla Fəttah, ey matan molla,
Mollalar içrə şarlatan molla.
Gah olan şeyx, gah mərsiyəxan,
Gah qamış, gah odun satan molla.

- misraları təkcə Molla Fəttah Səhbana deyil, zəmanəyə, onun tənqidinə yönəlmişdi. Çünki Qasir Azərbaycanda da formalaşmaqda olan kapitalist münasibətlərinin zəmanə adamlarının stereotipləşmiş dünyagörüşləri ilə uyuşmadığını, hamının özü kimi maddi ehtiyac üçün dəridən-qabıqdan çıxdığını və birtəhər dolanacaq yolu axtarmalı olduğunu yaxşı başa düşürdü. Qasir:

Mollaya bəzi iş deyil layiq,
Olma hərcayi çün natan, molla...
Sən də cəhd et, mürid yığ başıva,
Onlara söylə dastan, molla

desə də, bütün bunların XIX əsrin ikinci yarısında mümkün olmadığını bilirdi. Odur ki, göstərilən şerin məzmunu artıq konkretlikdən çıxır, ümumiləşir, ictimai mahiyyət qazanırdı. Başqa bir məclis üzvü – Şirəli bəy Nəsirbəyov Qasiri özü ilə bir kef məclisinə aparır. Lakin məclisdəki bəyzadələr-xanzadələrin başı qumar oynamağa qarışır, şair yaddan çıxır. Hər nə qədər israr eləsə də, onu çıxıb evə getməyə qoymur, yemək də vermirlər. Şirəli bəyə məktubunda Qasir onu tənələyir:

Doğrudu, olmaz imiş heç toxun acdan xəbəri,
Mən yazıq acü susuz, gözlərim oldu nigəran.
Diksinirdim açılanda qapı mən biçarə,
Eylə bildim gətirir əlsuyu güya Qurban.
Elə billəm ki, Nəsirbəy məni dustaq eləyib,
Az qalıb ölüm acından, nə pilov verdi, nə nan.
Əlqərəz, bu gecə üç dəstə olubdur həzərat,
Çəkibasnası, tökübpulu, qızışdımeydan...
Hamı etmiş özünə asnası məşğuliyyət,
Yoxdu məndən xəbəri kim, üzülüb tabü təvan.

Mən həqiqət nə nahar eyləmişəm, nə çaştı,
Ürəyim getdi acından, aman allah, aman.

Ümumiyyətlə, "Fövcül-füsəha"nın digər üzvlərinin adları çəkilmiş şerlərində də Qasir ya yüngül yumoristik tənələrə əl atır, ya da məsələnin ictimai cəhətlərinə daha artıq diqqət yetirir, onların vasitəsi ilə cəmiyyəti və zəmanənin özünü tənqid edir.

Bununla yanaşı, Qasirin şerlərində çox kəskin ifadələr də işlədilir, şair ayrı-ayrı konkret lənkəranlını açıqca söyüb qaralayır. Hər şeydən görünür ki, bu adamlar Qasirin həmişə ünsiyyət saxladığı əhatə dairəsindən deyil, əksinə, bəlkə də, ona "babi" deyən ruhanilər və ya cahil, kütbeyin, qoluzorlu-ağlıkəmlərdir:

Gər səmavər kömürü olsa mühəyya, göndər,
Eşşək Əliverdi, sıpa Mehdi, qoduq Jə'fər ilən...
Təəssüf, adıdır onun Məhəmməd,
Sanki eşşəkdə var bəzəkli zinət...

"Fövcül-füsəha" üzvləri ilə Qasir həmişə səmimi davranmış, onun yığıncaqlarının maraqlı və səmərəli keçməsi üçün əlindən gələni etmişdir. Mirzə İsa Xəyaliyə, Şirəli bəyə, Hacı Rza Pünhana və başqa "füsəha" ya mənzum məktublarında Qasirin onlara necə həssaslıqla yanaşdığının şahidi oluruq:

Əbdüləhəda! Təbi-süxəndan varındır,
İnşallah, gənci-firavan varındır...
Ey dost, nəzər qıl, oxu zövq ilə bu fərdi,
Ta ayinəi-xatiruvun pak ola kərdi...
Ey bəzmi-iradətdə sözü doğru, ozü pak və s.

"Fövcül-füsəha"da müxtəlif sənət adamları – molla, mirzə, usta, həkim, əczaçı, çarıqçı və b. toplaşdıqları üçün məclisi həftənin hər hansı istənilən bir günündə və ya hər gün yığmaq mümkün deyildi – məclis şairlərinin qazancı öz peşələri ilə əlaqədar idi və onlar peşəkar deyil, həvəskar şair idilər. "Fövcül-füsəha" yalnız cümə (istirahət) günü axşam yığışardı. Bu, elə Qasirin "Cümə günü" şerinin özündə də qeyd olunmuşdur:

Ürəfa söhbətə amadə olur cüm'ə günü,
Sübhədək xatiri bükşadə olur cüm'ə günü [24, s.56].

Məlumdur ki, təşəbbüskarı və başçısı Qasir olsa da, onun evində heç bir şərait olmadığından "Fövcül-füsəha" ayaqqabı tikən Usta Hüseynqulu Şurinin, sonralar isə bəzən müdərris Molla Möhsünün evində yığışardı [6, s.39; 24, s.56]. Ola bilsin ki, ayrı-ayrı vaxtlarda məclisin toplantı yerləri müxtəlif olmuşdur, çünki təxminən yarım əsrlik fəaliyyəti dövründə eyni bir-iki adamın evində yığışmaq çətin məsələ olardı.

Mirzə İsmayıl Qasir ömrünün Lənkəran çağlarını başlıca olaraq "Fövcül-füsəha"ya həsr etmiş, onun dağılmaması, əksinə, bu məclisin təsiri ilə ölkənin başqa ərazilərində məclisçilik hərəkatının genişlənməsinə çalışmışdır.

"Qasirin Xəyaliyə, Acizə məktubları göstərir ki, o, Lənkərandan bir yana getdikdə belə "Fövcül-füsəha" ilə əlaqəsini kəsməmiş, məktub yazaraq onların hal-əhvalından, məclisdən xəbər tutmuşdur. Aciz Bakıya gəldikdən sonra Qasir onun ardınca məktub yazaraq, Lənkərana qayıtmasını tapşırmışdı" [24, s.58].

Çox da Bakudə yubanma, Lənkəranə qıl səfər,
Müddəi söylər yığıb sərraf milyan altına...

Qasir yalnız Lənkəranda yaşayan müasirləri ilə deyil, Şamaxı, Bakı, Qarabağ, Naxçıvan, Təbriz şairləri ilə də ünsiyyətdə olmuş, onlarla məktublaşmışdır. O, Seyid Əzim Şirvani, qaradonlu Məhəmmədəli bəy Məcruh Muğani, Şirvanşahi, Mirzə Məhəmməd Katib Qarabaği, Abdulla bəy Asi, Qafil Şirvani, Molla Abbas Məhzun, bakılılardan Ağadadaş Müniri, Əbdülxaliq Cənnəti və başqaları ilə daim yaradıcılıq əlaqələri saxlamışdır [31, s. 94-95; 34, s.40]. Anonim müəllifin yazdığına görə, Qasirin həmçinin şamaxılı Əli Abbas Məta ilə dostluğu olmuş, "Təbrizdə Raci-mərhum və Dilsuz-mərhum ilə həmsöhbət olmuşdur" [97]. Qasirin bu çoxşahəli ədəbi əlaqələri "Fövcül-füsəha"nın fonunda həyata keçmiş, bunun isə, bir tərəfdən, XIX əsr Azərbaycan ədəbiyyatının zənginləşdirilməsi, digər tərəfdən, Azərbaycanda ədəbi məclis quruculuğunda müəyyən rolu olmuşdur.

Beləliklə, Qasirin öz müasirləri ilə yazışmaları ictimai dəyər kəsb etmişdir.

Bununla bərabər, tədqiqatçıların göstərdikləri bəzi məqamları dəqiqləşdirmək mümkün deyildir. Məsələn, F.Qasımzadə yazır ki, "Əkinçi" qəzeti Qasirinyaradıcılığına böyük təsir etmişdir [26, s.536]. Halbuki bunu ancaq güman etmək olar, çünki Qasirin "Əkinçi"ni alıb-almaması haqqında əlimizdə faktik məlumat yoxdur. Bəlkə də, "Əkinçi"dən xəbər tutsaydı ömrü boyu əsərlərinin çapına çalışan şair Həsən bəyə öz şerlərindən seçmələr göndərib onların çapını xahiş edərdi.

Yaxud ayrı-ayrı tədqiqatçılar Qasirlə Seyid Əzim Şirvaninin yaxın dostluğunu qeyd edirlər. Anonim müəllif göstərir ki, Şamaxı quberniya olub (əslində 1846-cı ildə Şirvan quberniya olub), bu zaman Qaradonluda işləyən morğular oraya axışıblar. "Mirzə İsmayıl Hacı Seyid Əzim-mərhum və Əli Abbas Məta və s. Şirvan şairləri ilə gecə-gündüz yoldaş olubdur" [97]. Ə. Məmmədov göstərir ki, "Qasir öz mənzum məktublarında Seyid Əzimi yaxın bir dost kimi xatırlayaraq, onu "əmioğlu" adlandırırdı" [34, s.40]. M.Mustafaev Qasirin Seyid Əzimlə məktublaşmasına əsasən ("Sən mənim köhnə rəfiqimsən, əya, Qasir") yazır ki, Mirzə İsmayıl Qasir Seyid Əzim Şirvaninin müasiri və yaxın dostu idi [42]. Beləliklə, araşdırıcıların, demək olar ki, heç birisi Qasirlə Seyid Əzimin aralarındakı 30-33 illik yaş fərqinə fikir vermir. Əvvəla, Qasirin Qaradonluda işlədiyi illərdə Seyid hələ yenicə anadan olmuşdu (1835), hərgah sonralar Qasirlə Seyid Əzim görüşmüşlərsə də, onların bir-biri ilə sözün həqiqi mənasında "yaxın dost", "əmioğlu" olması bir qədər şübhəli görünür. Belə demək, daha dəqiq olardı ki, Mirzə İsmayıl Qasirlə Seyid Əzim Şirvani əqidə dostu,ədəbi yaradıcılıq dostu olmuşlar. Qasirin bir həcvin Seyid Əzimin cavabsız qoyması, bundan qeyzlənən Qasirin onu ikinci dəfə daha kəskin həcv etməsi, Seyid Əzim ona cavab verəndən sonra Qasirin ona cavabına yenə susmaqla cavab verməsi faktdır və onların dostluğu barədə çox şey deyir.

## MİRZƏ İSMAYIL QASİRİN PEDAQOJİ FƏALİYYƏTİ

İndiyədək Qasirin pedaqoji fəaliyyətini araşdıran tədqiqatçılar onun yalnız Lənkərana köçəndən sonrakı müəllimlik illərini işıqlandırmışlar. Halbuki ayrı-ayrı varlı ailələrdəki uşaqlara dərs deməsi, onların təlim-tərbiyəsi ilə məşğul olması faktı nəzər-diqqətdən kənarda qalmışdır. Mirzə İsmayıl Qasir pedaqoji fəaliyyətinə Təbrizdə təhsilini başa vuran illərdə – təxminən 1825-1828-ci illərdə İsfahanda başlamış, varlı tacir, atasının tanışlarından Seyid Hüseyn Təbətəbainin evində onun övladlarına dərs demişdir. Güman etmək olar ki, müəllim Qasir Seyid Hüseynin uşaqlarına şəriətdən, hüsnxətdən, ədəbiyyatdan və s. dərs keçmiş, onların savadlanmasında müəyyən rol oynamışdır.

Sonralar vətəninə dönən şair az bir müddətdə anasının yanında yaşamış, sonra yenə səyahətə çıxaraq Muğana gəlmiş, sərhəd rayonlarında yenə bir müddət müəllimlik etməli olmuşdur. Şirvanlı Mustafa xanın oğlu Allahqulu xan Mirzə İsmayıl Qasiri özünün böyük oğlu İbqahim xana dərs deməyə, onun təlim- tərbiyəsi ilə məşğul olmağa dəvət etmişdir. 1840-cı ildə Qaradonlu kömrükxanasına işə düzələnə qədər Qasirin müəllimliklə məşğul olduğunu zənn etmək olar. Həmin illərdəki müəllimlik şairin pedaqoji təcrübəsinin meydana gəlməsinə səbəb olmuş, gənc Qasirin müəllim kimi püxtələşməsində mühüm rol oynamışdır. Ayrı-ayrı aristokratik ailələrdə tək-tək uşaqlarla iş aparması Qasirin müəllim üçün vacib olan fərdi yanaşma metoduna dərindən yiyələnməsinə köməklik göstərmişdir.

Lakin, bir yandan, müəllimliklə dolanmağın çətinliklərini görən, ikinci tərəfdən də, bu "üsuli-qədim" tədrisinin çatışmazlıqlarını hiss edən şair bir müddət sonra dostu Abbas bəy Qarabağlının dəvəti ilə pedaqoji fəaliyyətini dayandırıb, kömrükxanada işə düzəlir.

1850-ci ildə Lənkərana köçərkən Qasir artıq yaxşı təcrübəyə malik pedaqoq idi. Hətta ola bilsin ki, Sadıq bəy Mehmandarov da onu Lənkərana çağırmamışdan əvvəl müəllim kimi tanımış və qəbul etmişdi.

Qasirin "Şərhi-hal" şerindəki "defad" müəmmasından çıxış edərək, onun Lənkəranda 1872-ci ildən müəllimlik fəaliyyətinə başlaması fikrinin məşhurlaşması haqqında yuxarıda danışmışdık. Lakin bu məsələnin üzündə də dəqiqləşdirmə aparmalıyıq. Belə ki, bir tərəfdən, 1850-ci ildən 1872-ci emilədək Mirzə İsmayıl Qasirin Lənkəranda müəllimlik sənətindən tam uzaq

düşməsi şübhə doğurursa, ikinci tərəfdən, onun "Odun" şerinin nəzərdən keçirilməsi həmin şübhənin yerinə düşdüyünü təsdiq edir. Məlumdur ki, Qasir Lənkərana köçəndən iki-üç il sonra (sonradan xatirələr əsasında söylənilmiş bu say "dörd-beş il", "beş-altı il", lap "altı-yeddi il" kimi də başa düşülə bilər) arvadı Həcər xanım vəfat etmişdir. "Odun" şerində oxuyuruq:

> Vay, mən Qasiri-İsmailin əhvalına vay
> Ki, odunsuz çıxarır başa qışı Hacər ilən...
> Kişi məktəbdar olunca bu vilayətlərdə,
> Yeydir ondan dolana əsbü xərü əstər ilən.

Buradan Qasiri hələ Həcərin sağlığında da Lənkəranda "məktəbdarlıq" etdiyi məlum olur. Bəs onda şair öz pedaqoji fəaliyyətini niyə 1872-ci ildən hesablayır? 1850-ci illərdə Qasir hansı məktəbdə müdərrislik edirmiş?

Lənkəranda məktəblər tarixini araşdıran müəlliflər "müsəlman məktəbini 1850-ci ildə meydana gəldiyini" söyləyirlər [55, s.13]. Digər tərəfdən məlumdur ki, Qasir müəllim Mirzə Səidəli Kazımbəyovla yaxın dost olub, ona avtoqraflı kitablar bağışlamışdır. Kazımbəyovun məktəbdə 1872-ci ilədək işlədiyini nəzərə alsaq [55, s.15-17], onda Qasirin də həmin ilə qədər artıq müəllimlik etdiyini qət edə bilərik. Görünür, sadəcə olaraq, Mirzə İsmayıl 1872-ci ilədək dərs dediyi məktəbin və ya məktəblərin köhnə üsullu tədrisini nəzərə alaraq, sonralar qələmə aldığı "Şərhi-hal"da onları "əsil məktəb" hesab etməmiş, məhz 1872-ci ildə dövlət tərəfindən açılmış yeni üsullu rəsmi məktəbdə fəaliyyətə başlamasını özünün müəllimlik sənətinin başlanğıcı kimi qəbul etmişdir. 1872-ci ilə qədər dərsdediyi məktəblər isə rəsmi səviyyədə deyil, ayrı-ayrı ziyalıların və imkanlıların təşəbbüsü ilə yaradılmış köhnə mədrəsə tipli müəssisələr idi və dövrünün mütərəqqi fikirli şəxsiyyətlərindən olan Qasirin öz "tərcümeyi-halında" belə məktəblərdə dərs deməsinin (ümumiyyətlə, fərdi müəllimlik fəaliyyətinin də) üstünü vurmaması başa düşülə bilər. Tədqiqatçı isə, Qasirin özünün təvazösünə baxmayaraq, onun bütövlükdə pedaqoji zəhmətini ortaya çıxarıb, ona qiymət verməyə borcludur.

Müxtəlif tədqiqatçılar Qasirin Lənkəranda ayrı-ayrı illərdə müəllimliyə başladığını qeyd edirlər. Prof. A. Abdullayev onun 1892-ci ildən dərs deməyə başladığını göstərir [1, s.10]. T. Nurəliyevanın fikrincə, bu tarix 1887-ci ilə

təsadüf edir [47, s.105]. Naməlum müəllif isə yazır ki, Qasir "əvaxiri-ömründə 17 il şəhərdə rus məktəbxanasında şəriət müəllimi olubdur" [97]. Qasirin nəvəsi İ. Axundovun əlimizdəki qeydində oxuyuruq: "M.İ. Qasir Lənkəran realnı məktəbində 1886-1896-cı ilə kimi (закон божий) şəriət dərsini verir. Sovet ministirin arxivindən aylıq maaş vedomostindən götürülmüşdür".

Əlbəttə, bu qənaətlər maraq doğurur, lakin göstərilən tarixlər Qasirin Lənkəranda pedaqoji fəaliyyətə başlaması vaxtını göstərə bilməz. Yəqin ki, tədqiqatçılar hansısa konkret bir məktəbdə müəllimliyə başlama tarixini bu məsələ ilə qarışıq salmışlar. Çünki, məlumdur ki, Lənkəranda xüsusi evlərdə fəaliyyət göstərən "müsəlman məktəbləri" hələ heç Qasir Lənkərana gəlib çıxmamışdan qabaq da, 1850-ci ildə və ondan əvvəllər də mövcüd olmuşdur [55, s.10-11]. Lənkəranda "realnı məktəb" hələ 1856-cı ildə yaradılmışdı [55, s.14] və Qasirin "defad" tarixindən məlum olur ki, o bu məktəbdə düz 16 il sonra dərs deməyə başlamışdı.Deməli, Qasirin 1883-1892-ci illər arasında, 70-80 yaşlarında hansı məktəbdəsə yenicə müəllimlik fəaliyyətinə başlaması fakt kimi qəbul oluna bilməz. O, Lənkəranda müəllimliyə bu tarixlərdən çox-çox əvvəllər başlamışdır.

Ə. Müznibin arxivindəki qeyddən məlum olur ki, "Qasir əvvəllər çox çalışır Lənkəranda bir məktəb aça, binasızlıq və qüvvəsinin çatmamasından mümkün edə bilməyir. Bu işdən xəbər tutan Mehmandarov Mirzə Sadıq bəy Qasiri öz yanına çağırır və ona xüsusi məktəb açmaqdan ötəri kömək edir" [91]. Başqa müəllif göstərir ki, "bir mərtəbədə ki, öz iş otağını Mirzə İsmayıla verib, o da orada həmən Mirzə Sadıq bəyin oğlanlarına təlim və tərbiyə edibdir və sair ətfallardan orada cəm olub, həqiqətdə bir məktəbxana bina olubdur" [97]. Digər tədqiqatçılar qeyd edirlər ki, "Qasir əvvəl Lənkərandakı öz evində məktəb açır, sonra Mirzə Sadıq bəy Mehmandarovun sarayında onun öhdəsinə 50-yə qədər uşaq verilir" [57].

Bütün bu məlumatların xronologiyasını tərtib edərək, Qasirin pedoqoji fəaliyyətinin tarixçəsini Mirzə İsmayıl Qasir Lənkərana köçəndən sonra bir müddət buradakı köhnə "müsəlman məktəblərində" məktəbdarlıq edir. Şer yaradıcılığından da görünür ki, həmin illərdə çox yoxsul vəziyyətə düşür, günü "ah-vayla", "qışı odunsuz" keçir. Bir tərəfdən, mədrəsənin gətirdiyi kasıbçılıq onu, yəqin ki, öz maddi vəziyyətini sahmana salmaq üçün yollar aramağa məcbur edirsə, ikinci tərəfdən, buradakı tədris üsulunun geriliyi

artıq kamillik yaşına dolmuş və öz fərdi müəllimlik təcrübəsi olan mütərəqqi fikirli ziyalını yeni məktəb yaratmaq fikrinə salır: artıq köhnə mədrəsə onu nə maddi, nə də mənəvi cəhətdən qane etmir.

Mirzə İsmayıl əvvəlcə öz evində dərs deməyə cəhd göstərir. Lakin şəraitin olmaması səbəbindən, bu məsələdən xəbər tutan himayədarı Mirzə Sadıq bəy Mehmandarovun təklifini qəbul edərək, onun imarətində oğlanları İbrahim bəy, İsaq bəy və Səməd bəyə dərs deməyə razılaşır. Lakin Mehmandarov qardaşlarının təvəllüd tarixləri 1852-1858-ci illərə aiddir və deməli, Qasirin yeni məktəb yaratmaq cəhdləri ən azı 60-cı illərin əvvəlinə təsadüf edir. Görünür, hər halda Qasir öz istəyini Mehmandarovun təklifindən bir neçə il əvvəl həyata keçirə bilmiş, lakin maddi imkansızlıq onun açdığı məktəbin köməksiz inkişaf etməsinə mane olmuşdur. Mirzə Sadıq bəy işə qarışandan sonra isə Qisir məktəbi artıq möhkəmlənmiş, Lənkəran mühitində maarifçiliyin yeni ocaqlarından birinə çevrilə bilmişdir.

Tədqiqatçılar haqlı olaraq Qasirin pedaqoji fəaliyyətinə çox yüksək qiymət vermişlər. A.Abdullayev onu Lənkəranda yeni məktəblərin ilk yaradıcısı hesab edir [1, s.76]. Faktlar göstərir ki, Qasirin yaratdığı "bu məktəb öz tədris üsuluna görə Seyid Əzimin Şamaxıda açdığı məktəbə çox oxşayır. Burada dünyəvi elmlər də tədris olunurdu. Azərbaycanda xalq maarifinin inkişafında və pedaqoji tariximizdə S.Əzim hansı mövqedədirsə, cəsarətlə demək olar ki, Qasir də bir maarif xadimi kimi ondan geri qalmır" [14].

Qasir məktəbinin "üsuli-cədid" üzrə işlədiyini [34, s.39], onun həmin məktəbdə bir sıra tədris yenilikləri tətbiq etdiyini ayrı-ayrı axtarış və tədqiqatlar aşkarlamışdır. Təbiidir ki, "Fövcül-füsəha" kimi qüdrətli bir məclis yaratmış şair və müəyyən pedaqoji təcrübə toplamış müəllim kimi, özünün minbir əzabla təsis etdiyi məktəbin işində də Qasir öz dövrünün mütərəqqi metodlarına müraciət etmiş, şagirdlərində şeirə-sənətə, oxuyub-öyrənməyə dərin həvəs aşılamışdır. Salman Mümtazın arxivindəki qeydlərdə göstərilir ki, hətta Qasir "şeir, mədrəsədarlıq etməklə bərabər, öz mədrəsəsini yeni şair qüvvələri hazırlamağa" [93] da həsr etmişdir. Bu maraqlı və inandırıcı faktdır, çünki "Fövcül-füsəha" başçısının yeni-yeni ədəbiyyat həvəskarları, şairlər yetirməyə mənəvi ehtiyacı vardı. "Qasir dərs zamanı bəzən bədahətən gözəl şerlər söylər və şagirdlərə
yazdırardı" [57].

Mirzə İsmayıl Qasirin Lənkəranda pedaqoji fəaliyyəti haqqında məlumatlar əsasən ölümündən çox-çox sonralar toplanmışdır. Onun şagirdləri arasında aparılmış axtarışlar göstərmişdir ki, Qasir XIX əsrin ən diqqətəlayiq və mütərəqqi fikirli ziyalı müəllimlərindən biri olmuş, tələbələrinin yaddaşında "çox arif bir şəxs, hazırcavab və ustad bir müəllim" [14] kimi qalmışdır. "60-cı illərdə 80 yaşlı İmamverdi Şahbaz oğlu Kələntərlidən (Qasirin şagirdi olmuşdur) onun haqqında maraqlı söhbətlər eşitmişdik: "Mirzə İsmayıl müəllim İrandan gələn çərəkələri bəyənməzdi. Hətta özünün tərtib etdiyi çərəkəyə də yenidən tənqidi yanaşar və ona düzəlişlər verərdi" [57]. Qasir "üsuli-cədid" məktəbinin müəllimi kimi yaxşı başa düşürdü ki, imperiyada əski əlifba ilə kitab və dərslik çapı müşkül məsələ olduğu səbəbindən İrandan gətirilən dərs vəsaiti başlıca olaraq "üsuli-qədim" mədrəsələri üçün nəzərdə tutulurdu, bu isə müəllim-şairin pedaqoji prinsiplərinə uyğun gəlmədiyindən təshih olunmalı idi. Məlumdur ki, "üsuli-qədim" təhsil sistemində yalnız Qur'ani-kərimin öyrədilməsi və müxtəlif (əsasən İran-fars) Şərq şairlərinin şerlərinin əzbərlədilməsi kifayət edirdi. Qasir isə yalnız bunlarla keçinə bilməzdi. Məsələn, o, ənənəvi təhsil haqqında görüşləri sarsıdaraq, öz məktəbində bir sıra yeniliklər tətbiq etməyə cəhd göstərirdi: "Mərhumun üsuli-tədrisi-ətfalda başqa səng və səliqəsi var idi. Məsələn, məktəbə Qur'an gətirmək tamam zidd olub, uşaqlara bir növ ilə təlim edərdi ki, uşaq öz-özünə Qur'an oxuya bilirdi. Necə ki, öz uşaqları əbədən Qur'an dərsi oxumayıb və hamısı Qur'an oxuyandırlar" [97]. Bundan başqa, məlum olmuşdur ki, Qasir özünün məktəbində dərsdən tənəffüsə çıxarkən dua verilməsi kimi ənənəni ləğv etmiş, Lənkəran məktəblərində ilk dəfə zəng vurulması qaydasını tətbiq etmişdir (bu, etiraz doğursa da, tədricən öz yerini qoruya bilmişdi).

Mirzə İsmayılın yenilik uğrunda apardığı mübarizə, həmçinin qeyd etməmək olmaz ki, Mehmandarov kimi şəxsiyyətin himayəçiliyi tezliklə onun nüfuzunun yüksəlməsinə və Qasir məktəbinin məşhurlaşıb xalq tərəfindən qəbul edilməsinə səbəb olmuşdur. Artıq "Odun" şerindəki məktəbdarlıqdan şikayət motivləri öz yerini ruh yüksəkliyinə verir və biz onun farsca "Şərhi-hal"ında oxuyuruq:

Fars dilindən, şəriətdən, bir də şe'r-sənətdən,<br>
Dərs deyərdim bülbül gülü səsləyərkən astadan.

Burda gözəl məktəb açdım tez yığıldı başıma
Elmin əlli pərvanəsi-oxumağa can atan.

“Şeirdən aydın olur ki, onun məktəbində 50 nəfər şagird oxuyurmuş. Doğrudan da, bu şagirdlərdən çoxu gələcəkdə Azərbaycanın ictimai-siyasi və mədəni həyatında fəal iştirak edən qabaqcıl ziyalılar oldular” [39, s.6].

Nəhayət, Mirzə İsmayıl Qasirin Azərbaycanın ilk “cədid” dərsliklərindən birini yazması faktı da pedaqogika tariximiz baxımından maraq doğurur.

Şərqşünas B.V.Millerin məlumatına görə, hələ 1860-cı illərdə Mirzə Əsədulla, Mir İbrahim bəy və Mirzə İsmayıl Qasir talış dilinin qrammatikasına aid bir kitab tərtib edir və onu çap etdirmək üçün Mirzə Fətəli Axundovla birgə Lənkərana gəlmiş akademik B.A.Dorna verirlər. Lakin naməlum səbəblər üzündən həmin dərslik çap olunmamış qalır və hazırda əlyazma halında Sankt-Peterburq Universitetinin əsaslı kitabxanasında Orientalia № 932 şifrəsi altında mühafizə edilir [68, s.17]. Güman etmək olar ki, məhz bu dərsliyin tərtibində iştirak etməsi də Qasirə Lənkəranın “üsuli-cədid” məktəbləri üçün yeni tipli dərslik hazırlamaq ideyasını verir. Nəhayət, 1894-cü ildə Mirzə İsmayıl Qasir (artıq bu dəfə müştərək müəllifsiz) fars dilinin qrammatikasına aid “Qanuni-Mirzə İsmayıl Qasir” adlı bir dərslik yazır. Əlyazma halında olan bu kitab tezliklə məşhurlaşmış, “Qasirin dövründə də, ondan sonra da uzun müddət Lənkəranda və onun ətrafında olan məktəblərdə ən çox işlənən bir dərslik olmuşdur. Dərslikdə yenilik ondan ibarətdir ki, höccələmə üsulu islah olunmuş, hərflər nisbətən köhnə adları ilə deyil, söz daxilində verdiyi səslə göstərilmişdir” [57]. Təəssüf hissi ilə qeyd etməliyik ki, Lənkəran məktəblərinin dərslikləri arasında kiçicik bir “inqilab” kimi qarşılanıb, qəbul edilmiş bu dərslik, yəqin ki, ayrı-ayrı mirzələr və şagirdlər tərəfindən köçürülməsinə baxmayaraq, bir kitab halında bizə gəlib çatmamışdır. Hazırda Qasirin irsi içərisində “Qanun”un ayrı-ayrı vərəqləri qalmışdır: Əlyazmalar İnstitutunda Fr-1266 şifrəsi altında saxlanılan Qasir fondunda (II dəftərdə) 32b, 38b və (VII dəftərdə) 1b-3a vərəqləri, həmçinin B-1546/3183 şifrəsi altında saxlanılan şerləri içərisində daha 3 pərakəndə vərəq “Qanuni-Mirzə İsmayıl Qasir”dən qalmadır.

Beləliklə, Qasir fərdi üsulla varlı evlərdə dərs demiş, Lənkəran mədrəsə və məktəblərində müəllimlik etmiş, özü böyük müvəffəqiyyətlərə nail olmuş məktəb açmış, dərsliklər yazmaq sahəsində fəal mövqe tutmuşdur. Bütün bunlar, Mirzə İsmayıl Qasirin təkcə şair, yeni dövr ədəbiyyatımızın təşəkkülündə mühüm rol oynamış şəxsiyyət deyil, həm də kamil bir pedaqoq olduğunu əyani nümayiş etdirir, Azərbaycanın mədəni-maarif mühitinin tərəqqisində onun iştirakını yüksək qiymətləndirməyə imkan verir.

## MİRZƏ İSMAYIL QASİRİN YAZILI İRSİ

Danılmaz həqiqətdir ki, hər bir klassikin bədii yaradıcılığını öyrənmək və əsərlərini nəşrə hazırlamaq üçün hər şeydən əvvəl onun yazılı irsini toplamaq, bu irsin vəziyyətini təsvir etmək, onun paleoqrafik və mətnşünaslıq xüsusiyyətlərini təhlil etmək, indiyədək öyrənilmə, nəşr və təbliğedilmə tarixçəsini nəzərdən keçirmək lazımdır.

### MİRZƏ İSMAYIL QASİR İRSİNİN TƏSVİRİ VƏ NƏŞR TARİXİ

Mirzə İsmayıl Qasirin yaşadığı dövrdə ümumən Qafqazda çapçılıq sənəti məşhurlaşıb geniş yayılmağa başlasa da, "Əkinçi" qəzeti Azərbaycan mətbuat tarixinin özülünü qoymuş olsa da, hələ heç də hamı öz yazdıqlarının çapına nail ola bilmirdi. "Qasirin məktəb şagirdlərindən Əkbər xan Talışinski, Əli Muxtar Qasımov və nəvəsi İshaq Axundzadənin söylədikləri xatirələrdən məlum olur ki, şair öz əsərlərini çap etdirməyə dəfələrlə təşəbbüs göstərmişsə də, nəşriyyat orqanlarının məhdudluğu üzündən məqsədinə nail ola bilməmişdir" [34, s.37].

Beləliklə, Qasir irsindən danışarkən, təbii olaraq, onun əlyazma halında bizə gəlib çatmış əsərləri nəzərdə tutulur.

Şairin dağınıq dəftərlər və pərakəndə vərəqlər halında olan, özü tərəfəindən və ya başqaları tərəfindən köçürülmüş əlyazmaları 1942-ci ildə nəvəsi İshaq Axundov tərəfindən indiki Azərbaycan MEA Əlyazmalar

İnstitutuna təhvil verilmişdir. B-1546, Fr-1266 və Fr-1267 şifrələri altında saxlanan qovluqlarda toplanmış yazılı irsi texniki vəziyyətinə görə "əlyazma kitabı" adlandırmaq mümkün deyildir. Bu isə o deməkdir ki,1988-ci ildə şerlərinin ayrıca nəşrinə qədər şair Qasirin əsərləri bir kitab kimi mövcud olmamış, olmuşsa da, əlimizə çatmamışdır.

Nəzərə almaq lazımdır ki, Qasirin şerlərinin müəyyən bir qismi onun vəfatından sonra ayrı-ayrı şəxslərin (qohum-əqrəbasının, keçmiş şagirdlərinin, Lənkəran şairlərinin və s.) dilindən yenidən yığılmışdır. Hətta, deyilənə görə, Əlyazmalar İnstitutundakı materiallar onun irsinin yalnız bir hissəsi olub, "şairin əsərlərinin müəyyən hissəsi isə müasirlərinin şəxsi fondlarında, vaxtı ilə onun şagirdi olmuş şəxslərdə, keçən əsrdən qalan cünglərdə mühafizə edilməkdədir" [34, s.37]. Başqa bir məlumata görə, Qasirin Azərbaycan dili ilə yanaşı, rus dilində də (!?) çox gözəl şeirləri olmuşdur [91].

Bütün bunlara baxmayaraq, Mirzə İsmayıl Qasirin yazılı bədii irsi dedikdə, əlimizdə olan və Azərbaycan MEA Əlyazmalar İnstitutunda mühafizə edilən əlyazmaları əsas götürülür.

Şairin yuxarıda qeyd etdiyimiz üç qovluq irsi ilə yanaşı, XX əsrin əvvəllərindən yeni dövr ziyalılarımızın Qasir irsinə oyanan marağı sayəsində ayrı-ayrı şəxsi arxiv materialları içərisində rast gəldiyimiz irili-xırdalı müxtəlif şeirlər və şeir parçaları, müxtəlif təzkirə və cünklərdə təsadüf edilən şerilər də Mirzə İsmayıl Qasirin bədii yaradıcılığını araşdırmaq nəzərindən elmi əhəmiyyət daşıyır. Həmçinin onun xəttatlıq dəst-xəttinin izlərini özündə nümayiş etdirən əlyazmalardan da yan keçmək olmaz.

Qasir irsinin pərakəndəliyi, formaca kitab halında olmaması səbəbindən onun əlyazmaların elmi- paleoqrafik təsvirini vermək olduqca çətindir. Hər halda ənənəvi qəbul olunmuş suallara cavab vermək, "başlanır-bitir" başlıqlarını müəyyənləşdirmək bir sıra hallarda yersiz görünür.

Qeyri-rəsmi şəkildə "Qasir fondu" adlandırıla biləcək həmin üç qovluqda şairin əsasən azərbaycanca və farsca, qismən də ərəbcə yazıları toplanmışdır:

**Fr-1266 şifrəli qovluqda yeddi dəftər vardır.**

Birinci dəftər 32 vərəqdən ibarətdir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm. sətirlərin sayı müxtəlifdir. Dəftərin bəzi səhifələri ağ buraxılmışdır. Müəllif

ayrı-ayrı ağvərəqləri ortadan qatlamaqla, onları dəftər halına salmışdır. Avtoqrafdır.

Burada 36 şer, o cümlədən qəzəl, müxəmməs, rübai, türkcə "Şərhi-hal və bəyani-vaqeə", satirik şerlər, mənzum məktublar, həmçinin İ.A. Krılovun "Дуб и трость" təmsilinin farscaya tərcüməsi köçürülmüşdür. 22[b] vərəqindəki qeyddə farsca yazılmışdır: "Yunan filosofu və alimi (əslində fransız şairi – A.R.) Lafonten bu nəsihətnaməni yazmış və Krılov həmin nəsihətnaməni 1806-cı ildə rus dilinə tərcümə etmişdir. Mən dövlət məktəbinin müəllimi İsmayıl Axundzadə Yusifbəy Mehmandarovun xahişi ilə həmin nəsihətnaməni 1885-ci ildə fars dilinə tərcümə etdim ki, oxucular mənfəət tapsınlar"[*].

Dəftər başlanır:

اینده طرهٔ شبرنکون عنبر فشانلیق
یتر بو خاطر ویرانه یوز پریشانلیق

Bitir:

چون کل شد ملک سویلوبدر جمعه مالک
قاصر اولوبدر سالک واردر الند ذاری

**İ k i n c i d ə f t ə r** 46 vərəqdən ibarətdir. Təkcizgili və karton cildli şagird dəftəridir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm. Sətirlərin sayı müxtəlifdir. Dəftərin cildində 1241 tarixi yazılmışdır (=1825 m.) – səbəbi məlum olmur (Köçürülmə ili olduğunu güman etmək çətindir). Müxtəlif vərəqlər dəftərə əlavə kimi tikilmişdir. Burada inşa dərsindən ötrü hüsnxətt yazıları, satirik şerlər, mənzum məktublar, rübailər və bir qoşma vardır – cəmisi 16 şeri əhatə edir. 11-13 vərəqlərdə ərəbcə nəsrlə "Ziyarətnamə" yazılmışdır. Ayrı-ayrı yerlərdə Qasirin oğlu Mirzə Səbihin yazıları vardır.

Dəftər başlanır:

هو القانع

---

[*] *Əgər sonrakı dəftərlərdə rast gələn illəri köçürülmə tarixi və ya hansısa xronoloci əsas kimi qəbul etsək, onda qeyd etməliyik ki, dəftərlər düzdün nömrələnməmişdir və bu birinci dəftər deyildir.*

در اثبات شنجرف يك بوته مثل پيالهٔ مدّور...

Bitir:

تز جوابين سن بزه ايله بيان
يازاق براوزكه كونه داستان

**Ü ç ü n c ü  d ə f t ə r** 20 vərəqdən ibarətdir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm. sətirlərin sayı və ölçüsü müxtəlifdir. Burada 22 şer verilmişdir: Azərbaycan və fars dillərində qəzəllər, mənzum məktublar, satirik şerlər, şahmat haqqında mənzum hekayə, zəmanədən şikayət və bir maddeyi-tarix vardır. Dəftərin 6b vərəğində lənkəranlı Məşədi Mustafa bəy Şahverdiyevin vəfatı münasibətilə yazdığı bu 12 beytlik şer Qasir yaradıcılığında yeganə maddeyi-tarixdir. Dəftərin üzündə karandaşla dibçək gülü, onun üzərində isə şeytan şəkli çəkilmişdir.

Dəftər başlanır:

هركيم ايسترمنه بوعصرده همصحبت اول
كرك اول كيمسنه خوش خالق و خوش نيت اوله

Bitir:

ديندرنده چوخ آدم دم ورار آدام لقدن
بنى آدم اودى كيم اونده يك غيرت اوله

**D ö r d ü n c ü  d ə f t ə r** 28 vərəqdən ibarətdir. Təkcizgili ağ vərəqlərdən düzəldilmişdir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm. Sətirlərin sayı və mətni ölçüsü müxtəlifdir. Dəftərdə 52 şeir yazılmışdır: azərbaycanca və farsca qəzəllər, müxəmməs, Hafizin bir qəzəlinin təxmisi, Seyid Əzim Şirvaniyə mənzum məktub, satirik şer və bir mədhiyyəni əhatə edir. Məzmunundan aydın olur ki, bu Qasirin Seyid Əzimə 3-cü, sonuncu məktubudur (Seyid Qasirin ilk həcvini cavabsız qoyub, bundan "hirslənən" Qasir ona ikinci məktub yazıb və yalnız bu zaman Seyid Əzim ona "cəvab

qaytarıb”, nəhayət, Qasir də həmin cavaba daha bir məktub yazıb göndərmişdir ki, haqqında danışılan məhz həmin son mənzumədir:

Qoydun adını zərafət, mənə yazdın həcvi,
Ey olan həcv tərəfində kələntər Seyyid.

Dəftərin üzərində əski əlifbada “Lənkəran qəzasının müəllimi Mirzə İsmayıl Qasirin qəzəliyyatından. Lənkəran şəhəri” sözləri yazılmışdır.

Dəftər başlanır:

السلام ایفلک عزته اخترسید
مرکز دایره شوکته محورسید

Bitir:

گیجه گندوز جگر یاندی غمیک کلمکدن
کیمه اظهار ایلیک بو غم پنهانمزی

**B e ş i n c i  d ə f t ə r** əslində dördüncü dəftərin ardı hesab edilə bilər. Başqa dəftərlərin ayrı-ayrı vaxtlarda yazıldığı özünü göstərdiyi halda, yazı və paleoqrafik üslubunca, demək olar ki, bir-birini tamamladığına görə, bu iki dəftərin bir-birinin ardınca yazıldığı məlum olur.

Qasirin avtoqrafıdır. Həcmi 21 vərəqdir. Təkcizgili ağ kağızlardan düzəldilmişdir. Vərəqlərin ölçüsü 17,5 x22 sm., sətirlərin sayı və mətnin ölçüsü müxtəlifdir. Dəftərin 6-7 vərəği ağ buraxılmışdır.

Burada 48 şer yazılmışdır: azərbaycanca və farsca qəzəllər, müxəmməslər, qoşma və müsəddəsdən ibarətdir.

Dəftər başlanır:

بنی ای نور چشمیم ایله بوبدرکوه کن شرین
یقین بلدیم اونک اولمش لب لعلی تمی شرین

Bitir:

اوسوزلركيم ديوبس عين حقدر
ولى كيدرمين براوز كه جامنه

**A l t ı n c ı  d ə f t ə r** 13 vərəqdən ibarətdir. İkicizgili şagird dəftəridir. Qara mürəkkəblə 22 şer yazılmışdır: azərbaycanca və farca qəzəllər, dini və satirik şerlərdən ibarətdir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm., sətirlərin sayı və mətnin ölçüsü müxtəlifdir.

Dəftər başlanır:

كسى زوصف جمال تراه بحسن نكبد
حكايتى راكل وگلشن وچمن نكبد

Bitir:

چون اكثر ايناى...
مقبول طبع ايشان خواهدشد

**Y e d d i n c i  d ə f t ə r** 14 vərəqdən ibarətdir. Ağ saya kağızdan düzəldilmişdir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm., sətirlərin sayı və mətnin ölçüsü fərqlənir. Dəftərin üzərində "Kəlimati-müxtəlifə bi-siğeyi-ismi-məfuli-müəddəb" sözləri yazılmış, 1248 tarixi (=1832 m.) göstərilmişdir ki, səbəbi məlum deyil.* Qara mürəkkəblə yazılmışdır.

Burada müxtəlif ərəb kəlmələrinin düzgün yazılışına dair nümunələr, azərbaycanca və farsca 26 şer, o cümlədən satirik şerlər, mədhiyyələr, dostu İsaya nəzmlə və nəsrlə məktubu verilmişdir.

Dəftər başlanır:

---

* *"Mətnşunasa hər bir əsərin yazılma tarixini bilmək müəllifin əsərləri külliyyatını və ya onun ayrı-ayrı bölmələrini tərtib etmək, əsərləri düzgün xronoloji qaydada düzmək üçün gərəkdir" [70, s.202]. Qasir irsindəki belə tarix işarələri onun şerlərinin (hətta dəftərlərinin də) xronologiyasını müəyyən etməyə əsas ola bilməz. Nəşr olunmuş yeganə kitabında da xronologiyanın gözlənilməməsi təsadüf deyildir. Təəssüf ki, ümumiyyətlə bütün Şərq əlyazmalarında vəziyyət əsasən bu cürdür.*

كلمات مختلفه بصيغۀ اسم مفعول بی مرا

Bitir:

یاز جوابین بو سوزک که اوله امکان النه

**Fr-1267 şifrəli qovluqda**

Qasirin ayrı-ayrı dəftər qalıqları və pərakəndə vərəqlər halında əlyazma şer nümunələri saxlanılır. Burada şairin mənzum məktubları, mənzum hekayələri, satiraları və lirik şerləri toplanmışdır. Materialların ardıcıl və səliqəli paleoqrafik təsvirini vermək çətin olsa da, əsas sualları aşağıdakı kimi qruplaşdırmaq olar:

Qovluqda irili-xırdalı cəmi 92 vərəq yazı vardır.

Farsca əsərlərinin əksəriyyəti 12 x 34 sm (1 vərəq), 17,5 x 22 sm (3 vərəq), 22 x 34 sm (1 vərəq), 11 x 17,5 sm (1 vərəq), 21,5 x 26,5 sm (4 vərəq), 13,5 x 21,5 sm (şagird dəftərindən 2 vərəq) ölçülü kağızlarda yazılmışdır.

17 x 22 sm ölçülü kağızlardan düzəldilmiş 5 vərəqlik dəftər parçasında şairin azərbaycanca aşağıdakı şerləri köçürülmüşdür:

$I^a$-da

Başlanır:

ای منیم همدم خوروز بازیم
ای رفیق شقیق همرازیم

Bitir:

اقصری ایله ییبدیر مکتبدار

Ib-də heç nə yazılmamışdır.

$2^a$-da:

Başlanır:

شهدا حالتین ائدیر یاد
ایکی اوچ نوحه ایله ییب بنیاد

Bitir:

بیر زمان خوابدان اولور بیدار
فایده هیچ ویرمز استغفار

$2^b$ – lakunadır.$3^a$-da:

Başlanır: بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

Bitir: ای ابو طالب نیک و کردار

$3^b$-də başqa bir xətlə “Mirzə Məşədi Ələkbər fəxrül-ətibba” qeydi verilmişdir.

Başalanır:

آیا عزیز و نیک خلق و خوش

Bitir:

لبیب و عاقل و ماشیار و اهل حال ای دوست

$4^a$ lakunadır,
$4^b$-də farsca kiçicik qeyd yazılmışdır.

$5^a$-da:
Başlanır:

دوستا مدتدیر یوخدور سیزه گلمه ییمیز
ایسته سن وجهینی تحقیق ایله ییب بیلمه ییمیز

Bitir:

آه وافسوس بیزیم نشتریمیز کونداو اولموش
ممکن اولمور دخی بعضی دماری دلمه ییمیز

$5^b$-də Qasirin məşhur

“Ey edən aləmdə çox arifləri dilgir pul /
Eyləyən piri cəvanü həm cəvani pir pul”

beyti ilə başlanan şeri yazılmışdır.*

Qovluqda digər dəftər qalığı 16 vərəqdən ibarətdir. Vərəqlərin ölçüsü 17,5 x 22 sm. Sətirlərin sayı və mətnin ölçüsü müxtəlifdir. Kimsə, dəqiq məlumdur ki, materiallar Əlyazmalar İnstitutuna təhvil verilməmişdən qabaq, qara rənglə yazılmış şerlərin üstündən bənövşəyi mürəkkəblə üfüqi xətlər çəkmişdir.

1[ab] vərəğində farsca şerlərdir. 1[a]-nın haşiyəsində:

آقا سید اورا گیدندن بری
سندن بیزه هیچ بر احوال کلمه دی

beytilə başlanan mənzum məktub yazılmışdır. 1[b]-də:

وصول اولدوبنه بیر تحفه کیم مهوانه کوندردین
بنیم چون گوییا بر خلوت شاهانه کوندردین

beytilə başlanan mənzumnamə verilmişdir.

15[b]-də qırmızı mürəkkəblə "Cəvabi Məhəmmədəli bəy bi-Qasir" sözləri qeyd olunmuş və "Arifi-rindi-xərabət qələndər məslək / Xəlqə məlum olan zahiri molla Molla" beytilə başlanan şer yazılmışdır.

16[a] lakunadır, 16b-də isə Taqirov familiyalı naməlum şəxsin rusca məsələyə dəxli olmayan qeydi vardır. Burada həmçinin iri xətlə "Bağdad 1319" tarixi (=1902 m.) yazılmışdır. Vərəqlərə Bakıdakı tütün fabrikini reklam edən köhnə kağızdan bir cild yapışdırılmışdır.

Qovluqdakı bütün başqa materiallar ayrı-ayrı pərakəndə, müxtəlif ölçülü, müxtəlif keyfiyyətli vərəqlərdən ibarətdir.

Vərəqlərdən birində 1314 tarixi (=1897 m.) qeyd olunmuş:

---

*Şairin 1988-ci ildə çap olunmuş ilk şerlər kitabına rəydə tədqiqatçı X.Mehdiyev yazır "Təəssüf ki,"Ey olan çox adamın əsərdə peyqəmbəri pul" misrası ilə çaşlayan və "puldur, pul" rədifli şerləri kitaba düşməmişdir" [31, s.94]. Təəssüf etmək olar ki, 5[b] –dəki həmin şer də həmin kitabda nəzərdən qaçırılmışdır. Halbuki pula həsr etdiyi şerlərin çoxluğu dünyagörüşünə işarədir.*

میرزا عیسا منه بیر نامه گوتوریاز کیشی
اولا ابواب محبت اوزومه باز کیشی...

və

ای قدی اوزون احمق وبنیاده یالانچی
دئه ملا آدی فتاح ممواده یالانچی

beytləri ilə başlanan şerləri verilmişdir.

Qovluqdakı bir dəftərdə rusca «Географическайа карта принадлеъит ученику II класса II-го Отделенийа Мирза Самину Ахундову. В городе Лен. 18 сентябрйа 1887 года» sözləri yazılmışdır.

Başqa bir vərəqdə dimdiyində balıq tutmuş ördək və uzun saqqallı çalmalı molla rəsmi çəkilmişdir və hiss olunur ki, bunu çəkən adamın müəyyən rəssamlıq qabiliyyəti varmış.

Vərəqlərdən birində Qasirin Bakıdan Lənkərana ailəsinə və dostlarına müraciətlə məktubu və farsca nəsri yazılmışdır.

**B-1546 şifrəli qovluqda** da Qasirin azərbaycanca və farsca mənzum məktubları, rübailəri, qəzəlləri və müxəmməsləri saxlanılır. Pərakəndə ağ vərəqlərdə yazılmış bu materiallar cəmisi irili-xırdalı 104 vərəqdən ibarətdir. Əksəriyyəti farscadır. Vərəqlərdən birində rusca: «Tetrad uçeniku 1-qo klassa 1-qo Otdeleniya Abdul Quseynu Axundovu. 8 sent. 1885 q., qor. Lenkoran» sözləri yazılmışdır. Vərəqlər arasında başqa dəftərlərdə rast gəlinən səliqəli Qasir xətti nümunələrinə təsadüf olunsa da, əksəriyyəti başqaları tərəfindən yazılmışdır.

Qovluqdakı materiallar içərisində "Gördüm yenə cananımı canan arasında" misrası ilə başlanan "qəzəli-türki" və Məcruha cavab məktubu azərbaycancadır. Bir vərəqdə rusca "84 год" yazılmış və Qasirin şəxsi möhürü basılmışdır. Başqa bir vərəqdə aydın oxunan "Zəbihüllah İsmayıl" ("Allaha qurban olan İsmayıl") möhürü vurulmuşdur. Vərəqlərdən birinə səliqəli kəsmə naxış yapışdırılmışdır. Ola bilsin ki, bu Qasirin əl işidir – məlumdur ki, "Qasir yağlı ağ kağız üzərində dırnaqla gül, müxtəlif fiqurlar çəkər və ya söz, şer yazarmış (buna xətti-naxuni deyərmişlər)" [6, s.44] və

deməli, Qasirin bü cür incəsənət nümunələri yaratmağa həvəsi və bacarığı varmış.

Vərəqlərdə “Əz qəzəliyyati-ağam Qasir əst”, “Əz rübaiyyati-Mirzə Qasir əst”, “Dər zikriyyati-məşhurat” sözlərinin qeyd olunması göstərir ki, burada toplanmış şerlərin əksəriyyəti Qasirin oğlu və ya şagirdləri tərəfindən köçürülmüşdür.

Beləliklə, bu təsvirdən Qasirin Əlyazmalar İnstitutunda mühafizə edilən birbaşa əlyazma irsi haqqında ümumi təsəvvür yarandığını güman etmək olar. Bundan başqa, şairin irsinin müəyyən parçaları XIX-XX əsrin əvvəllərinin materialları şəklində bizə gəlib çatmışdır.

XIX əsr mənbələrindən H. Qayıbovun və Mirzə İsanın təzkirələrində, həmçinin B-132 şifrəli məcmuədə və 439 nömrəli fraqmentdə (sonuncu Qasirin avtoqrafıdır) şairin adı çəkilir və şerlərindən nümunələr təqdim olunur.

Hüseyn əfəndi Qayıbov “Azərbaycanda məşhur olan şüəranın əşarında məcmuə”sinin sonuncu cildinin axırlarında “Qasir təxəllüs Molla İsmayıl Təbriziyyül-əsl sakini-Lənkəran”ın adını çəkir və iki şerinin mətləsini təqdim edir [84, s.1330].

Qasirin müasiri və dostu Mirzə İsa Ziyai isə özünün “Təzkirei-Ziyai”sini yazarkən bir mənbə kimi istifadə etdiyi Lütfəli bəy Azərin “Atəşkəda”sındakı məlumatlara Qasirin də adını əlavə etmiş və təzkirəni haşiyəsində onun “İşimiz” və “Bərادər” adlı iki şerini nümunə vermişdir [83, vər.83b].

Şamaxıda 1898-ci ildə gözəl nəstəliq-şikəstə xətti ilə köçürülmüş B-132 şifrəli cüngdə isə “Mirzə İsmayıl Qasir təxəllüsün Badikubədən Hacı Seyid Əzim Seyid təxəllüs üçün eylədiyi” 23 bənddən ibarət müxəmməs şəkilli mənzum məktubu yazılmışdır [81, vər.161b-163a]. Qara xallı karton cildə tutulmuş bu cüng ağ saya kağızlarda qara mürəkkəblə yazılmışdır. Şerin birinci və dördüncü bəndlərinin hərəsi dörd misradan ibarətdir və buradan görünür ki, əlyazmanın naməlum katibi məktubu orijinaldan deyil, başqa bir mənbədən köçürmüşdür.

Başlanır: ساقییا، سنده بو گون مهر مودت گورونور

Bitir: ... ایيله مز باک هر اول کیمسه ده گورونور

Qasirin hələlik yeganə nəşr olunmuş şerlər kitabına düşməmiş bu müxəmməs, məzmunundan göründüyü kimi, onun Seyid Əzimə ilk məktubdur. Məlumdur ki, Bakıda olarkən Qasir şamaxılı Seyid Əzimin Bakı şairlərinin həcv etdiyini bilib, ona mənzum məktub göndərmişdi:

Seyyida, bəsdi bu didacə dəxi oldu təmam,
İndi lazımdı gərək zikr ola bir qeyri kəlam.
Nə səbəbdən bu rövş eyləməsin cəhəti-nam,
Gəlibən eyləmişəm bəndə də Bakudə məqam,
Baxıram hər tərəfə, dövlətü ne'mət görünür.
Sən xəyal eylədiyin kimsənələr təkhatəkdir,
Yoxsa hər kəsdə həya ilə ədəb, eşşəkdir.
Bəndəi-hümbəzmlərim arifü xoşməsləkdir,
Gördüyün söyləməyən kimsə məhlişəkdir,
Həqqi inkar eyləyən şəxsdə illət görünür.

Göründüyü kimi, Qasir Bakının və bakılıların tərifini verir və bu yolla Seyid Əzimi "imana" döndərmək istəyir:

Olsa hər kimsədə zərrə fərasətlə şüur,
Kirdi-cəhl eyləməsə dideyi-insafını kur,
Bəli, xaliq eyləyib lütfünü Bakudə zühur,
İndi hər məmləkətə Bakü olub mətlə'i-nur,
Bir belə şəhrə nə irad, nə diqqət görünür.

Beləliklə, aydın olur ki, Qasir birinci məktubunda Seyid Əzimi heç də həcv etməmiş, Bakı haqqında ona bəzi mətləbləri çatdırmaq, hələ Lənkəranda olarkən Bakı və bakılılar haqqında

Nəqiyova eylədin gözü qaşı,
İndi olub Bakıda tacirbaşı,
Bizlərə də yavan yedirtdin aşı...
Gah BakudəTəqiyova vermiş kürurlən,
Əngüştnüma edib onu xürdü kübarə pul.

kimi şerlər yazmasına baxmayaraq, Bakıya gəlib, bu şəhərin müasir və üstün cəhətlərini öz gözləri iləgördükdən sonra onu "müdafiə etmək" qərarına gəlmişdi. Şairin əsərlərinin gələcək nəşrində göstərilən cüngdəki müxəmməs-məktubun da verilməsi və onun Seyid Əzimlə məktublaşmasının xronoloji sıra ilə təqdim edilməsi vacib məsələdir.

**Fr-439 şifrəsi** altında saxlanan I vərəqlik (20,5 x26,5 sm) materialda Mirzə İsmayıl Qasirin iki şeri yazılmışdır. Vərəq iki yerə qatlanmış olsa da, onun ancaq bir üzü yazılıdır. Burada qara mürəkkəblə

ای نوردیده گل بو قدر زار آغلاما
منی پری ایتمه چون دا دل افکار آغلاما

mətləsi ilə başlanan və

ایتدی کباب قاصری بو آغلاماق سوزو
دنیا کوزونه اولدو اونون نار آغلاما

beyti ilə bitən 18 beytlik qəzəli, həmçinin

اومیدیم اولدو کیم اولسان عافیت بخیر
حیران قالا او کار دمیم آشنا و غیر

beytilə başlanıb,

قاصردن ائت بو نکته نی قلبینده یادگار
چوخ کیمسه دن بو عصرده یئیدیر خیرغیر

beytilə qurtaran 6 beytlik qəzəli yazılmışdır. Başqa yazılarla tutuşdurulmaq yolu ilə bunların Qasirin özü tərəfindən köçürüldüyünü aşkar edirik - fraqment avtoqrafdır [85].

Məlumdur ki, Mirzə İsmayıl Qasir yaradıcılığının bir hissəsini də onun gözəl xəttat kimi katiblik etməsi təşkil edir. Mütəxəssislər onun nəsx, təliq və naxun xətlərinin ustası olduğunu dəfələrlə qeyd etmişlər. Xəttatlıq

fəaliyyətindən bizim günlərimizə nümunə kimi onun 1870-ci ildə köçürdüyü Şeyx Mahmud Şəbüstərinin “Kənzül-həqaiq” məsnəvisinin gəlib çıxdığını qeyd etməliyik [87].

Əlyazmalar İnstitutunda **B-335 şifrəsi** altında saxlanan bu əsər 13 x 21 sm ölçülü tək cizgi ağ və saya çəhrayı vərəqlərdə şikəstə elementli incə nəstəliq xətti ilə köçürülmüşdür. Kitab 68 vərəqdən ibarətdir. Titul vərəğində rusca «Mirza Ali Akber Kulibekov» adı yazılmışdır. Cildi üzərinə qırmızı bəzəkli parça çəkilmiş müqəvva-kartondan ibarətdir.

Qasirin irsi və yaradıcılığından söhbət açan müəlliflər onun “Kənzül-həqaiq”i köçürdüyünü qeyd etmiş, lakin bu əlyazma kitabının tam mündəricatına diqqət yetirməmişlər. Halbuki Şeyx Mahmud Şəbüstərinin məsnəvisi kitabın yalnız $1^{b}$-$49^{b}$ vərəqlərini əhatə edir. $50^{a}$-lakunadır. $50^{b}$-$52^{a}$ vərəqlərində farsca “Dər müsibi-seyyidi-şühəda 23” adlı mərsiyə (v. $52^{b}$-$55^{a}$ lakunadır), $55^{b}$-$63^{a}$ vərəqlərində Qasirin özünün farsca, $65^{a}$-$64^{b}$ vərəqlərində Çakərin farsca, $65^{a}$-$67^{b}$ vərəqlərində isə həmin şairin “qəzəli-türki” ləriyazılmışdır. Göründüyü kimi, Qasirin yazılı avtoqraf irsinin müəyyən parçası da burada təsbit olunmuşdur.

Bundan başqa, Mirzə İsmayıl Qasirin xətti ilə bir də Hafiz “Divan”ının əlyazma nüsxələrindən birində rastlaşırıq. $1^{b}$ vərəğindəki qeyddən görünür ki, 8 x 13 sm ölçülü həmin miniatür əlyazma Qasirin şəxsi kitabxanasında olmuşdur [88].

Ümumiyyətlə xəttatlıq sənətinin mahir bilicisi olan Qasir başqa xəttatları da yaxşı tanıyırdı. Seyid Əzimin həcvini alanda xəttin Həmidə mənsub olduğunu təyin etmişdi:

Söz sənin, xətt Həmidin, nə’ti-tə’rif mənim,
Hamıya oldu bu mə’na mütəsəvvər, Seyyid.

Mirzə İsmayıl Qasirin haqqında və şerlərindən ən çox nümunələr verilmiş mənbələrdən biri də Əlabbas Müznibin şəxsi arxivindəki materiallar hesab oluna bilər. Burada şairin azərbaycanca və farsca şerlərinə 21 vərəq həsr edilmişdir [90]. Görünür, Müznib onun ayrıca kitabını hazırlamağı planlaşdırmış, lakin arzusuna çatmamışdır. Başqa bir yerdə isə Müznib Qasirin tərcümeyi-halı haqqında da məlumat toplamışdır [91].

"El şairləri" kitabının müəllifi Salman Mümtaz Qasirlə ən çox maraqlanan ədəbiyyatşünaslardan biri olmuş, onun qəzəllərini, müxəmməslərini [94], Məcruhla Qasirin müşairəsini [96], Qasirin Məcruha ithaf etdiyi şerini, həcvlərini [95] toplamışdır. Əlyazmalar İnstitutunda fraqment kimi ayrıca saxlanan 26,5 x 36 sm ölçülü iri kağızda qara qələmlə yazılmış materialın da xəttinə görə Salman Mümtaza mənsubluğu bəlli olur: həmin mənbədə də "min kəlami-Üryan"-la yanaşı, "min kəlami Qasir" 29 beytlik [86] "Qarə pul" şeri qeydə alınmışdır. Katib şeri 1331-ci ildə (=1913 m.) cəmadiyül-axər ayının 20-də köçürdüyünü göstərmişdir.*

Salman Mümtazın arxivində həmçinin Ə.Şərifov və H.Rəhimovun "Lənkəran şairləri" haqqında makina yazıları saxlanılır ki, burada da Qasir haqqında qeydlərlə rastlaşırıq [93]. "Həmin məcmuəni diqqətlə nəzərdən keçirdikdə belə anlaşılır ki, onun tərtibçisi Lənkəranda olmuş, oranın yaşlı sakinləri və məcmuədə adları çəkilən şairlərin bəzisi ilə görüşmüş, onlardan canlı şahid kimi istifadə etmiş, "Təzkirei-Ziyai"ni də oxumuşdur" [25, s.80].

Beləliklə, məlum olur ki, Salman Mümtaz "El şairləri" kitabını nəşrə hazırlayarkən çox ciddi axtarışlarda olmuş, Mirzə İsmayıl Qasir irsi ilə də əlahiddə maraqlanmışdır. Nəticədə Qasirin 7 şeri (Əskinas, Ərə verdi, Odun, Məcruh haqda mürəbbe, Qarə pul, Məhəmmədəli bəy Məcruha, Balaxanım) ilk dəfə olaraq 1927-ci ildə nəşr olunmuşdur [43, s.208-220]. Sonralar Qasirin adı rəsmi ədəbiyyatda uzun müddət unudulmuş, onun həyat və yaradıcılığı haqqında bir də yalnız 50-ci illərin sonlarından maraqlanmağa başlamışlar. Haqqında yazılmış ayrı-ayrı məqalələrdə tədricən Qasir şerlərindən nümunələr təqdim edilmiş, nəhayət, 1983-cü ildə M. Mustafayev özünün tərtib etdiyi XIX əsr Azərbaycan şeri nümunələri kitabına Qasir poeziyasını da daxil etmişdir [40, s.40-53]. Elə həmin il Əlyazmalar İnstitutunun dövri bülletenində Əzizağa Məmmədov Mirzə İsmayıl Qasir Axundovun"Qara pul", "Pul", "Bahalıq", "Əskinas", "Sən öləsən", "Şairin cavabı", "Ərə verdi" şerlərini nəşr etdirmişdir [35, s.122-126].

Qasir irsinin elm aləmində "Fövcül-füsəha" məclisi fonunda təbliğində və tanıdılmasında Əlyazmalar İnstitutunun əməkdaşı, mərhum alimimiz Nəsrəddin Qarayevin də xidmətləri qeyd olunmalıdır [24]. Bundan başqa, M.Talışlının 1983-cü ildə nəşr etdirdiyi kitabda Qasirin pedaqoji fəaliyyətinə

*_Həmin şer şairin yeganə kitabında 30 beytldə verilmişdir._

də 7 səhifəlik yer ayrılmış [55, s.20-26], nəvəsi İ. Axundov öz kitabında Qasirin ictimai fəaliyyəti və bədii irsi barədə qohum-əqrəbasından topladığı məlumatları çap etdirmişdir [6, s.36-44]. Göründüyü kimi, 60-cı illərin ibtidasında “seyredici realizmdən irəli gedə bilməyən” [3, s.471] Qasir haqqında sonralar getdikcə daha geniş faktlar toplanmış və tədricən onun yaradıcılığı Azərbaycan ədəbiyyatı tarixində özünəlayiq yerini tutmağa başlamışdır.

Nəhayət, “bir çox dəyərli lirik, ictimai məzmunlu şerləri və mənzum hekayələri” [31, s.96] hansı səbəbdənsə kənarda qalsa da, “Şəhri-hal” adlı tərcümeyi-hal səciyyəli iri həcmli mənzum əsəri və yenə “Farsca-azərbaycanca lüğət” adlı çox oricinal və maraqlı şeri [58] verilməsə də, 1988-ci ildə “Yazıçı” nəşriyyatı tərəfindən ilk dəfə Qasirin 152 Azərbaycan və 21 fars dilində (tərcüməçi – M.S. Sultanov) şerlərini əhatə edən kitabı nəşr olunmuş, bu kitab Mirzə İsmayıl Qasir irsinin daha geniş oxucu kütləsinə çatdırılmasında ilk addım kimi qiymətli olmuşdur. Bununla belə, Qasir irsinin tam nəşri hələ də gələcəyin işi olaraq qalır.

Burada bir məsələni də yada salmaq və izahını vermək yerinə düşərdi. Məlumdur ki, “vaxtilə məşhur ədəbiyyatşünas F. Köçərli Qasirlə görüşmüş və yazacağı əsərində onun haqqında məlumat vermək məqsədilə şerlərindən nümunələr almış və kitabının mündəricəsində onun adını da çəkmişdir”.

Tədqiqatçılar təəccüblə qeyd edirlər ki, “lakin hansı səbəbə görəsə Qasirin şerləri və tərcümeyi-halı Köçərlinin nəşr olunmuş ədəbiyyat tarixinə dair əsərlərinə düşməmişdir” [39, s.8-9]. Bu məsələ ilə maraqlandıqda diqqətimizi belə bir fakt cəlb etdi ki, Firidun bəy Köçərlinin əsərinin II cildinin II hissəsində Qasirin, eləcə də Sirrinin və Acizin adları “Föhrüst”də sonda verilir, kitabda isə onların heç birinə yer ayrılmır. Buradaca “idarə” adından qeyd olunur ki, həmin üç müəllif haqqında əsərin əlyazmasında da heç nə yoxdur [23, s. IV]. Ancaq biz daha bir şeyə diqqət yetirməliyik: Firidun bəy bu əsəri çox sanballı və səliqəli bir şəkildə yazmış, 2 cildin hər iki hissəsində səhifə tənasübünü gözləmişdir – 4 kitabdan hər biri 270-280 səhifəni əhatə edir. II cildin II hissəsi isə (Qasirsiz, Sirrisiz, Acizsiz) artıq 263 səhifədir.

Tərtibat işinə olduqca yaradıcı və dəqiq yanaşan bir alim hansısa bir cildin səhifələrinin “şişməsinə” razı ola bilməzdi. Görünür, Qasirin həmin şer nümunələri Firidun bəyin əlinin altında olmuş və onun adını mündəricata bu

kitab hələ tamamlanmamışdan salmışdır. Sonra isə tənasübün pozulacağını görüb, həmin üç şair haqqında məlumatları II cildin II hissəsindən çıxarmış, yəqin etmək olar ki, nəzərdə tutduğu III cildə salmaq istəmişdir. Lakin paradoksal təsadüf də olsa, əsərini çap etməyə "razılıq vermiş" sovet hököməti müəllifi özünün düşməni kimi edam etmiş və bu görkəmli şəxsiyyətin arzuları yarımçıq qalmışdır. Zənn etmək olar ki, "Azərbaycan ədəbiyyatı tarixi materialları"nın mündəricatına adı salınsa da, kitabın mətnində Qasirin "unudulmasının" əsas səbəbi elə budur. Məsələni başqa cür izah etmək çətindir. Əlyazma irsinin təsviri və əsərlərinin nəşri tarixinin nəzərdən keçirilməsi bir daha göstərir ki, Qasir yaradıcılığının mühüm hissəsi hələ də əlyazma şəklində qalmaqdadır. Bu Qasir əlyazmaları üzərində mətnşünaslıq işi aparılmasını zəruriləşdirir və bəlkə də, məhz belə mətnşünaslıq tədbirləri şairin irsinin qalan hissəsini nəşrə hazırlamağa praktiki kömək edə biləcəkdir. Mətnşünaslığın belə prinsipial tələbi ilə hesablaşmamaq çətindir: "Əvvəlcə mətni öyrənməli, sonra onu nəşr etməli" [66, s.550]. Digər tərəfdən, Qasir əlyazmalarını mətnşünaslıq süzgəcindən keçirmək üçün hazırlıq mərhələsi kimi şairin yaradıcılıq xüsusiyyətlərini, iradə və məramını özündə əks etdirən ideya tutumunu və yaradıcılığında klassik ənənələri öyrənmək lazım gəlir. Çünki "mətnşünaslıq əsərin mətninin tarixini araşdırır, mətnin tarixi insanlar tərəfindən yaradılır... Bu halda isə mətnin tarixi cəmiyyətin tarixi ilə bağlı olur" [66, s.57] və cəmiyyətin tarixi bədii ədəbiyyatın ideya məzmununun formalaşmasına təsir göstərir. Beləliklə, mətni tədqiq etmək üçün sadalanan məsələləri işıqlandırmış köməkçi vasitə kimi praktiki əhəmiyyət kəsb edir.

## QASİR İRSİNİN İDEYA MƏZMUNU VƏ KLASSİK ƏNƏNƏLƏRİ

Mirzə İsmayıl Qasir poeziyasının ideya xətti təbii olaraq, şairin yaşadığı dövrün və ictimai mühitin təsiri altında formalaşmış və bu Qasir yaradıcılığının ümumi məzmununun zənginliyində öz əksini tapmışdır.

Tarixdən məlumdur ki, 1804-1813-cü illər rus-İran müharibəsi nəticəsində P.S. Kotlyarevskinin başçılığı altında rus qoşunları Lənkəranı ələ keçirib, şəhəri rus imperiyasının forpostuna çevirmiş, bununla Azərbaycan

tarixində "ruslaşdırma" siyasətinin ilk başlanğıcı məhz Lənkəranda öz təzahürünü tapmağa başlamışdır. Əsrin ortasında Lənkərana köçüb gələn Mirzə İsmayıl Qasir qısa müddət içərisində hakim rus üsul-idarəsinin yerli camaatın problemlərinin həllinə heç bir maraq göstərmədiyini, avtoxton islam mədəniyyətinin tədricən özünün ən zəruri mənəvi keyfiyyətlərini itirməyə məhkum olunduğunu başa düşmüşdü və bütün bunlar şairin satiraya meyl etməsində əsas rollardan birini oynamışdır. İranın şəhərlərini gəzmiş, Şirvanda və Muğanda yaşayıb-işləmiş Qasir, yəqin ki, Lənkərandakı kimi ziddiyyətlərlə heç bir yerdə qarşılaşmamışdı.

Məlumdur ki, Azərbaycan ədəbiyyatında satiranın müəyyən elementləri həcviyyat şəklində çox qədim tarixi köklərə malik olmuşdur, lakin "orta əsrlərdə klassik sənətkarlarımızın heç biri satiranı ədəbi cərəyan halına salmaq üzərində xüsusi çalışmamış və tarixi şəraitlə bağlı olaraq belə bir məqsəd o zaman heç qarşıda durmamışdır" [38, s.122]. XIX əsrdə isə Azərbaycanın yeni tarixi şəraiti məhz konkret satirik poeziyanın meydana gəlməsinə təkan vermiş, ayrı-ayrı regionlarda yaranan ədəbiyyat nümunələri, müxtəlif şairlərin yaradıcılığı bir-birinə güclü təsir göstərərək, milli ədəbiyyatımızın bu cərəyan boyu yeniləşməsinə yol açmışdır. Əlbəttə, burada şairlər arasında mənzum məktublaşmalar da mühüm rol oynamışdır, lakin güman etməyə əsas var ki, Azərbaycan ədəbiyyatında satira zamanın tələbi olmuş, mühitin ortaya atdığı ədəbi problem kimi özünə yer qazanmışdır: ölkənin hər bir yerində məhəlli və bütövlükdə Azərbaycan üçün ümumi olan ictimai dərd-sər var idi, bu da ictimai təfəkkürün inkişaf qanunauyğunluqlarından biri kimi, satiranın təbii şəkildə ortaya çıxmasına səbəb olmaya bilməzdi. Sabirin "yazıb-yaratdığı günlərdə cəmiyyət məhəm-mədhəsənəmilərdən, novruzəlilərdən, qurbanəlibəylərdən, fatma-tükəzbanların uğursuz tale- yindən, qırmızısaqqal kişilərdən uzaqlaşırdısa" [2, s.139], Zakirin və Qasirin dövründə müsəlmançılıq anlayışının tənəzzülə sürüklənməsinin, dini-əxlaqi- mənəvi dəyərlərin çox böyük ustalıqla siyasi təzyiq altında ünütdurulmasının nəticəsində elə həmin məhəmmədhəsənəmilərlə xudayarbəylər, pristavlarla qurbanəlibəylər, fatma-tükəzbanlar hələ meydana çıxmağa başlayırdı və həyatın özündəki belə yabançılıqlar ədəbiyyatda əksini tapmaya bilməzdi.

Beləliklə, Mirzə İsmayıl Qasir kimi sənətkarlar ancaq ədəbi bir yenilikdir deyə yox, həyatın və ictimai mühitin təsiri altında satiranın

imkanlarından bəhrələnməyə meyil göstərir, ürəklərində qövr edənləri yalnız bu yeni janrın vasitəsi ilə kağıza “boşaltmağın” mümkünlüyünü görürdülər. Məhz belə oldu ki, kifayət kəmiyyətdə (və yəqin ki, yalnız klassik mövzu ənənələrinə sadiq qalıb ancaq bu istiqamətdə işləsə idilər, bu kəmiyyət göstəricilərini inkişaf etdirib, kamil bir divan ortaya qoyardılar) və kifayət qədər uğurla lirik poeziya nümunələri yaratmış Zakir də, Qasir də və sonralar Mirzə Ələkbər də Azərbaycan ədəbiyyatı tarixində məhz satirik şairlər kimi tanındılar, klassik Azərbaycan satirasının ən görkəmli nümayəndələri oldular. Onların satirik poeziyası “müstəqil ədəbi cərəyana çevrilən şerin vuran qəlbi və düşünən beyni olmuşdur” [36, s.16].

Mirzə İsmayıl Qasir öz yaradıcılığına “Məcnun” təxəllüsü ilə yazdığı farsca və azərbaycanca qəzəlləri ilə başlamışdır. Onun lirik yaradıcılığının böyük əksəriyyəti həyatının İran dövrü və Lənkərana gəlib çıxmamışdan qabaqkı illərə aid edilə bilər. Lənkəran mühitində isə Qasir bütün gücünü-qüvvəsini maarifçiliyə, yaratdığı ədəbi məclisə, məclisçilik hərəkatının Azərbaycanda yayılıb-möhkəmlənməsinə yönəltmiş və bu yolda çox böyük maneələrlə qarşılaşdığından onun yaradıcılığında mübarizlik, ifşaçılıq, satira əsas mövqeyə keçmişdir.

Mirzə İsmayıl Qasir yaradıcılığında əsas ideya istiqaməti “iki dəqiqədə min dərdə çarə”, lakin ikinci tərəfdən, “zəminü zamanı bir-birinə vuran”, “çox tacir oğlu taciri həmmal eyləyən”, “hər gülüstani, istəsə, bir dəm xərabə edən” pulun, əskinasın, kapitalist münasibətlərinin tənqidi ilə bağlıdır ki, bu da Qasir satirasının ictimai dəyərini çox yüksəkdə saxlayır.

Salman Mümtaz “Qasım bəy Zakir” məqaləsində Zakirin Aşiq, Zəbih, Zuyi, Didə, Mirzə Mehdi, Asi, Vəfa, Lə’li, Yusifi, Hacı Seyid Əzim və Sabirlə yanaşı, Qasirin də müəllimi olduğunu qeyd edir [45, s.139] və bu tamamilə doğrudur. Lakin Qasiri satira aləmində ictimai cəhətdən Zakirdən və Seyid Əzimdən irəli çəkməyə sövq edən bir obyektiv amil vardır. Qasım bəy Zakir 1857-ci ildə artıq vəfat etmiş və çarizmiin 1861-ci ildə təhkimçilik hüququnu ləğv edəndən sonrakı dövr Azərbaycanını görməmişdir. Odur ki, bu böyük sənətkarın əsərlərində kapitalist münasibətlərinin ifşası, pulun cəmiyyətdə iyrənc bir mövqe tutması, milli-mənəvi dəyərləri sıxışıdırıb məhv etməsi bədii ifşa olunmamış qalır. “Tarix göstərir ki, Azərbaycanın klassik sənətkarları öz dövrlərindəki haqsızlıq və zülmü tənqid etməkdə bir o qədər də sərbəst olmamışlar. İrticanın çomağı, yeni dövrdə isə çar senzurasının

qanlı qələmi daim onların gözü qabağında gəlib durmuşdur” [38, s.127]. Seyid Əzimin poeziyasında da belə vəziyyət özünü büruzə verir – şair ya pulun cəmiyyətdə mövqeyini hiss etməmiş, ya da çar metropoliyasından Azərbaycana ixrac edilən yeni münasibətlərə toxunmamağa üstünlük vermişdir.

Qasirdə isə vəziyyət başqa cürdür. O, Azərbaycan şerində kapitalist münasibətlərinə toxunan və buna qarşı etiraz edən ilk şairdir. O, başa düşürdü ki, tarixən heç bir təhkimçilik ziddiyyətləri olmamış Azərbaycanda Rusiyanın problemlərindən irəli gələn çar fərmanının tətbiqi əslində burada milli xanlıq-bəylik münasibətləri qalıqlarının tamamilə məhv edilməsinə, beləliklə, millətin özü içərisindən liderlər müəyyənləşməsinin qarşısının alınmasına və deməli, milli-mənəvi dəyərlərin, ənənəvi müsəlmançılıq münasibətlərinin məhv edilib, onların pul-kapitalist münasibətləri ilə əvəzlənməsinə, bir sözlə, Azərbaycan mədəniyyətinin, azərbaycanlı şüurunun biryolluq kölələşdirilməsinə yönəldilmişdi. Məhz bunu dərindən duyduğu üçündür ki, Qasir şerləri “ictimai həyatın mənfiliklərini qəzəblə ittaham edən, yaxud kəskin surətdə lağa qoyan” [14a, s.205] bir ideya ilə silahlanır, satirikləşir, bu şerdə etiraz səsi coşub-daşır.

Şair özü türkcə yazdığı pula aid dörd şerin mətləsini xatırlayaraq, pul-kapitalist münasibətlərinə qarşı mövqeyini altıncı dəftərin (B-1266) sonundakı farsca qeydində belə açıqlayır:

“Pulun keyfiyyət və xasiyyəti haqqında mürəbbe, müxəmməs və sairədən ibarət bu bir neçə parça şeri onlara nəzər salanların ibrət alması üçün məsxərə (satira) şəklinə saldım və camaat arasına atdım. Lakin vaxt olmadığı üçün bəzi nüsxələr tapılmadı. Sözsüz ki, istər-istəməz bu bir neçəsindən başqa hər sözün mətləsi sona qədər yazılmadı. Zəmanə adamlarının çoxu pulun xəstəsidir. Əlbəttə, onların zövqünə uyğun olacaqdır”.

Qasir pulun insanlar arasında zümrə fərqlərini dərinləşdirdiyini, ictimai ziddiyyətləri artırdığını, çərxi-fələyi tamamilə tərsinə fırlatdığını görür:

Gəh bir zaman pəşşəni manəndi-fil edər,
Gəh bir qarışqatək eyliyir əcdahanı pul...

Pulun çox ədalətsizliklər törətdiyini və yaramaz adamlara qismət olduğunu göstərir:

Hər yerdə mümsük olsa, onu axtarıb tapar,
Eylər onun cibində, evində məkanı pul...

Ümumiyyətlə, Qasirin satira yaradıcılığında pula, qara pula, əskinasa, kapitala həsr olunmuş bir sıra silsilə şerlər vardır ki, ideya-məzmun etibarilə bunların hamısı bir-birini tamamlayır, şairin kapitalist münasibətləri haqqında dünyagörüşünü əks etdirir.

Qasir yaradıcılığında cəhalətin, geriliyin, hətta o dövr üçün belə köhnə fikirliyin tənqidi, yenilik uğrunda mübarizə motivləri, təhsil almağa, maarifə qoşulmağa çağırış əsas yerlərdən birini tutur:

Uyma, ey dil, qəflətə, bir dəm ayıl sən xabidən,
Hər zaman ibrət götür girdari-şeyxü nabidən

deyən şair "tifli-məktəb"in "əbcədü dəftərdən agah" olmadığından məyus olur, bütün bunların vilayətdə kizbü-böhtana, yalançılığa, insanlar arasında bir-birinə pis münasibətlərin yaranmasına yol açdığını görür, bütün hirsini "sən öləsən!" nidası ilə kağıza tökür:

Xasü amm içrə qəribə mütəarif olmuş,
İnanır, söyləsə hər kimsə yalan, sən öləsən...

Cəhalət o qədər baş alub gedir ki, mənəviyyatsızlıq o həddə çatır ki,

Anlasa gər bir-birinə yalan yerə deyib,
Düşər ortalığa nahaq yerə qan, sən öləsən...

"Həqqi-batil sındı cəhlilə" – deyən Qasir insanların "şər'i - peyğəmbərdən" uzaqlaşdığını və buna görə də "əl kəc, qələm əyri" olduğunu görür, bir-sıra şerlərində öz zəmanəsindən şikayətlənməli olur.

Bu mənada şairin "Anlamadım" şeri çox səciyyəvidir. Qasir dünyanı gəzib-dolaşdığını, "bəzi ətrafı dolandığını", lakin "mərifətü əqlü kəmala" rast gəlmədiyini, onu anlamadığını yazır. Nadanlıqdan camaat ancaq var-dövlət, cah-cəlal yığmaqla məşğuldur. "Bəzilər Məkkəyə getcək adını Hacı qoyar" və təkəbbürdən "bir neçə kəs börkünü qıyqacı qoyar" – bütün bunlardan

"nədir mənfəəti-cahü-cəlal, anlamadım", - deyən şair əsl xoşbəxtliyin, tərəqqinin oxuyub təhsil almaqda olduğunu, xalqın öz mənliyini qoruya bilməsinin açarının maarifçilikdə olduğunu dərk edir.

Tədqiqatçıların qənaətlərinə görə, Qasirin satiraya üz tutmasının bir səbəbi də Lənkəranda ona "babi" adı qoymuş nadanların münasibətindən irəli gələn şəxsi motivlərlə bağlı olmuşdur. "Ruhani və cəhalətpərəstlər Qasir kimi mütərəqqi fikirli adamla heç vaxt barışmır, hər vasitə ilə ona zərbə vurmağa çalışırdılar. Məhz bu səbəblər M.İ.Qasiri həcv və satirik şerlər yazmağa məcbur edir. Qasir "Kişilər" adlı bir satirik şerində cəhalətpərəstləri "yalançı müsəlman" adlandıraraq, bu nadanların əlindən tənqə gəldiyini bildirir:

Eşidin bu sözü, ey sahibi-iman kişilər!
Məzhəbi pak, özü pak müsəlman kişilər!
Lənkəranda, görəsən, mən kimə naxoş demişəm,
Ya kimin kasəsinə, kisəsinə boş demişəm,
Ya kimin atına dübrüş, eşşəyinə hoş demişəm,
Ya ki mən hansı görək adəmə sərxoş demişəm.
Ta ki, məndən ola bir kimsəyə üsyan, kişilər!

Mənə "babi" deyən heç etməyib əndişəsini,
İstəyibdir isbat edə öz pişəsini.
Bir baxın anlamaza, daşla çalıb şüşəsini,
Yetişə həcv ilə, bilməyib, qazaram rişəsini
Yazaram mən ona bu növ ilə dastan, kişilər!" [57]

Qasirin bu şeri də təəssüf ki, kitabına düşməmiş, eyni adlı başqa şeri verilmişdir.

Təbiidir ki, öz şəxsi düşmənlərini "sahibi-iman", "pak müsəlman", ələlxüsus da "kişilər" adlandırmaqla Qasir olduqca dərin və bu cür "kişilərin" qana bilməyəcəyi üslubi ironiyaya, kinayəyə əl atmış, onların əslində bu keyfiyyətlərdən məhrum olduqlarını çox eyhamlı şəkildə çatdırmışdır. Tədqiqatçı-alim M.Mustafayev haqlı olaraq, göstərir ki, "Qasirin bu şerini oxuduqda istər-istəməz M.Ə.Sabirin "A şirvanlılar", Mirzəli Möcüz Şəbüstərinin "A şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?" şerləri yada düşür" [41]. Bu isə ona işarədir ki, XIX əsrdə də, XX əsrin əvvələrində də,

İranda da, Turanda da qabaqcıl ziyalıların qisməti eyni cür, həyatı və mühiti eyni cür idi.

Qasir şerinin ideya şaxələrindən birini qadın hüquqsuzluğuna qarşı mübarizə təşkil edir.

Ümumiyyətlə, XIX-XX əsrin əvvəllərinin satirasında "siğə, mütə, çoxarvadlılıq, qeyri-bərabər-evlənmək, qadını ev dustağı edən şəriət qanunları kəskin satira atəşinə tutulur. Azərbaycan qadınının ismət və ləyaqəti, heysiyyat və mənliyi, mənəvi paklıq və ucalığı müdafiə olunur" [19, s.136]. Bu mənada Qasir şeri nəinki istisna təşkil etmir, hətta, əksinə, XIX əsr Azərbaycan satirasının adı Azərbaycan ədəbiyyatı tarixində özünəməxsus sanballı yer tuta biləcək gözəgəlimli nümayəndələri içərisində Qasir birinci şəxsiyyətdir ki, qadın hüquqsuzluğu məsələsinə öz yaradıcılığında geniş yer verir. Zakir və Seyid Əzim satirasında qadın problemi böyük bir məsələ kimi qoyulmamış, sonralar Mirzə Cəlil, Sabir, Yüsif Vəzir kimi bir sıra ədiblərimiz tərəfindən inkişaf etdiriləcək bu mövzu ilk dəfə bu qədər dolğunluğu ilə Qasir poeziya- sında işlənmişdir. XIX əsrin məşədibadlarının, gülnazlarının taleyini ilk dəfə Qasir görüb-sezmiş və kəskin atəşə tutmuşdur. Şair öz yaradıcılığında qadın məsələsinə ya birbaşa toxunaraq, bu mövzuda şerlər yazmış, ya da ayrı-ayrı şerlərində nadan və cahil xalq kütlələrinin rəzilləşmiş dünyagörüşləri fonunda adiləşmiş belə eybəcər hallara toxunmuşdur.

Deyilənə görə və həm də şerin özünün məzmunundan göründüyü kimi, Qasir cavanlığında Balaxanım adlı bir gözələ vurulmuş, lakin atası onu Molla Əli adlı bir qocaya satmış, beləliklə, cəhalətdən doğan bir bəlanı öz taleyində hiss edəndən sonra o, qadın hüquqsuzluğunu ifşa edən "Balaxanım" adlı satirik şerini yazmışdır:

> Nə rəvadır qoca kişi gəlinin
> Tapsın vüsalından kam, Balaxanım...

Qasir öz sevgilisinə müraciətlə onu qocaya ərə getməyə razı olmamağa, "qoca hirək kişiləri" tutmamağa, ona ərə gəlib, onunla xoşbəxt olmağa çağırır.

"Dəliqanlı" cavanlıq dövründə yarına yalvarıb, ondan vəfa gözləməsi gənc Qasirin hələ o illərdə sadəlövhcəsinə ədalətə, haqqa inanmasına, digər tərəfdən, qadının kölə vəziyyətini yaxşı başa düşmədiyinə dəlalət edir. Amma

heç bir Balaxanım öz “Hacı filani” atasının, qardaşlarının, əmilərinin sözündən çıxa bilməzdi. Məlumdur ki, Qasirin ilk məhəbbəti daşa dəymiş, Balaxanımı qoca mollaya vermişlər.

Tədricən bu həyatdan baş çıxarmağa başladıqca, Azərbaycan qadınının “malü əşya” kimi satılıb-alındığını öz gözləri ilə gördükcə, Qasirin hiddəti artır, belə ədalətsizlikdən yana-yana “Ərə verdi” şerini yazır:

Öz nökərinə versə idi, gər bu ayaqdan,
Heç kimsə deməzdi ki, qızı nökərə verdi.
Halbuki qızı satıb pul qazanmaq eşqinə
Ahu bərəni bir yekə nərrə xərə verdi.
Söyləyüblər qızı ver itə, amma iti aldat,
Bu səhv eləyib, qoydu iti, əntərə verdi.

və gör bir nə zəmanədir ki, özləri də öz qızlarını elə həmin cür satan Hacı-Filanilər də “söylür hamı əfsus o qızdan”.

Elmi-maarifi təbliğ edən, yeni tədris üsullu məktəb açmağa çalışanları “babi” adlandıran bir cəmiyyətdə “kişilər” kişiliyi-atalığı bu cür başa düşürdülər. Qasiri də mənən yandırıb-yaxan bu idi ki, o, bütün bunların səbəbinin nadanlıqda olduğunu çox gözəl dərk edirdi.

Beləliklə, Qasir satiralarının da XIX-XX əsrin əvvəllərinin bu yeni cərəyanı içərisindəki ənənəviləşmiş ideya məzmunundan qida aldığını, onu zənginləşdiirdiyini görürük. Qasir yaradıcılığının əsas ana xəttini cəhalətə və geriliyə qarşı mübarizə, maarifçilik ideyaları və bundan irəli gələn qadın hüquqsuzluğunun tənqidi təşkil edir. Qasirin hətta ilk baxışda şəxsi problemi kimi görünən mənzum-satirik məktublaşmalarında, həcvlərində belə, bu prinsipial məsələlərə sıx-sıx toxunulur.

Mirzə İsmayıl Qasir olduqca vətənpərvər şair idi. Buna ən bariz dəlillər kimi onu nümunə göstərə bilərik ki, “Azərbaycan” adının çar siyasəti nəticəsində azərbaycanlılara unutdurulduğu, vətənimizin ümumən Qafqaz adı altında tanıdılması illərində, XIX yüzillikdə Qasir, demək olar ki, yeqanə satirikdir ki, öz şerində “Azərbaycan” kəlməsini işlədir:

Tərk olub indi bizim əsrdə həm qismi-qəsəm,
Eyləyüb xəlqə hamı cərbi-zəban, sən öləsən.

Nə ki, Azərbaycan, bəlkə, İraq əhli, hamı,
Dəb olub bundan çinin, ondan çinan, sən öləsən...

Ayrı-ayrı şerlərində o, dilinin türk dili olduğunu dəfələrlə qeyd edir, hətta farsca yazdığı çoxsaylı şerlərindən bir mürəbbedə türk şairləri Füzuli və Nəvainin "sözunə aşiq" olduğunu göstərir. Onun bütün həyatı və fəaliyyəti də vətəninin və xalqının çiçəklənməsi, "ikinci ana vətəni" doğma Lənkəranın tərəqqisi, ölkədə elm və maarifin, anadilli ədəbi məclis hərəkatının yayılması işinə sərf olunmuşdur. Bütün bunlar Qasirin böyük vətəndaş, millət və torpaq qeyrəti çəkən vətənpərvər şəxsiyyət olduğunu təsdiqləyir. Deməli, Qasir öz əsərlərində, ictimai inkişaf qanunauyğunluqlarını və cəmiyyətin dəyişkənlik dialektikasını nəzərə almayıb, Azərbaycanda yetişməkdə olan kapitalist münasibətlərini pisləməklə, maarifçilik xəttini tutmaqla, qadın hüquqsuzluğuna və nadanlığa qarşı çıxmaqla əslində bir böyük ideyaya – vətənpərvərlik ideyasına xidmət etmiş, bu ideyanın ədəbiyyat vasitəsi ilə xalq kütlələrinə çatdırılmasına çalışmışdır.

Mirzə İsmayıl Qasirin ən mühüm xidmətlərindən biri onun Zakir kimi görkəmli müasiri tərəfindən binası qoyulmuş satiranı və bu cərəyandan irəli gələn mövzu və sücetləri özünün uzunömürlü yaradıcılığı boyu yaşadıb püxtələşdirilməsi, Lənkəran mühitindən doğan orijinal variantlarla zənginləşdirməsi və nəhayət, "öz əli ilə" XX əsrin qovuşuğuna gətirib çatdırması sayıla bilər.

Yeni əsrdə isə Mirzə Ələkbər Sabir və onun müasirləri kimi mütərəqqi ziyalılarımız Qasir poeziyasındakı ruhu və ideyanı mənimsəyib, davam və inkişaf etdirmiş, daha yüksək zirvələrə qaldırmışlar.

Əgər Qasir yaradıcılığı Azərbaycan ədəbiyyatı tarixində satiranın təşəkkülü və inkişafını öyrənmək baxımından maraq çəkirsə, ikinci tərəfdən, Qasir şerinin tədqiqi bütünlükdə XIX əsr boyu Azərbaycan ədəbiyyatının inkişafını, yeni ədəbiyyatın meydana gəlməsini, klassik ənənələrdən yeni-yeni forma və məzmun faktlarının meydana çıxması prosesini izləməyə imkan verir. Bütün bir əsr ərzində çox maraqlı həyat və yaradıcılıq yolu keçmiş şair-pedaqoqun əsərləri içərisində, bir yandan, tam klassik şeriyyatı özündə əks etdirən, ikinci tərəfdən, yeni ədəbiyyatda da klassik poeziya ənənələrini bir element kimi yaşadan və nəhayət, üçüncü tərəfdən, yazılı ədəbiyatımız üçün ancaq XIX əsrə xas yenilikləri əhatə edib, klassik

elementlərdən məhrum olan çox gözəl şerlərə rast gəlirik. Tədqiqatçılar qeyd etmişlər ki, “XIX əsr qəzəl şairlərindən fərqli olaraq, Qasir klassik şer formalarından başqa, heca vəznində, aşıq ədəbiyyatı ruhunda qoşmalar da yazmışdır” [34, s.40]. Deməli, Mirzə İsmayıl Qasir yaradıcılığında yeni ədəbiyyata xas olan cəhətləri onun şerlərinin yalnız məzmununda deyil, formasında da görürük. Bu isə Qasir irsinin mətnşünaslıq təhlili üçün mühüm təcrübi əhəmiyyət kəsb edir.

Bununla yanaşı, Qasir şerlərindən heç biri boş fəzada yaranmamışdır və onun bütün yaradıcılığında bu və ya digər dərəcədə klassik şer ənənələri özünü büruzə verir.

Yəqin ki, Qasirdə klassik ənənələrdən danışarkən hr şeydən əvvəl onu qeyd etmək lazımdır ki, Mirzə İsmayıl Qasir satira ədəbiyyatında orta əsrlər Azərbaycan şerlərində geniş yayılmış qəzəlin formal cəhətlərini, yəni satirada lirikanın formal elementlərini tətbiq etmiş ilk şairlərdən biridir. Sonralar Mirzə Ələkbər Sabir tərəfindən daha da inkişaf etdirilib, geniş işlənmiş bu bədii üslubun ilkin əlamətləri Qasir yaradıcılığında özünü göstərir:

Neçə müddətdi qamış söhbətimz ləngə düşüb,
İstərəm şe’r yazaq, qafiyəmiz tənqə düşüb

mətləli 6 beytlik satirası formaca qəzələ bariz nümunə ola bilər.

Hicri 1301-ci ildə (=1883 m.) öz dostları Hüseynəli, Məhəmmədhəsən və Mirəli Nağıya zarafatla yazdığı

Ey mənim dostlarım, mən kimi əbləh kişilər,
Fikrü amalı uzun, niyyəti kutəh kişilər

mətləli,

Sizə bu nüqtəni kərrat deyibdür Qasir,
Olmayın pis adama heç və’də həmrəh kişilər

mətləli 10 beytlik satirası da formaca qəzəlin bütün əlamətlərinə cavab verir. Qasir satiraları içərisində bu cür məqamlara çox rast gəlirik. Bütün bunlar göstərir ki, Azərbaycan ədəbiyyatı tarixində hələ XIX əsrdə Qasir köhnə şer formalarına yeni məzmun vermiş, yeni ədəbiyyata tədricən keçid mərhələsində çox maraqlı bir ədəbi prosesin binasını qoymuşdur. Onun

yaradıcılığında klassik ənənələrin qorunması belə əsərlərində özünün orijinallığı ilə seçilir: məzmun yeni, forma klassik və ənənəvidir.

Mirzə İsmayıl Qasir yaradıcılığında klassik ənənələrdən daha geniş söhbət açmaq üçün isə onun lirikasını öyrənmək lazımdır.

Məlumdur ki, Qasir əsasən ikidilli şair olub, əsərlərinin böyük bir qismini ana dilində və farsca yazmışdır. Öz yaradıcılığına qəzəl yazmaqla başlayan Qasir xüsusən cavan yaşlarında bu janrda fəal olmuş, hər iki dildə gözəl lirika nümunələri yaratmış, həyatının sonrakı dövründə isə "Fövcül-füsəha"dakı rolu və mühitin təsiri altında əsas qüvvəsin başlıca olaraq Azərbaycan dilində yeni ədəbiyyat incilərinin yaradılması üzərində cəmləmişdir.

Bununla yanaşı, Qasir ədəbi irsinin araşdırılması bir daha sübut edir ki, şair öz yaradıcılığında klassik şer ənənələrinin yaşadılmasına dərindən maraq göstərmiş, bütün ömrü boyu qəzəllər, mürəbbe, müxəmməs, müsəddəs, müstəzad, rübai və s. poeziya nümunələri yazmaqda davam etmişdir.

Qasir kifayət qədər kamil təhsil almış, fars və ümümtürk ədəbiyyatı xadimlərinin yaradıcılığı ilə yaxından tanış olmuşdur. Belə olduqda isə, təbiidir ki, klassik ədəbiyyat onun öz yaradıcılığına da güclü təsir göstərməli idi. "Kullandığı məzmunlar, dilə təsəvvüf tərzi klassik ədəbiyyatın prinsiplərinə görədir" [59, s.36].

Qasirin ümumiyyətlə bütün yaradıcılığına və dini-fəlsəfi dünyagörüşlərinə Şərqin böyük mətəfəkkirlərinin nəzərəçarpacaq təsiri olmuş və o özü şerlərində bunu etiraf edərək, ayrı-ayrı şəxsiyyətlərin adlarını çəkmişdir. Maraqlı haldır ki, Qasir ana dilində yazdığı əsərlərdə fars şairi Hafiz Şirazinin, farsca yazdığı şerlərində isə türk şairləri Füzuli və Nəvainin şeriyatına vurğunluğunu tərənnüm edir. "Qəzəllərində Füzulinin havasını görməmək mümkün deyildir. Farsca şerilərində də Hafizin təsiri vardır" [59, s.36], bununla belə Qasir Azərbaycan şerini fars şerindən, fars şairlərini türk şairlərindən fərqləndirmir.

"Mirzə İsmayıl Qasir – поэт XIX века, благотворно использовавший и продолжавший классический литературные традиции, в стихах выражал симпатию к творчеству узбекского поэта: стихи, газел и саида мне всегда приятны из слов Физули, их «Хамса» Навои» [69].

Öz ustadlarının yaradıcılığında olduğu kimi, Mirzə İsmayıl Qasir də bütün lirikasında eşq və gözəllik aşiqi, hicrandan yanan və sevgilisinin

vüsalına çatmağa can atan, onun başına dolanan və gözələ əli çatmayanda, hətta təhqir olunanda özünü həqiri-fəqir tutan bir məcnun kimi çıxış edir, gözəli ilahiləşdirməyi bacarır:

Qasira, dilbər haçan qətlimə durdu turşru,
Verməyib mən canımı canana təqsir eylədim...

Beləliklə, Qasirin lirik qəhramanı altruizm, cəfakeşlik əlamətlərini orta əsrlər şerindən qətirib yeni dövr ədəbiyyatına çıxarır, təmiz və təmənnasız məhəbbət rəmzi kimi yaşadaraq, klassik ənənəni qoruyur.

Eyni hal Qasirin farsdilli şerlərində də özünü göstərir.

کفتم که دلم هست به پیشه توکرو
دل بازده آغاز مکون قصهٔ نو
افشاند هزار دل زهر حلقهٔ زلف
کفته دل خود بجوی بردار بود

"Dedim, ürəyim sənin yanında girov qalmış, o ürəyi geri qaytar, daha heç bir nağıl söyləmə. Başını silkələdi. Saçının hər telindən min ürək töküldü. Dedi, öz qəlbini axtar götür, rədd ol".

Burada qeyd etmək yerinə düşər ki, Qasir poeziyasında orta əsrlər lirikasında gen-bol işlənmiş ümumiləşdirilmiş dini-əsatiri və ədəbi adlar sisteminin işlədilməsi ilə rastlaşırıq ki, bu da Qasir poeziyasında klassik dil-üslub ənənələrinin saxlanılmasına işarədir və yeri gəldikcə mətnşünasın karına gəlir.

Başqa bir tərəfdən, Qasirin yaradıcılığında lirik şerdə sətirarxası, əslində daha dərin mənalar verilməsi ənənəsinin izlərinə də rast gəlirik. Bu cür mənaları (Füzulidəki kimi) başa düşmək və bütün əhatəsi ilə qəbul etmək üçün oxucudan geniş məlumata və biliyə sahib olmaq tələb olunur.

Mistik təfəkkürə əsasən, güya cadugərlər kimisə və ya hansısa ruhu öz yanlarına çağırmaq üçün (ehzar etmək üçün) dua deyib, od içinə nal atırmışlar. Qasir həmin beytdə bundan istifadə edir və gözəlinin od kimi

alışıb – yanan üzünə tökülmüş zülfünü ehzar nalına bənzədib, Allahdan sevgilisinin onu ehzar etməsini arzulayır:

Tərcüməsi:

> Zülf çün həlqələnib, naldır, atəşdə yanır.
> Kaş, ya rəbb, məni o, sehrlə ehzar etsin.*

Qasir yaradıcılığında klassik ənənələrdən biri də onun nəzirə yaradıcılığında özünü göstərir. O, Nizaminin, Füzulinin, Firdovsinin, Xəyyamın, Hafizin, Sədinin, Jaminin, özbək şairlərindən Lütfinin və Əlişir Nəvainin şerlərindən ustalıqla istifadə etmiş, üslubi novatorluq kimi onlara çox maraqlı nəzirələr yazmışdır. Məsələn, XIV əsr şairi Lütfinin

> Sənsən sevərim, xox inan, xox inanma,
> Kondur ciqarim xox inan, xox inanma [61, s.99].

mətləli şerinə:

> Ey taci-sərim, xah inan, xah inanma,
> Sənsəngühərim, xahinan, xahinanma.

Həmçinin Qasirin həmin mətləli qəzəlindəki

> Nərgiz kimi çeşmindən olub teşnə qəzalun,
> Yandı cigərim, xah inan, xah ininma.

beyti istər-istəməz dahi Füzulinin

> Nərgisin fikri, Füzuli, gözəl könlündə gəzər,
> Tutar ahu vətən ol yerdə kin, otlu-suludur.

misralarını yada salır.

---

* *Tərcüməsi Mirhaşım Talışlınındır.*

Qeyd etmək lazımdır ki, Mirzə İsmayıl Qasir hələ təhsil illərində cığatay şairlərinin əsərlərini oxumuş və bu dili öyrənmişdir. Buna görə də ayrı-ayrı mənbələrdə Qasirin "Cığataysayağı" başlığı altında şerlərinin də mövcüd olduğu göstərilir, lakin təəssüf ki, şairin yazılı irsi arasında buna rast gəlmirik. Ancaq Lütfiyə yazdığı həmin nəzirə bu gümanın əsassız olmadığını göstərir.

Bütün bu klassik poeziya əlamətləri ilə yanaşı, Mirzə İsmayıl Qasir yaradıcılığının əsasən yüksək pafosluğu, həyatiliyi, dünyəviliyi xüsusi qeyd olunmalıdır. Qasirdə hətta ən çətin məqamlarda belə, nikbinlik, gələcəyə inam, vüsala ümid var. Qasir poeziyasında sufilikdən və ya hansısa bir dini təriqətçilikdən əsər-əlamət yoxdur. Obrazlı desək, Mirzə İsmayıl Qasir poeziyası ənənəvi orta əsrlər ədəbiyyatından "gülə-gülə ayrılmaqda olan" yeni Azərbaycan ədəbiyyatının aynasıdır. Qasir füzuliyanə səpgidə yazdığı lirik əsərlərində belə, dünyəvi ləzzəti, məhəbbəti tərənnüm edir, cənnətdə vəd edilən nisyə eyş-işrəti rədd edir.

Deyilənlərlə yanaşı, Mirzə İsmayı Qasirin bəzi ədəbi priyomların və mövzuların sonralar XX əsrin əvvəllərinin Azərbaycan poeziyasında ənənəviləşməsində rolu da qeyd olunmalıdır. Bu zaman ya Qasirin priyomları və mövzuları sonrakı satiriklər tərəfindən qəbul edilərək, daha da zənginləşdirilmiş, ya da Qasir öz müasirlərinin priyom və mövzularını mənimsəyərək sonrakı nəslə ötürə bilmişdir.

Belə ki, hələ 60-cı illərdən Azərbaycan ədəbiyyatşünaslığında qəzəl, mərsiyə, müxəmməs, müsəddəs və məsnəvi klassik şer formalarının satiraya ilk dəfə gətirilməsi Sabirin novatorluğu kimi qələmə verilirdi [53, s.89-96]. Qasir yaradıcılığının geniş təhlili isə göstərir ki, bu formalarda satirik şerlər yazmağın təməlini məhz o qoymuşdur və yalnız sonralar milli satiramızda həmin priyom kütləviləşib, Sabir şerində özünün zirvəsinə çatmışdır. Belə ki, Qasirin "Bahalıq", "Pul", həmçinin qadın hüquqsuzluğunun tənqidinə həsr olunmuş şerləri qəzəl, qəsidə formasındadır. Onun "Əskinas" şeri müsəddəs, "Kişilər" şeri müxəmməs formasındadır və s. Bütün bunlar, həmçinin Qasirin ayrı-ayrı mövzu və misralarının Sabirdə də işlənib məşhurlaşdırılması ehtimal etməyə inam yaradır ki; Mirzə Ələkbər Mirzə İsmayılın yaradıcılığı ilə tanış olmuş, ondan müəyyən ideya və fraqmentləri əxz etmişdir. Nümunə üçün müqayisə etmək olar:

Qasirdə:

Ah, səd ah, həzar ah, rəfiqa, səd ah!
Oldu bica yerə ömrüm bu cəhan icrə tabah...

Sabirdə:

Əfsus, qocaldım, ağacım düşdü ədimdən,
Səd heyf cavanlıq!

Qasirdə:

Bilmirəm, mən sənə, ey sahibi-himmət, nə yazım,
Eyliyim bir neçə əhvalıva diqqət, nə yazım...

Sabirdə:

Şairəm, çünkə vəzifəm budur əş'ar yazım,
Gördüyüm nikü bədi eyləyim izhar, yazım...

Bundan başqa, Mirzə İsmayıl Qasir bir pedaqoq kimi dərs vəsaiti yaradaraq Azərbaycan məktəbinin yeni tədris üsuluna keçməsi üçün bir yenilikçilik addımı atmışsa, ikinci tərəfdən, şagirdlərin fars leksikasını yaxşı mənimsəməsi üçün ənənəvi – orijinal bir mənzum lüğət yazmış və bunu farsca şərhi-halında qeyd etmişdir:

"Yüz beytlik lüğət yazdım şer ilə o zaman".

Məlum olduğu kimi, orta əsr Şərq leksikologiyasında xarici dilin daha yaxşı öyrənilməsi üçün ayrı-ayrı şairlər, yəqin ki, Qasir kimi – özlərinin dərs dedikləri mədrəsə şagirdləri üçün nəzmlə lüğət yazırdılar. Bunun iki üstünlüyü var idi: əvvəla, şagirdlər şeri daha yaxşı yadda saxlayır və beləliklə, avtomatik olaraq, əcnəbi dilin leksikasını da mənimsəmiş olurdular, ikincisi, bu yolla lüğətçilik məktəbi də zənkinləşirdi.

Beləliklə, Qasir yaradıcılığında ənənə məsələsini araşdırarkən, onun bu lüğəti haqqında danışmamaq olmur.

Müəllif lüğətini "azərbaycanca-farsca" prinsipi üzrə qurmuş və adlandırmışdır. Beləliklə, Qasirin bu əsəri Azərbaycan leksikoqrafiya tarixində ilk "terminoloji lüğət"lərdən biri hesab edilə bilər.

Lüğət başlanır: بش اسرتوم کـوی بـرپک زلف ساچ کیسو بود
هم قولاق گوش است آلین پیشنا قشا ابروبدان

Bitir: این بو آن اوستن وه نم نمم سیزامبیز
هم اولاد ایشنا بولار اینا بود ای همربنا

Göründüyü kimi, Mirzə İsmayıl Qasir şer yaradıcılığında da, müəllimlik fəaliyyətində də öz əcdadlarının qoyub getdikləri klassik ənənələrə dayaqlanmış, lakin dövrün və mühitin artıq dəyişdiyini, köhnə doqmatik stereotiplərin inkişafa mane olduğunu dərk edərək, istər bir şair kimi, istərsə də pedaqoq kimi Azərbaycan mədəniyyətinin müasirləşdirilməsi işində fəal iştirak etmişdir.

## MİRZƏ İSMAYIL QASİRİN SƏNƏTKARLIQ XÜSUSİYYƏTLƏRİ

Hər hansı bir ədəbi simanın sənətkarlıq xüsusiyyətlərindən danışmaq üçün onun təqdim etdiyi bədii qəhrəmanlar pleyadasını səciyyələndirmək, bədii söz ustasının nəsihətamiz-didaktik aforistikası ilə tanış olmaq, onun işlətdiyi bədii ifadə vasitələrini, faydalandığı qaynaqları aşkara çıxarmaq və nəhayət, dil və üslub xüsusiyyətlərini təhlil etmək lazımdır.

Mirzə İsmayıl Qasir yaradıcılığının çoxsahəli olduğunu əldə əsas tutaraq, onun təkcə lirik qəhrəmanlarının deyil, satirik qəhrəmanlarının da kim olduğu ilə maraqlanmalı, Qasir qəhrəmanlarının ümumiyyətlə Azərbaycan ədəbiyyatında mövqeyini açıqlamalı oluruq.

### QASİRİN SATİRİK QƏHRƏMANLARI

Adətən, ədəbiyyatşünaslar poeziyada "qəhrəman" anlayışı altında poeziyada lirik qəhrəmanı tanıyırlar. Kifayət qədər lirik şerlər yazmış Qasirin də lirik qəhrəmanını ön plana çəkmək olardı. Lakin o, başlıca olaraq, satirik

şair kimi məşhur olduğundan birinci növbədə satirik qəhrəmanlarına diqqət yetirməli oluruq, çünki satirik qəhrəmanları Qasir yardıcılığında da, satirik şair kimi qəbul olunmuş Mirzə Ələkbər Sabir yaradıcılığında olduğu kimi, aparıcı roldadır.

Ümumiyyətlə, müqayisə etdikdə də aydın olur ki, Qasirin satirik qəhrəmanları lirik qəhrəmanlarından sayca çoxdur. Qasir lirikasının hər bir qəhrəmanı daha çox bir-birini təkrarlayırsa, onun satirik tipləri, əksinə, daha çox cürbəcürlüyüilə, növbənövlüyü ilə fərqlənirlər. Əgər Qasir satirik olmasa idi, yəqin ki, öz yaradıcılığında yalnız klassikanı təkrarlayan "epiqonçu şairlər" dövründə bir o qədər də nəzər-diqqəti cəlb edə bilməzdi və əslində Qasirin ədiblik qüdrətinin meyarı məhz elə onun satirasıdır, satirik qəhrəmanlarıdır.

İkinci tərəfdən, Mirzə İsmayıl Qasir satiralarının, demək olar ki, hamısı ana dilində yazılmışdır. Onun farsca əsərləri böyük əksəriyyət etibarilə lirikadır. Azərbaycan dilinin tarixi inkişaf mərhələlərinə həm elmi, həm də kütləvi maraq göstərilən müasir dövrdə isə tədqiqatçı istər- istəməz anadilli ədəbiyyata daha həvəslə üz tutur: farsdilli nümunələr ancaq ədəbiyyatşünaslıq üçün cazibədar olduğu halda, anadilli şerimiz bütövlükdə milli-filoloji əhəmiyyət kəsb edir. Qasir özü də, "Fövcül-füsəha"nın başqa üzvləri də yaxşı başa düşürdülər və öz təcrübələrində də əmin olmuşdular ki, "türk dilində yazılan həcviyyatın misli və bərabəri nəinki fars lisanında, bəlkə, heç bir lisanda tapılmaz" [23,s.82]. Məhz buna görə də Mirzə İsmayıl Qasir ara-sıra fars dilində lirik şerlər yazırdısa, satirik əsərlərini yalnız ana dilində yaratmağa üstünlük verirdi. Bu gün bizim üçün də Qasirin anadilli satiralarının qəhrəmanları daha öncə maraqlıdır.

Qasirin satirik qəhrəmanları müxtəlif cür səciyyələndirilə bilər. Bu şairin satirik mövzularının rəngarəngliyi ilə bağlıdır. Belə ki, Qasir ayrı-ayrı şəxslərə yazdığı həcvlərdə və ya mənzum məktublarda, konkret hadisələrlə əlaqədar satiralarda, zəmanənin, o dövrkü Azərbaycan mühitinin, yaranmaqda olan yeni ictimai-iqtisadi münasibətlərin qamçılanmasına və ifşasına həsr olunmuş əsərlərində bir-birindən həm zahirən, həm daxilən seçilən satirik tiplər təqdim edir. Qasir öz qəhrəmanlarının "cildinə girmir", heç bir tipin dli ilə danışmır, sadəcə olaraq, kənardan bir müəllif kimi onları təqdim, təsvir edir, ələ salır, söyür – bu yolla ifşa edir və yaramaz cəhətləri qamçılayır. O ancaq üçüncü şəxsi təqdim edir ki, bu da XIX əsr satiralarının

ənənəvi məzmun strukturuna müvafiq gəlir – bu struktura ilk yeniliyi sonralar Sabir gətirir.

Qasir satiralarında əsas yer konkret olaraq öz dövrünün ayrı-ayrı şəxsiyyətlərinə məxsusdur. Şairin mənzum satirik məktubları (həcvləri) istər şəxsən tanıdığı və hətta bir müddət dostluq etdiyi adamların, istərsə də şəxsən görüşmədiyi, ancaq dövrünün məşhur şəxsiyyətlərinin ya bütövlükdə, ya da ayrı-ayrı naqis əlamətlərinin tənqidinə və ifşasına həsr olunmuşdur. Ümumiyyətlə, qeyd edək ki, Qasirin bu cür şerlərini iki qismə ayırmaq olar: onların əksəriyyəti satirik, bir neçəsi isə xəfif zarafatla yazılmış yumoristik əsərdir. Buradan da Mirzə İsmayıl Qasiri Azərbaycan poeziyasında yumoristik əsərlərin ilk yaradıcısı hesab etmək olar.

Qasir satiralarında (eləcə də yumoristik şerlərində) Molla Fəttaha, Şirvanşaha, Qafil Şirvaniyə, Mir Əhməd xana, Şirəli bəyə və b. müraciət edir, Tağıyev, Nağıyev, Hacı Hacağa kimi milyon sahiblərinin adlarını "hallandırır". "XIX əsrdən etibarən ədəbiyyatımızda yeni ədəbi forma və janrların, cərəyan və üslubların meydana gəlməsi ilə əlaqədar yeni-yeni *bədii şərtilik* (kursiv-A.R.) elementləri meydana gəlməyə başlamışdır" [15, s.11]. Belə bədii şərtilik baxımından yanaşsaq, onda Seyid Əzim Şirvani kimi şəxsiyyətin də Qasirin satirik qəhrəmanları sırasında (və əlbəttə ki, Qasiri də Seyid Əzimin satirik qəhrəmanları arasında) görmüş olarıq. Yazdığı həcvlər və mənzum məktublar Seyid Əzim Şirvani, Mirzə İsa, Mirzə Əbdüləhəd Növrəs, Ağadadaş Müniri, Məhəmmədəli bəy Məcruh kimi şəxsiyyətləri, Şirəli bəy, Nəsir bəy, Hacı Əli, Rəhim bəy, Molla Fəttah, Molla Əli, Usta Qasım kimi müasirlərini Qasir poeziyasının mənfi və ya müsbət bədii-şərti qəhrəmanlarına çevirmişdir.

Məlumdur ki, Qasir daha çox konkret əhvalat və ya hadisələrlə bağlı satirik və ya yumoristik şerlər yazmışdır. Seyid Əzim Şirvani ilə bağlı həcvinin tarixçəsi artıq geniş məşhurdur. Ömrünün ahıl çağlarında Lənkəranda incik düşmüş şair dostlarınınköməyiilə Bakıya köçür. Burada şəhərin ədəbi mühiti ilə yaxınlaşmağa çalışan Qasir "Məcməüş-şüəra"nın yığıncaqlarında iştirak etməyə başlayır. Hələ Lənkəranda olarkən özünündə Bakıdakı pul sahiblərinə "sataşmsına" baxmayaraq, buraya gələndən sonra neft sənayesinin yüksəlişi və məhz milyonçuların himayədarlığı sayəsində Bakının gün-gündən inkişaf edib çiçəklənməyə doğru getdiyini görüb, Seyid Əzim Şirvaninin Bakı şairlərini həcv etməsi xəbərini eşitdikdə bakılı şair

tanışlarının təhriki ilə ona mənzum məktub göndərmiş və həmin məktubda Bakını “guşeyi-cənnətə döndüyünü”, şəhərdə mədəniyyətin yüksəldiyini, məişətin yaxşılaşdığını öz gözləri ilə gördüyünü bildirmiş və Seyiddən öz mövqeyini dəyişməyi rica etmişdi:

Şəhrü-Bakü nə deməq, mədəni simü zəridir,
Filhəqiqət, görünür, gənci-kohərpərvəridir.
Kaş hər fənnü hünər, məşəl hər cövhəridir,
Rübi-məskunda nəziri bu yerin kəmtəridir,
Gündə zahir olu bir ayəti-sən’ət görünür…

Qasir and-amanla Seyidə Bakını tərifləyir ki,

İndi Baküdə əcəb nəqlü hekayətlər var,
Yetməz itmamə yazılmaqla rəvayətlər var.
Yaxşı övza pəsəndidə imarətlər var,
Baxısan, dayireyi-şəhrə, əlamətlər var,
Qəsri-Bilqeys məqamı Bibiheybət görünür.

Lakin Qasirin Seyid Əzimə bu ilk məktubu “nəsihətamiz tövsiyə” səciyyəsi daşıyır və Seyid Əzim burada Qasirin nə lirik, nə də satirik qəhrəmanı deyil. Görünür, məktubu alan Seyid bunu gözləmədiyindən və Qasirin “Bakı əhvalatı”na dəxli olmadığını qət etdiyindən və ya hansı başqa səbəbdənsə, ona cavab vermir. Buna dözə bilməyən Qasir “taci-səri, qibləgahi, sərdari” adlandırdığı Seyidə ikinci məktub – bu dəfə kəskin həcv yazır. Sonuncu məktubunun bir yerində Qasir həmin məktubların Bakı şairlərinin təhriki ilə yazıldığına işarə edir:

Bakı şairləri bu nüktədən olcaq hali,
Oldu əhvalları bəs mütəğəyyər, Seyyid.
İstədilər yazalar şerinə bir özgə cəvab,
Vuralar xırmanuva xişmlə azər, Seyyid.
Qoymadım, mən oların əzminə oldum mane,
Behəqi-zövqü səfa, zəmsəvü müş’ər, Seyyid.

Çox təəssüflə qeyd etməliyik ki, Qasirin Seyid Əzimə ikinci məktubunun izləri itmişdir. Belə bir məktubun isə yazıldığı Seyid Əzimin ona cavabından məlum olur. Seyid yazır:

İki məktubi-şərifin mənə vasil oldu,
Hər birindən yetişib çeşmimə bir can, Qasir…

Qasirin ikinci məktubunun məhz həcv olduğu da bəlli olur:

Təprədib özgəsini, həcvimə tqdam elədin,
Niyə oldun bizə nahəq yerə üdvan, Qasir…

Beləliklə, Seyid Əzim Qasirin ikinci (naməlum) və üçüncü məktublarının satirik qəhrəmanı yerini tutur. Üçüncü məktubunda Qasir artıq Seyid Əzimin naməsini aldığını göstəir və həm epitetlərini sadalayır, həm də onun məktubunda qoyulmuş məsələlərə cavab verir. Şerin əvvəlində Qasir Seyidin "fələki-izzətə əxtər", "fələk və kəlamı ilə təmas etsə, ali rütbə ola biləcək bir insan", "ağayi-süxənvər" olduğunu etiraf edir. Ümumiyyətlə bir-birinə hörmət edən şəxslərin hətta həcvləşməsində də bir-birini tərifləməsi halları təəccüb doğurmamalıdır. Belə hallardan şer müəlliflərinin obyektivliyə can atması, tərəf-müqabili bütövlükdə deyil,onun ayrı-ayrı xüsusiyyətlərini tənqid etməsi aşkar olur. Təsadüfi deyil ki, tədqiqatçılar Seyid Əzimin Qasirə yeganə həcvindəki "nadir kəlamlı şair", "şer ölkəsinin Süleymanı" adlandırmasını, onun təvazökarlıqla Qasirə "sən mənim hökmdarımsan, mən sənin xidmətçinəm" deməsini öz böyük müasirinin Mirzə İsmayıl Qasir şəxsiyyətinə ən yüksək qiyməti hesab edirlər.

Seyid Əzimə məktubunda Qasir Lənkəranı tərk edib getməsinin səbəblərini sadalayır və ona qarşı düşmənçilik etmiş Lənkəran şairlərinin də bunda günahkar olduğunu söyləyir:

Şüərada yox imiş qeyrətü namusü ədəb,
İtkimibir-birininənginiçeynər, Seyyid…

Seyid Əzim öz həcvində Qasirin bakılı şairlərin təsiri altına düşüb,onu tənqid etdiyini və Lənkəran kimi bir yeri qoyub,ev-eşiyini buraxıb, Bakıya

köçməsini qınayır, onun tezliklə Lənkərana qayıtmasını tövsiyə edir. Qasir Seyidə cavabında yazır:

Bakü şəhri atamın, ya babamın yurdu deyil
Ki, təssüblə deyəm cənnətə bənzər, Seyyid.
Leyk insaf məqamında bəsi dayirdir,
Olmaz aləmdə belə xüttəvü bəndər, Seyyid…

Beləliklə, şair Bakıya nisbətdə insaflı olmağı və "Bakı əhlinə hamı xər" yazmamağı məsləhət görür. Bununla yanaşı, Qasir bu şerində Seyid Əzim Şirvaniyə qarşı öz dostluq hisslərini də açıqlayır və ona yazdığı həcvin ürək dostluğuna heç bir dəxli olmadığını boynuna alır:

Seyyida, qəlbdə hər kim sənə düşmən olsa,
Düşmən olsun o kəsə saqiyi-kövsər, Seyyid.

Beləliklə, Qasirin Seyid Əzimə əlimizdə olan məktubunda Seyid Əzimin əsasən Bakıya və bakılı şairlərə olan münasibəti pislənmiş olsa da, Seyid Əzim burada bütövlükdə satirik tip səviyyəsinə qaldırılmır (və ya bu səviyyəyə qədər alçaldılmır). Halbuki Qasir Qafil Şirvaniyə yazdığı həcvdə Seyid Əzim Şirvanini ən mənfi tip kimi səciyyələndirir və hətta dolayısı ilə Qafillə yanaşı Seyidi də təhqir edir.Şerin məzmunundan məlum olur ki, Qasir Seyid Əzimə ilk iki məktubunu yazandan sonra Qafil Şirvani öz həmyerlisi və dostu Seyidi müdafiə etmək üçün Qasirə tənə dolu məktub göndərmişdir. Görünür, Seyid ağsaqqal Qasirə müəyyən vaxt həcv-cavab yazmaq istəməmiş, onun dostları bu işi öz üzərlərinə götürmüşlər. Lakin Seyid Əzim Şirvani kimi daha məşhur bir "novcəvan" şəxsiyyətin ona şer yazmasını səbirsizliklə gözləyən Qasir Qafil Şirvaninin ortaya düşməsindən hirslənmiş, "Qafili Seyidə, Seyidi Qafilə qataraq" hər ikisini həcvlə damğalamışdır.Artıq bu həcvdə Seyid satirik tipdir:

Guyiya Seyyid Əzimə eybi yazmaq eybidir,
Onda var sadatlığından çox şəmail, bihəya!
Biz nə bürhanla ona övladi-peyğəmbər deyək,
Mürtəzadan onda var hansı xəsail, bihəya?!

Ləğvi söylər, xümr içər, ruzə yeyər, qılmaz namaz
Nəqqidən iğmaz edüb, eylər təcahül, bihəya!
Siz məgər Seyyid bilib, görcək edərsiz e'tiqad,
Olsa hər bir kimsənin qurşağı yaşıl, bihəya!

Göstərilən həcvin əsas satirik obrazı Qafil Şirvani özü olsa da, Qasir burada onunla birgə Seyid Əzimdən başqa, ona Şamaxıdan şer göndərmiş Bixud və Məzlum təxəllüslü şairləri də açıq-aşkar təhqir edir:

EyolanŞirvanaraməşhurQafilbihəya,
Həqqiinkareyliyənməl'unucahilbihəya!..
QəflətindənəhIi-qəflətQafilolmazmütləqa,
BixudolBixudkimigah-gahayıl, bihəya!..
Mərhəba, Məzlumabax, elmöyrənib, şair çıxıb,
Olmuşimişbuneçəmüddətdəfazilbihəya!..
AdınıMəzlumqoymuş, leykçoxzalimdürür,
Həcvəyetərsibqətedibhardanbukahil bihəya!..

Beləliklə, şerin əsəbi tonundan duyulur ki, Qasir Seyidə yazdığı məktubların cavabını Seyiddən gözləmiş, Qafil, Məzlum, Bixud təxəllüslü "iqtidarsız" Şirvan şairlərinin məsələyə müdaxilə etməsindən narazı qalaraq, Seyid Əzim qarışıq onların hamısını çox kəskin satira atəşinə tutmuşdur.

Şairin konkret hadisələrlə bağlı satirik əsərlər yazması onun özünün əlyazmalarda etdiyi kiçicik qeydlərdən də aydın olur. Məsələn,bir dəfə Bakıda Münirinin mənzilindəki şer məclisində şirvanlı bir şair öyünərək özünü Şirvanşahi adlandırmış və bu, Qasirin xoşuna gəlməmşdi. Həmin əslində zəif şairi həcv edən Qasir şerinin əvvəlində farsca göstərir ki: "Bakıda əhli-ürfanlardan Ağadadaş bəyin otağında Şirvan əhlindən bizimlə müsahib olan bir qoca özünü Şirvanşahi adlandırdı. Zərafət və dostların vaxtının xoş keçməsi cəhətincə müşar əleyhlə şerləşdik. Buraya yazılan bu dörd parça o cümlədəndir" [24, s.57].

Qasir burada yekəxanalıq edib, özünü bir belə cah-cəlallı təxəllüsə layiq görmüş şairin lovğalığını ələ salır:

Nə ki bir qeyrisi adını qoyub Şirvanşah,
Götürüb bir təbəqə kağıza Şahnamə yazıb…

Məlum olur ki, əslində bu, aşağı savada malik, “əfsanəsüxən” yazanın biri imiş:

Sözləri ləng tamamən hamısı ləğv cəfəng,
Bilmirəm kimdi bu,hardan gəlib əyyamə, yazıb…
Gözü görmüb, yazıb imla ilə inşani qələt,
Görəsən ya ki yazanda düşüb axşamə,yazıb…

Burada Mirzə İsmayıl Qasirin savadsızlığa, kəmsavadlığa və buradan meydana gələn təkəbbür və lovğalıq kimi naqis hərəkətlərə münasibəti özünü büruzə verir, şairi və pedaqoqu belə səciyyələrə nifrət edən bir insan kimi gözümüz önündə canlandırır.

Qasirin “Fövcül-füsəha” şairlərindən olmuş Molla Fəttaha aid həcvləri də konkret bir əhvalatla bağlıdır.Şair şerlərindən birində göstərir ki, Molla Fəttah onun “pulunu yemişdir” və bu Qasirə o qədər təsir edir ki, hətta başqalarını söyüb həcv etdiyi şerlərində belə, birdən-birə Molla Fəttahı yada salıb, satirik qəhrəmanını ona bənzədir:

Sənə nifrin edir, pulun yemisən,
Qüdə Seyyid qalıb lütan, molla…
Molla Fəttahi tanır hər kimi dindirsən əgər,
Neçə illərdi lotu hər ili bir rəngə düşüb…
Molla Fəttah məni aldatdı qamışdan ötrü,
İki-üç ildə onunla işimiz cəngə düşüb…
Molla Fəttahı tapın, Camuşaban kəndi ara,
Neçə müddətdi salıb özünü anbarə birə…

“Fövcül –füsəha” üzvlərindən Şirəli bəyə yazdığı yumorisik bir şeri də konkret hadisə ilə bağlıdır. Burada bir qumar məclisi təsvir olunur. Qasir, Şirəli bəyin dəvəti ilə Nəsir bəyin evinə “qonaqlığa” gedib çıxıbmış. Sonra məlum olur ki, burada qonaqlıq deyil, bəylər yığışıb qumar oynayırmış. Qərəz, məclis qızışır, səhərəcən bəylər oynayır, Qasir acqarına oturub qalır.

Ona getməyə icazə vermirlər. Özü isə “indicə yemək gələcək” ümidi ilə təsəlli tapır: sübhədək nə yemək, nə içmək gəlir.

Həmin şerində Qasir çox orijinal bir üsula əl atmış, gözəl bir səhnə yaratmışdır. Qasirin təsvir etdiyi bu səhnəni ölməz Üzeyir bəyin “O olmasın, bu olsun” komediyasındakı məşhur qonaqlıq səhnəsi ilə müqayisə etmək olar:

Qasir, birisi Şirəli bəy, Hacı Əli, Rəhim bəy,
Mirbağır xau, Mir Musa xan, Kəbəlayi Əsədulla,
Ağahacı Əli, Mirzə İbadulla bəy, ev sahibi Nəsir bəy
və başqaları, cəmi on dörd nəfər.
Çay olub sərf ki, insafən əcayib çay idi…

Sonra “ortalığa ehsan gəlməsini” gözləyən Qasirin gözləri nigaran qalır:

Diksinirdim açılanda qapı, mən biçarə,
Eylə bildim gətirir əlsuyu guya Qurban…

“Toxun acdan xəbəri olmazmış”. Ac olduğu üçün durub getmək istəyən Qasiri ev sahibi, “eyib” sayıb, qoymur ki, “məclisi” tərk eləsin:

Əlqərəz, bu gecə üç dəstə olubdur həzərat,
Çəkib asnası, töküb pulu, qızışdı meydan…
Qızışıb xəlq qumarə gecə keçdi yarıdan,
Az qalıb sübh ola, çəkdi xoruzlar hamı ban…

Bu səhnədə Lənkəran və ümumiyyətlə Azərbaycan varlılarının eyş-işrət və qumar məclisləri ilk dəfə kənar, “ac” adamın gözləri ilə təsvir olunur və bütövlükdə Azərbaycan poeziyası tarixində ilk dəfə bu qədər çox surətin iştirak etdiyi mənzərə təqdim olunur. Qasirdən başqa (Sabirə qədər) heç bir şair eyni bir otaqda bu qədər şəxsin cəmlənməsini və bundan irəli gələn səhnəni canlandırmamışdır. Qasir burada bir məclisin kiçicik ssenarisini yazmağa, hər kəsin rolunu və hərəkətlərini aydın təsvir etməyə müvəffəq olmuşdur. Lakin, görünür, həm hər gün durub-oturduğu tanışları olduğu

üçün, həm də hər halda Lənkəranda mötəbər varlılardan olduqları üçün Qasir onları satira atəşinə tutmağa cürət etməmiş, sadəcə olaraq, emosiyasız yanaşaraq, maraqlı bir yumoristik şer yaratmışdır. Qasir yalnız bir yerdə "bir verməzdi o məclisdə bir abbası şətəl" deyə, acından gözü qaralan bir adamın mızıltısı ilə şikayətlənir, ancaq şerin sonunda ona zülm etdikləri üçün bəylərdən cərimə haqqı istəyir:

Pəs gərək oynayan əşxas cərimə çəkələr,
Hərəsi bircə manat, olmaya hərgiz nöqsan.

Beləliklə, şairin özü qarışıq obrazlar sistemi yaradılır ki, bu da milli ədəbiyyatımızda diqqəti çəkən yenilik sayılmalıdır.

Qasirin satirik qəhrəmanlarının bir hissəsini də konkret şəxslər deyil, ümumiyyətlə, mollalar, saysızhesabsız mal-dövlət sahibləri, bahalıq yaradan tacirlər, cəhalətpərəst qüvvələr, alayarımçıq şairlər, şəhər qazıları, ona "babi" adı verən "kişilər" və b. təşkil edirlər.

Qasir öz şerlərindən bəzilərində hər şeyi açıq yazmır, alleqoriya ünsürlərindən istifadə edir. Misal üçün, ilk baxışda yumoristik şer təsiri bağışlayan "Birə" satirasında həqiqətdə öz şəxsi düşmənlərinin səciyyəsini verir:

Ey haramzadeyi-bədfel, üzü qarə birə,
Bədkəhər, xuni-siyah, zülmilə xunxarə birə!
Mar ilə əqrəbi dəf eyləməyə vardır əlac,
Hərçi tədbir edirəm, yoxdu sizə çarə, birə!..
De görüm, mənlə nədir bir belə şəxsiqərəzün,
Nə edibdir sizə bu Qasiri-biçarə, birə?!

Bu şerin ruhu və müraciət forması şairin "kişilərə" müraciətdə dediyi

Lənkəranda görəsən mən kimə naxoş demişəm,
Ya kimin kasəsinə, kisəsinə boş demişəm?!

misralarını bir daha yada salır. Burada satirik qəhrəman sadəcə dırnağın ucu ilə əziləcək birə deyil, əslində vaxtı gələndə "hər biri əqrəbü şahmarə dönən", üzdə özünü dostgöstərib, arxada Qasirə düşmən olanlardır.

Kapitalist münasibətlərinin yavaş-yavaş Azərbaycana yol tapması burada yüzillər boyu təşəkkül tapmış ictimai münasibətləri aradan çıxarmağa və varlı ilə yoxsul arasında ziddiyyətli uçurumun peyda olmasına təkan vermişdi. Belə bir vəziyyətdə Qasir də pul yığmaq ehtirasına mübtəla olmuş, lakin camaatı yaddan çıxarmış dünənki bəyləri, dövlət adamlarını tənqid edir, onları rəiyyətin də halına yanmağa dəvət edir:

Dövlət əhli özünə cəm qılıb rahi-məaş,
Tökülüb kasibi-biçarələrin başına daş…
Dövlət əhli, girəvə vəqtidi, dövlət qazanır,
Molla biçarə zəkat istəsə, töhmət qazanır…
Bu təəccübdü ki, bir dəstə gəlibdir əmələ,
Hacı filan, filan nəstə gəlibdir əmələ…

Qasir yaradıcılığında pula və kapitala münasibətin formalaşmasmı onun satiralarının cansız qəhrəmanlarından birini də pulda axtarmağa sövq edir.

## QASİRİN LİRİK QƏHRƏMANLARI

"Bizim klassik poeziyamızda bir qayda olaraq həmişə mütəfəkkir, bir aşiq kimi danışmışdır" [12, s.98]. Buna görə də hər hansı klassik şairin təfəkkür dünyasını araşdırmaq üçün onun aşiqanə lirik poeziyasını araşdırmaq vacibdir. Lirik poeziyanın əsasında isə lirik qəhrəman durur.

Qasir lirikasında və həmçinin lirik qəhrəmanının timsalında orta əsrlər Azərbaycan lirikası ənənələrinin davamı özünü bariz göstərsə də, digər tərəfdən, bu lirikada və qəhrəmanların səciyyəsində biz X1X əsrin ictimai-siyasi mühitindən irəli gələn bir sıra məziyyətləri də tapmış oluruq.

"XV11-XV111 əsrlərdə olduğu kimi, X1X əsrdə də dünyəvi şerlərlə yanaşı, dini şerlər: növhə, sinəzən, Kərbəla hadisələrinə aid mənzum epopeya, mərsiyə, fərd və s. romantik-lirik şerlər yazılmaqda idi. Dövrün və islam dininin təsirindən irəli gələn bu ziddiyyətli [? - A.R.] cəhətə, demək

olar ki, X1X əsr şairlərinin hamısının yaradıcılığında az da olsa təsadüf olunur" [46, s.49]. Qasir isə bu barədə istisna təşkil edir. Onun bizə gəlib çıxmış ədəbi irsi içərisində nəinki forma və məzmununa görə başdan-başa dini sayıla biləcək şeirə, heç sırf dini misraya belə rast gəlmirik. Bu fakt Mirzə İsmayıl Qasirin tamamilə dünyəvi şair olduğunu və onun realizmini sübut edir.

Beləliklə, Qasir poeziyasının müasirlik səviyyəsini xüsusi qeyd etməli oluruq.

Qasir lirikasını X1X əsrin epiqonçu lirikasından köklü şəkildə fərqləndirən əlamət onun məhz dünyəviliyidir. Təbiidir ki, Füzuli, Hafiz, Nəvai kimi sələflərinin poetik təsiri onun da yaradıcılığında öz izini buraxmışdır. Qasir lirikası yüzillər ərzində səbatlaşmış klassik ənənələrdən yan keçə bilməzdi. Lakin Füzuli və onun məktəbində həmişə ilahiyə məhəbbət motivləri axtarılıb tapıldığı halda, Qasirin əsərlərində belə bir şey yoxdur: Qasir Füzulidən yalnız şeiriyyatı, lirik ricətləri, söz sənətkarlığını əxz etmişdir. Qasir lirikasında “Kərbəla zülmü” axtarmaq əbəsdir. Onun şerinin ənənəviliyini təmin edən formallıqları nəzərdə tutsaq, Qasir Füzuli məktəbinin davamçılarından sayıla bilər, məzmun cəhətindən isə Qasir lirikasının Füzuli məktəbinə heç bir dəxli yoxdur və bu həmin lirikanın XIX əsr üçün tamamilə yeni bir mahiyyət kəsb etdiyinə işarədir.

Qasir lirikasının həmişəki kimi üç qəhrəmanı var: aşiq-məşuqə-əğyar. Şerlərində dil açan aşiqdir. Aşiq qəhrəmanın poetik ixtilatı onun özünün dünyagörüşlərini, ətrafındakılara, birinci növbədə sevgilisinə və əğyara münasibətlərini, humanizmini aşkarlayır, aparıcı qəhrəmanı səciyyələndirir və eyni zamanda həmin triadanın yaratdığı üçbucağın yuxarı küncündə, əlçatmaz bir nöqtədə məşuqəni, iki aşağı künclərdə isə özü ilə rəqibini yerləşdirdiyini açıqlayır. Bu iki alt küncdəki qəhrəmanlar arasında aşiqin cəfakeşliyit, məşuqə uğrunda zülmə qatlaşmaq həvəsi üzə çıxır. Əğyarda bu keyfiyyətlər yoxdur deyə, o, poetik alçaldılır, sayılmazlıq səviyyəsinə endirilir, lirik mənfiləşdirilir:

Hər laf vuran kimsənə aşiq ola bilməz,
Aşiq odu kim, can verə meydan arasında.

Eynilə Füzuli kimi, Qasirin qəhrəmanı da “aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var” deyə bilər və bəlli olur ki,belə aşiqlik özü də incə bir sənətdir, məharətdir, istedaddır – hər kimsənədə bu qabiliyyət yoxdur. Qasir bir cinayət işlədib günahkar olmaq, yarın çənəsindəki çuxurda məhbus olmaq arzusundadır:

Ey kaş ola bu Qasiri-biçarə müqəssir,
Məhbus ola ol çahi-zənəxdan arasında.

Bu cür təmənnasız cəfakeşlik, məşuqəsi uğrunda meydanda can verməyə hazır olması Qasirin lirik qəhrəmanının yerləşdiyi bucağı bir qədər yuxarı qaldırır və həndəsi fiqurun forması dəyişir: əğyarın küncü aşağıda qalır, beləliklə, aşiq öz yarının zirvəsinə daha yaxın bir nöqtəyə çəkilib, kor bucaqda dayanır:

Ey kaş ola cananımın canına bu canım fəda,
Ya rəbb, bu canan haqqına eylə duamı müstəcab

deyən aşiqin üçlük içində belə mövqeyə çıxması üçün mənəvi haqqı var. Əğyarın isə əsl yeri məhz aşağı iti bucaqdır:

Dilbər, məni yandırdı bu nakəs rəqibin tənəsi,
Bir bərqəi çək, ruyidan düşsün işıqdan afitab.

Çünki onun cəfakeş aşiqlik istedadı olmadığı halda, məzlumluq etmək arzusunda olan aşiqə hələ bir tənə də edir. Ey yar, ona hirslən və çöhrəndən elə bir ildırım çək ki, işığından günəş də sönsün.

Bu məzmunda şerlərində Qasir klassik, lakin dünyəvi məzmunlu bədii ifadələr sistemindən istfadə edir və bu onun romantik cəfakeş qəhrəmanını real həyata daha artıq bağlayır, aşiqi real insan obrazı kimi təqdim edir.

Qasirin lirik şerlərini qəhrəmanların bir-birinə münasibəti baxımından iki hissəyə bölmək olar: şerlərin bir qismində aşiq şair əlçatmaz bir gözəlin oduna yanır, lakin məşuqənin aşiqin sevgisindən xəbəri yoxdur. O, gözəli vəsf edir, Azərbaycan gözəlinin oduna yanıb yaxılır və bundan daha artıq bir eşq zülmü çəkməyi arzulayır. Saf tərənnümünə həsr olunmuş bu cür

şerlərində şair öz sevgilisinə müraciət edir, rəqibi ilə özünü müqşayisə edir, lakin burada gözəlin aşiqə münasibəti bəlli deyil. Belə məqamlarda əsas qəhrəman aşiqdir, məşuqə yalnız onun dili ilə təsvir edilir. Əğyar isə həmişə pislənilən, sayılmayan qüvvədir, lakin aşiqlə gözəlin münasibətləri aşkarlanmadığından dediyimiz üçbucaqda aşiq də, onun rəqibi – epizodik obraz da eyni dərəcəli bucaqlarda dayanırlar. Gözəlin onlara reaksiyası neytraldır. Belə halda isə aşiqə yalnız öz məhəbbətini izhar etmək və məftunəsini vəsf etmək, oxşamaq qalır:

İçdim məhəbbət badəsin, düşdüm bəla girdabına,
Ya rəbb, məni bu qüssədən eylə xilas, oldum xərab…
Xəcalətdən bənövşə baş aşağa rusiyah olmuş,
Baxıbdır gülşəni-hüsnündəki müşkin xəttü-xalə…
Görə hər kəs cəmalın mahi-aləmtabə meyl etməz,
Ləbin müştaqi hərgiz bu cahanda ayə meyl etməz…

Bununla belə, şerlərinin çoxunda gözəlin aşiqə (etinasız) münasibəti bəllidir və bu vəziyyət Qasirin qəhrəmanını pərvanə tək məhəbbət oduna yanmağa, sevgilisinin onu özündən uzaq tutmasının səbəblərini əğyarda axtarmağa sövq edir. Sevdiyi nazənin tərəfindən ovudulmayan şairin qəlbinə qaranlıq çökür. Təbiətin oyandığı bahar gəlsə də, bu fəsil həsrətli yar gözlərindən axan yağışlarla keçir:

Hər dəm fəraqi-yardan, ya rəbb, bu həsrət gözlərim,
Guya bahar əyyamıdır, ağlar fəğan ilə səhab.

Qasir qəhrəmanının qəlbində lirik qısqanclıq hissləri baş qaldırsa da, o, sevgilisindən küsmür, incimir, onu vəfasızlıqda günahlandırmır, əğyarı kobudluqla tənələmir və özünə güclü rəqib kimi təqdim etmir. Aşiq sadəcə olaraq bütün günahların əğyarda olduğunu öz sevgilisinə başa salmaq, özünü ona sevdirmək istəyir:

Əğyarlar sözünə baxıb çıxma rahidən,
Gər doğru yarsan, belə küftarə tab eylə…

Ümumiyyətlə, Qasir şerlərinin ruhunda küsgünlük, yarı vəfasız təqdim etmə motivlərinin olmaması onun lirik qəhrəmanını tamamilə yeni aspektdə səciyyələndirir. Hətta XIX əsr Azərbaycan nəsrinə də yol tapmış faciəvilik, bəzən tərki-dünyalıq Qasir lirikasından kənardır.

Akad. M.C.Cəfərov göstərirdi: "Məhəbbətin dili ilə böyük həqiqətlərin şərh edilməsi nadir və təəccüblü bir hadisə deyildir. Biz buna bütün xalqlarda rast gəlirik. Fəqət, nədənsə, yüksək məfkurələrin aşiq dili ilə şərhi, ümumiyyətlə, Şərq və xüsusən Azərbaycan üçün daha çox səciyyəvi bir hal olmuşdur" [12, s.98]. Həqiqətən də yüzillər ərzində Azərbaycan poeziyasında qoca Şərqin bütün müdrik dini və etik-fəlsəfi baxışları cəmlənmişdir və müəyyən dini-fəlsəfi hazırlığı olmayan müasir oxucunun həmin poeziyanı tam başa düşmək və mənimsəmək imkanları aşağıdır. Qasir poeziyası və Qasir qəhrəmanları isə artıq yeni ədəbiyyatın məhsulu kimi tamamilə yeni ideyaları və yeni dünyagörüşlərini əks elətdirir. Qasir öz poeziyasının dili ilə yeni həqiqətləri açıqlayır. Onun qəhrəmanı hətta sevgisi nakam qaldıqda belə, ruhdan düşmür, məşuqəsinin vüsalına çatmaq ümidi ilə yaşayır:

Yoxdur hərası zərrəcən, aləm hamı düşmən ola,
Vardır ümidi Qasirin hər dücahanda Heydərə…

Qasirin tərki-dünyalıq hisslərinə qapılmaqla, həyatdan ayrılıb zahidlik azarına mübtəla olmağa həfəsi yoxdur:

Qoygilən bir guşeyi-meyxanədə rahət olum,
Bu qədər incitmə sən, ey şuxi-bipərva məni…

Beləliklə, şair öz qəhrəmanının dili ilə insanları yüzillər nəticəsində təşəkkül tapmış stereotipik xülyalar dünyasından əl çəkməyə, qəflətə uymamağa və cənnəti də, eşqi-məhəbbəti də yalnız bu dünyada axtarmağa çağırır. Qasir bir ziyalı kimi başa düşürdü ki, XIX əsr daha orta əsrlər deyildir və bu əsrin şimallı ağaları azərbaycanlının ənənəvi "alın yazısı" və gerçək həyatın eybəcərliklərinə boyun əyib tərki-dünyalığa uyuma ideyalarından istifadə edə bilər və məhz buna ümid bəsləyir. Odur ki, Qasir də öz poeziyasının lirik dili ilə insanların "qılığına girir" və onlara yeni fikirlər, yeni dünya duyumları aşılamağa can atırdı: "Məhəbbətin dili ilə"

xalqa çatdırmaq istədiyi “böyük həqiqətləri” də məhz bunda görmək lazımdır.

İstər satirik şerləri, istərsə də lirika yaradıcılığı ilə Azərbaycan ədəbiyyatına gətirmək istədiyi və müəyyən qədər məqsədinə nail olduğu bu yeniliklər Mirzə İsmayıl Qasiri XIX əsr ictimai fikrinin ən bariz daşıyıcılarından biri hesab etməyə haqq verir. Həqiqətən də, Azərbaycana da neft sənayesi vasitəsi ilə sirayət etməkdə olan kapitalist münasibətləri əsrində artıq gül-bülbül, Leyli-Məcnun poeziyasının vaxtı keçməkdə idi. Ənənəvi poeziyadan irəli gələn köhnə ideyaların təlqin edilməsi xalq kütlələrini yeni zamanlar içində kor qoymağa bərabər idi. Lakin, digər tərəfdən, poeziyada klassik ənənələr məhdud dairədə də olsa, davam etdirilməsə idi, bu Qasir şerlərini X1X əsr oxucusunun gözündən sala bilərdi. Bunu bütün dolğunluğu ilə dərk edən şair öz qəhrəmanını Məcnunsifət (diqqət edək ki, hər cəhətdən Məcnun yox, yalnız Məcnunsifət). “Məcnun kimi”, Vamiqü Əzra, Fərhad (digər tərəfdən, Fərhad qoçaqlıq rəmzidir), hətta Rüstəm simasında təqdim edir:

Olmuşam Məcnunsifət, bir Leylinin avarəsi,  
Qalmışam tənha biyabandə, təni-üryanə bax!..  
Qasiri-biçarəni saldın səməndər tək oda,  
Səhlidir bu, eyləyibsənVamiqü Əzra məni…  
Gəradım Qasiridi, leyk hərifim yox idi,  
Dilimin xəncəri dəstimdə qəvi Rüstəm idim…

Şair öz qəhrəmanının dili ilə, nəhayət ki, məcnunluğunun, fərhadlığının, vamiqü əzralığının sirrini açır və etiraf edir:

Mənim ki yoxdu başımda cünunluq asarı,  
Qərəz o Leylini görməkliyin bəhanəsidir.

Bu misralar Mirzə İsmayıl Qasir lirikasının həyat gerçəkliklərinə gətirib çıxardığını, onun qəhrəmanının real insan olduğunu və bu insanın başqalarını da təmiz eşqə, humanizmə dəvət etdiyini, lakin behişti yalnız bu həyatda yaşayan gözəlin üzündə axtarmağın vacib olduğunu öyrətdiyini

görürük. Buna görə də Qasirin lirik qəhrəmanı adidir, həyatidir, şair özü isə başdan-başa realist sənətkardır.

Şerlərinin ikinci lirik qəhrəmanı kimi gözəl zirvədə dayanır. O bəzən sadəcə olaraq vəsf olunur, bəzən hərəkətə gəlir, lakin hər iki halda əsas qəhrəman üçün əlçatmazdır; Qasirin bütün lirik hissləri onun ətrafında cərəyan edir:

Mənada ona cilvə edib eşqi-Züleyxa,
Qoydu neçə il Yusifi zindan arasında…

Qasirin gözəli onun ağlını-huşunu əlindən almış, indi can almaq həvəsindədir:

Əqlü huşi əldən almış, indi can fikrindədir,
Sən nə söylərsən, könül, dildarının bu fikrinə?..

Qasir şerində gözəlin vəsfi də, onun yara münasibəti də klassik poeziyada olduğundan heç nə ilə fərqlənmir. Bununla belə, aşiqin ona münasibətində yeni motiv özünü göstərir. Leylini vəfasızlıqda günahlandıran Məcnundan fərqli olaraq, Qasirin aşiq qəhrəmanı həmişə öz nigarına xoşbəxtlik arzulayır:

Nigara, dövləti-hökmün çiyad olsun, rəvan olsun,
Həmişə xatirin bəxtində şad olsun, cəvan olsun…

Düzdür, Qasir rəqibi həmişə mənəvi zənginlik cəhətindən, aşiqlik bacarığı nəzərindən özündən aşağı tutur, lakin məftunu olduğu gözəlin əğyara meyl etdiyini görəndə bunun səbəbini yalnız özündən soruşur:

Nədir, ya rəbb, səbəb – dilbər məni daim qılıb məhzun,
Rəqibin naz birlə xatirin peysətə şad eylər?

Lakin öz eşq qibləgahını qınamağa, onu tənələməyə artıq dili gəlmir və çox lirik bir həzinliklə öz bəxtini və taleyini günahlandırır:

Qasir, bu qədri etmə şikayət nigardan,
Öz taleyim, yəqin elə, bəd vurdu falımı…

Gözəli poetik ilahiləşdirməyə qədər gəlib çatan Qasir öz əlçatmazına müraciətlə

Görəndə qamətin yansam, mənə eyb etmə, adətdir,
Görəndə şəmi-şövqindən yanar pərvanə, dildarım! –

deyir və bu yolla onu özünün əğyara münasibətindən ayırır.

Qasir şerlərində üçüncü – epizodik surət əğyardır. Lakin əğyar adı altında burada həm aşiqin rəqibi, həm də onu qınamaq meyli olan başqaları nəzərdə tutulur. Rəqib digər əğyara nisbətən lirik səhnədə bir neçə addım irəlidə durur və aşiqlə məşuqəsinin münasibətlərinə müdaxilə edir, onları bir-birindən uzaqlaşdıran mənfi qüvvə kimi çıxış edir:

Rəqibi-bihəyaya söylə bizdən çəksin əl, bilsin,
Xəndəki-ahımızda var şərər, xünxarsız olmaz…
Səni məndə görübdür həmnişin əğyari-bədgirdar,
Məazalah, yenə ortalığa büğzü həsəd düşdü…

## MİRZƏ İSMAYIL QASİRİN DİL VƏ ÜSLUB XÜSUSİYYƏTLƏRİ

Qasirin mühəssənatından söz açarkən əvvəlcə şerlərinin linqvistik araşdırılmasını, onun leksik və qrammatik tərkibinin işıqlandırılmasını həyata keçirməliyik.

Mirzə İsmayıl Qasir anadilli ədəbiyyatımızın inkişafında özünəməxsus mühüm xidmətləri olan şairdir. Azərbaycan dilində qələmə aldığı şerlərinin çoxluğu, bir tərəfdən, onun vətənpərvərlik mövqeyi ilə bağlıdırsa, ikinci tərəfdən, bu, Qasirin anadilli şerimizin yenidən qurulması, ana dilimizin müqəddəratının ön plana çəkilməsi istəklərini əks etdirir.

Mirzə İsmayıl Qasirin lirikasının dili klassik ənənə- lərə daha yaxındır. Burada şair Azərbaycan dilinin, geniş imkanlarından bəhrələnməklə yanaşı, qəzəlçilikdə geniş mövqeyə malik ərəb və fars izafətlərindən də istifadə etmişdir. Satirik şerlərinin dili isə XIX əsr Azəraycan xalq dili materialları üzərində qurulmuşdur və ərəb-fars təsirindən daha çox azaddır. Bütövlükdə götürdükdə isə, "aşiqa, gəl bir nəzər eylə bu türki şerimə" deyən Qasir yaradıcılığında dövrünün şer sənətkarlığına şamil edilən bütün dil xüsusiyyətləri özünü göstərir.

Qasirin şerləri rəvan və əsl axıcı poetik bir dillə qələmə alınmışdır. Bütün ömrü boyu xalq arasında yaşayıb yaratmış və bir sıra sələfləri kimi xan saraylarına və ya hansısa aristokratik təbəqə ətrafına çəkilib el-obadan ayrılmamış Qasir öz yaradıcılığını da xalq dili əsasında qurmuş, xalq ədəbiyyatından gen-bol faydalanmışdır. Onun əsərlərinin ərəb-fars leksik qatı da əslində yalnız bugünkü oxucular üçün qəliz sayıla bilər: XIX əsrdə az-çox təhsil görmüş şer-sənət həvəskarları Qasirin bütün kəlmələrini, işlətdiyi izafət tərkiblərini asanlıqla başa düşürdülər. Yada salaq ki, bu tərkiblər ana dilimizdən əsasən XX əsrin birinci onilliklərində (bir küll halında isə purizm dövründə) çıxarılmış, lakin Vahid kimi klassik qəzəl ustalarının dilində hələ uzun müddət işlənmişdir və hətta bu gün də qəzəlxanlar həmin izafətlər sistemi olmadan keçinə bilmirlər. Deməli, XIX əsr şairinin dilində ərəb və fars birləşmələrinin işlənməsi hələ onun dilinin "nöqsanı" hesab edilə bilməz. Qasirin müasirləri onun

Fərağında gözümdən çeşmələr oldu rəvan sənsiz
Əyildi qamətim, ey sərv qədd, oldu kəman sənsiz…
Vermişdi vəsl və'dəsi, çün yar gəlmədi,
Çox çəkdim intizarı, o dildar gəlmədi…
Bugün kuçə ara nagah keçirdim, yarımı gördüm,
Məni yüz min bəlayə tuş edən dildarımı gördüm

misralarını necə başa düşüb əzbərləyirdilərsə,

Əla, ey mahrüxsarım, olan bu dəhridə mümtaz,
O zülfi-ənbərafşanın edib can almağa ağaz…
Rişteyi-zülfün olub xəm-xəm, əcəb zəncirdir,

Qaşların tiği-bəla, çeşmin nə pür tədbirdir?..
Gəldi göftarə məni-zarilə, gördüm dəhənin,
Deyəsən, həqqeyi-yaqut dolu lö'lödür

sözlərini də həmin cür əxz edirdilər.

Beləliklə, Qasir poeziyasında ana dili materialı ilə yanaşı, o dövr üçün dilimizdə bədii ədəbiyyatda geniş işlək olan ərəb və fars söz birləşmələri çox işlədilmiş, lakin bunlar bir-birindən təcrid olunmamış, əksinə, bir-birini tamamlayaraq bir küll halında söz-məzmun vəhdətinin təşkilinə cəlb olunmuşdur. Qasirin dili XIX əsr Azərbaycan dilinin bədii üslubunu özündə dolğun əks etdirir.

Rus sözlərinin XIX əsr Azərbaycan dilində görünməyə başlaması Mirzə İsmayıl Qasirin satiralarında da təsdiqlənir. Ancaq buruda rus sözləri o qədər azdır ki, onların Qasir satirasında mövqeyi barəsində geniş danışmmağa dəyməz. Şair istər məişət əşyalarının adları, istərsə də çar üsul-idarəsi ilə bağlı alınmaları götürərək, ana dili mövqeyindən assimilyasiya olunmuş şəkildə, azərbaycanlı tələffüzündə işlədir:

Hər istəkaniçay ilə ləbrizü ləbaləb,
Hər ləhzə edibdir peyapey dəmadəm…

Burada "peyapey" farsca "dalbadal" mənasını versə də, Qasir ondan kalambur yaratmaq və rusca "pey ha, pey", yəni "içhaiç" mənasını əxz etmək üçün istifadə etmişdir.

Bir yanda yetib güşəmizə cüşü səmavər…
Birisi Mehdi Hüseynqulu, biri Məmmədağa,
Hər ikisi deputat, biri çinin, biri çinan…
Çəkib asnası, töküb pulu, qızışdı meydan…
Çün sudyə onu Lənkərana eylədi azım,
Qalsın qazamatda bir-iki ay da mülazım…

Qasir Lənkəranda yaşayan erməni keşişinin xahişi ilə qəssab Abramla çəkməçi Qriqorun dava-dalaşını nəzmə çəkmiş və şerinin sonunda onların barışma səhnəsini və rusca danışığını vermişdi:

Bir-birininüz-gözünü etdi maç,
Dost olaraq hər ikisi çəkdi xaç.
Abram dedi Qriqora: "Ya vinovat,
Posli eto ne budim şalit, brat.
Ya praşu ot vas izvineniya,
Teper budiş tı umenya dyadya.

Abram yalan deyir və gözlənilmədən dəmirlə Qriqorun Qulağının dibinə ilişdirir, Qriqor kar olur.

Beləliklə məlum olur ki, Mirzə İsmayıl Qasir şerlərinin leksik tərkibi XIX əsr şairlərinin dilindən fərqlənmir və yüzilliyin qabaqcıl şer dilinin səbatlaşmasında, müasir Azərbaycan dilinin bədii üslubunun təşəkkülündə onun da özünəməxsus xidmətləri olmuşdur.

Qasir sənətində mühəssənat kateqoriyalarına gəldikdə isə, burada onun şerində sözdən istifadə etmək bacarığı, söz və ifadələrinin məna gözəllikləri, şerlərinin obrazlılığı və bu obrazlılığın təmin olunması üçün faydalandığı bədii ifadə vasitələri, həmçinin şerlərinin xalq ədəbiyyatı nümunələri ilə əlaqəsi kimi məsələlər şərh olunmalıdır. Mahir bir sənətkar olan Qasirin öz əsərlərində ana dilinin bütün incəliklərindən səmərəli istifadə etməsi diqqəti cəlb edir. İstər lirik və istərsə də satirik əsərlərində səs düzümü, qafiyə və ritm məqsədilə işlətdiyi sözlərin xarici qişasından süzülən şeriyyat şairin əsərlərinin oxunaqlıq səviyyəsini yüksəyə qaldırır, onların asanlıqla əzbərlənməsi imkanlarını artırır.

Qasir şerlərində ifadə gözəlliyini təmin edən xüsusiyyətlərdən biri kimi müəllifin dilimizin alliterasiya (təcnis) imkanlarından bacarıqla istifadə etməsi qeyd olunmalıdır. Şerlərin böyük əksəriyətində onun rəngarəng çeşidli alliterasiya nümunələri yaratması diqqəti cəlb edir:

Ey kaş ola cananımın canına bu canım fəda,
Ya rəbb, bu canan haqqına eylə duamı müstəcab.

Hələ dahi Füzuli tərəfindən “can” və “canan” kəlmələrinin poetik eyniləşdirilməsi nəticəsində onların müxtəlif variasiyaları və söz formaları halında alliterasiyaya cəlb olunması sonrakı yüzillərin, demək olar ki, bütün müqtədir şairləri tərəfindən sınaqdan keçirilmişdir. Hər bir şair sanki öz

məharətini nümayiş etdirmək üçün bu iki kəlmənin gücündən faydalanmağa, özünün fərdi “can-canan” modelini verməyə cəhd göstərmişdir. Qasir də bu ənənəni davam etdirir və "can-canan" leksik duetinin morfem alliterasiyasına “c” cingiltili səsinin doğurduğu (müstəcab) digər – səs alliterasiyasını əlavə edir. Əslində burada təəccüb və ya hansısa bir nida doğuracaq heç nə yoxdur; sadəcə olaraq, bütün ustad şairlər bundan istifadə etmişlər və Qasir də burada geri qalmadığını nümayiş etdirir. Təbiidir ki, “özlüyündə səs təkrarı bilavasitə bu və ya digər anlayışı ifadə edə bilməz” [63, s.170], lakin bu növ cinas şerə ritm və cazibədarlıq gətirən əlavə amillərdən biri kimi qeyd olunmalıdır. Digər tərəfdən,bu hal hər bir şairin öz əsərinin formal cəhətlərinə, oynaqlığına, axıcılığına və fonetik cazibədarlığına nə dərəcədə diqqət yetirdiyinə, başqa sözlə, onun sözə münasibətinə, sənətkarlığına da işarə edir. Bu cür alliterasiyalardan geniş faydalanması Qasirin həqiqətən söz ustadı olduğunu göstərir:

Girib gülzari-işrətdə xuraman, ey gözəl, gəzmə,
Xəbərdar ol, gəlir nagəh kənari-dəştidən şəhbaz

Burada g və k səslərinin, həmçinin gəz / göz, gə kə və morfem alliterasiyası hər iki misranın musiqililik tonunu bir-birinə bağlayır, ayrı-ayrı sözlərin səs tərkibini eyni fonetik cinsə salmağa, yəni təcnisə gətirməyə xidmət edir ki, bütün bunlar da beytin mühəssənliyini təmin edir.

Bütövlükdə beytdə alliterasiya yaradılması hər bir şairin sənətkarlıq səviyyəsini nümayiş etdirir. Qasir lirikasında daha geniş yayılmış hal isə misradaxili alliterasiyadır:

Vəli bir rəhgüzarda bu güli-gülzarımı gördüm
Lütfə gəlib bir dəm edə bəlkə bu dərdimə dava
Mənim bu dərdi-bidərmanıma heç bir dəva olmaz
Düşdü şurun başıma, məst oldum, ey şirinsifət
Xak olub izzət xəyalilə dolansan, xaki tar…
Əlimd ənəqdi-canım cüstü cusində idim ol mahin
Düşənd əyadıma çeşmin açar min çeşmə çeşmimdən
Bu qəsdilə yüzündən dənləsinlər danə, dildarım

Şairin satirik yaradıcılığında lirik şerin formal əlamətləri, o cümlədən də alliterasiya məsələsi öz yerini saxlamışdır.

"Şirəli bəyə" yazdığı şerində qonaqlıqda iştirak edənlərin adları orijinal bir şəkildə ayrı-ayrı misralarda qruplaşdırılmışdır ki, bu da adların başlanğıc səslərinin alliterasiyasını təmin edir:

> Mirbağır xanü digər Mir Musa xan, Mehdi xan...
> Ağahacı Əli və bir də bizim Ağa Bağır…
> Birisi Mehdi Hüseynqulu, biri Məmmədağa…

Satirik şerlərində də əsas təcnis gücü tək-tək misralarda cəmlənmişdir:

> **Gü**zər etdi**k** sizin ol **ku**çeyi-**k**ənanə bu **gü**n…
> **M**olla Fəttah, ey **m**atan molla…
> Dəstgahü **müs**ə**mmad**a o **müz**ə**mərdi**, bu **məd**qə**m**…
> Heç **bə**zmidə olmaz **be**lə ehsan **be**həqiqət…

Burada da heca və morfem ("qəlpəsi") alliterasiyası təsadüf edir:

> **Və**h-**və**h, nə ziya**fə**t, nə **tə**am, nə **tə**darük…
> **Çay**i necə **çay**ı d**ey**əsən rəngi də **ya**qut…

Qasir şerinin zahiri əlamətlərindən biri kimi onun zəngin təkrarlar sistemindən faydalanma bacarığını göstərmək olar. Azərbaycan sovet ədəbiyyatşünaslığında şairin zəifliyindən irəli gələn təkrar sözişlətmə hadisəsindən fərqləndirmək üçün haqqında danışdığımız təkrarlar sistemini "təkrir" termini ilə əvəz etmişlər (halbuki "təkrir" elə "təkrarlama" deməkdir): "Müəllifin istedadının zəifliyinə, bədii təfəkkürünün və söz ehtiyatının kasıblığına dəlalət edən, ona görə də mənfi keyfiyyət sayılan lüzumsuz təkrardan fərqli olaraq, təkrir bədii əsəri mənaca daha da dərinləşdirir, onun dilini və üslubunu daha da qüvvətləndirir" [14a, s.224]. Lakin, digər tərəfdən, hətta ən böyük söz ustalarının əsərlərində də belə "lüzumsuz təkrarlara" rast gəlmək mümkündür. Məsələn, Füzulidə, Səməd Vurğunda belə hallara təsadüf olunduqda, heç bir haqla demək olmaz ki,bu dahi sənətkarların hansısa misrası zəifdir, qüsurludur, çünki burada təkrar

işlənmişdir. Elə isə, tədqiqatçının ikili standarta aludə olmaması üçün terminoloci yekdilliyə nail olmaq lazımdır: necə deyərlər, təkrar elə təkrardır və bu təkrara görə şairin istedadı haqqında söz söyləmək düzgün deyil:

Çəkər biçarə Qasir firqətindən daima dilbər,
Aman sənsiz, aman sənsiz, aman sənsiz, aman sənsiz

deyən şairin ikinci misrasında dörd dəfə "lazımsız yerə" təkrar verilir, halbuki Qasir bu misranı başqa şəkildə də verə bilərdi. Sadəcə olaraq, bu şəkildə təkrara yol verib və bu, Qasirin şairlik səlahiyyətidir. "Belə təkrarlar, bu yeknəsəqlik qətiyyən müəllifin qüdrətsizliyini, söz tapmaqda acizliyini göstərmir, bəlkə, müəllifin sənətkarlıq qabiliyyətini, detallaşdırma və konkretləşdirmə işində hansı vasitələrə daha çox müra- ciət etdiyini göstərir" [2, s.106] və hər bir şairin şəxsi işidir.

Beləliklə, "təkrir" termini öz əhəmiyyətini itirir.

"Şərhi-hal və bəyani-vaqeə"sində də Qasir bütöv bir misrada belə orijinallıq edir:

Dedim, Aciza, olmasın qissə tul,
Fə'ulun, fə'ulo, fə'ulun, fə'ul.

Yaxud "Qardaş" şerində yuxarıda dediyimiz tərzdə eyni misrada eyni nidanı təkrarlayır:

Çəkər hicrin əlindən Qasiri-biçarə hər dəmdə,
Aman qardaş, aman qardaş, aman qardaş, aman qardaş!

Şerin ruhuna diqqətli yanaşsaq, bu cür təkrarların lüzumsuz deyil, xüsusi məqsədlə işləndiyinə əmin olarıq. Qasir belə bədii priyoma əl atmaqla, oxucu diqqətini qəhrəmanının daxili aləminə, onun kükrəyən hisslərinə, tüğyan edən qəlbinə yönəltməyə çalışır. Eyni misrada dalbadal düzülən eyni sözlər poetikliyi artırır, şairin deyil, onun qəhrəmanının daxili aləminə, onun kükrəyən hisslərinə, tüğyan edən qəlbinə yönəltməyə çalışır. Eyni misrada dalbadal düzülən eyni sözlər poetikliyi artırır, şairin deyil, onun qəhrəmanının hiss və həyəcan, emosional çılğınlıq anında söz tapa

bilmədiyini, daha doğrusu, məhz həmin məqamda, həmin məqtədə sözünün ancaq bundan ibarət olduğunu çatdırır. Qəhrəman tıncıxır, onun emosional vəziyyəti zirvəyə çatır, daha ondan o yana yol yoxdur. Təsadüfi deyil ki, bu təkrarlar əsasən nida dolu müraciətdən ibarətdir və elə buna görə də şerin təkrarlı sonluğu ən yüksək tonla, ən yüksək pafosla səslənir: onu sakit və aram oxumaqla Qasirin məqsədini və misranın məğzini başa düşməmək də olar. Qasirin məqsədi isə bütün şerin mahiyyətini ancaq bu sözlərdə cəmləməkdən ibarətdir:

Aman sənsiz, aman sənsiz, aman sənsiz, aman sənsiz!..
Aman qardaş, aman qardaş, aman qardaş, aman qardaş!..

Əlçatmaz nöqtədə dayanan məşuqənin hicrinə, qardaşa "aman!" nidasının təkrarlanması Qasir şerlərinə yüksək poetiklik ruhu verir, "müəllifin sənətkarlıq qabiliyyətini, detallaşdırma işində məhz bu cür vasitəyə – poetik təkrara müraciət etdiyini göstərir". Ona görə də burada təkrar Qasirin sənətkarlıq xüsusiyyətlərindən biri kimi qəbul edilməlidir.

Qasirdə "Ah, səd ah, həzar ah, rəfiqa, səd ah!" misrası da təkrarın bir növü kimi diqqəti cəlb edir. Lakin burada, əvvəlkindən fərqli olaraq, məhz nitq hissəsi olan "ah" nidası təkrarlanır. Yuxparıdakı misallarda misra bütövlükdə şerin pafosunu qaldırırsa, burada dörd dəfə təkrarlanan nidanı hər dəfə bir söz müşaiyət edir: birinci "ah"-da emosianallıq yenicə start götürür, sonrakı "ah"a köməkçi söz artırmaqla bu emosianallıq yuxarı qaldırılır, "həzar ah" nidası artıq daha yüksəkdə durur və son nida özü ilə birlikdə bütov misranın pafosunun zirvəyə qaldırır, beləliklə, bir misranın daxilində pafosun yüksələn xətt üzrə inkişafı müşahidə olunur. Burada pafosun dəyəri, əvvəlkindən fərqli olaraq, bütün şer üçün deyil, misranın özü üçün maraqlıdır. Bununla yanaşı, misrada zirvəyə qalxmış pafos şerin sonrakı bəndlərinə də təsir edir, əsər bütövlükdə emosianallıq yükü daşımağa hazır olur.

Qasirdə təkrarın digər variantı ilə də rastlaşırıq: eyni beytin hər iki misrasının eyni sözlərlə başlanmasından irəli gələn təkrar növü maraq doğurur:

Çox kimsəyə ar oldu gedib qeyrəti əldən,
Çox kimsə olub xeyli mükərrəm bahalıqdan…

Yaxud:
Ol şuxi cadu gözlərin aldı əlimdən səbrimi,
Ol şirşəkkər ləblərin qoymub dəxi qəlbimdə tab…

Yaxud:
Ey olan hər iki aləmdə mənə yari-əziz,
Eyvuranfirqətibusinəməbirxəncəri-tiz…

Başqa bir variantda iki yanaşı beyt eyni sözlərlə başlanır:

Əla, ey bivəfa yarım, gözəllərdə vəfa olmaz
Sənin tək rəhmsiz namehribanü purcəfa olmaz.
Əla, ey dilbəri-şirinzəbanü mah rüxsarım,
Mənim bu dərdi-bidərianıma heç bir dəva olmaz…
Hər iki halda təkrar məqsədli və yerli-yerindədir.

Birinci halda təkrar şerin pafosunun məhz həmin iki misrada, yəni bütov bir beytin əvvəlində, ikinci halda isə iki bütöv beytin əvvəlində yerləşməsinə işarədir və burada cəmlənmiş emosianallıq yükü birinci halda bir beytin daxilinə, ikinci halda isə iki beyt içərisində yayılır. “Çox kimsə / /çox kimsə”, “ol / / ol”, “ey (olan) / / ey (vuran)”, “əla, ey / / əla, ey” təkrarları oxucunun görmə üzvlərini cəlb edir və şerin cazibədarlığını artırır.

Bundan başqa, Qasir öz poeziyasında zahiri mühəssənat kateqoriyalarından olan qafiyənin ən rəngarəng növlərindən istifadə etmişdir. Bunlardan ən maraqlısı daxili qafiyədir ki, şairin şerlərində təkcə rədif bolluğundan irəli gəlmir. Misal üçün, “Bahalıq” şerində Qasir bəzi bəndlərdə qafiyəni sondan ikinci, bəzilərində hətta üçüncü yerdə verir:

Bu təəccübdü ki, bir dəstə gəlibdir əmələ,
Hacı filan, filan nəstə gəlibdir əmələ,
Xeyli ahəstəvü ahəstə gəlibdir əmələ,
Nə bu il, çoxdan edib hamıs ıniyyət bahalıq…

Həmin şerdə uğurlu qulaq qafiyəsi diqqəti çəkir:

Ərdəbildə necə ənvatı edibdir ehya,
Adı tək qurbanıyam Mirzə Ələkbər ağaya
Ki, olub əhli-sualın hamısı əhli-dua,
Öylə tə’sir eləməz onlara nisbət bahalıq.

Yaxud:

Ey bu sözü eyləyən inşa mənə,
Hər eybimi qılan hüveyda mənə…

Qasir yaradıcılığında daxili mühəssənat məsələləri şerlərində emosionallıq- ekspressivliyin, başqa sözlə, hiss-həyəcanda qovuşuq obrazlılığın təzahürünə xidmət edir. Azərbaycan dilinin ifadə zənginliyi yüksək dərəcədə bədiiliyi təmin etməyə qadirdir və ana dilində yazıb-yaratmış bütün klassiklərimiz onun bu imkanlarından müvəffəqiyyətlə istifadə etmişlər.

“Obrazlılıq ən azı beş keyfiyyətin – söz və ifadələrdə şəkilliliyin, bu zəmində müqayisənin və məcazi mənalığın, daimi bədiilik və müdriklik keyfiyyətlərinin vəhdətindən, harmoniyasından, sintezindən ibarətdir” [9, s.21]. Qasirin şerlərində söz və ifadələrin şəkilliliyi, başqa sözlə, zahiri mühəssənat məsələsini araşdırmaqla kifayətlənmək olmaz. Onun poeziyasının əsas məziyyətlərindən bir hissəsi də daxili mühəssənatda, məna və məzmun gözəlləyində qərarlaşmışdır. Bu daxili bədiilik və mənalılıq haqqında danışmaq üçün isə şairin işlətdiyi bədii ifadə vasitələri araşdırılmalıdır.

Mirzə İsmayıl Qasirin şerlərində bədii ifadə vasitələrinin zənginliyi onların poetik obpazlılığını təşkil edir. “Bədii ədəbiyyatda poetik obrazlılığı yaradan məhz poetik fiqurlar və məcazlar sistemidir” [9, s.40]. Qasir yaradıcılığı da bu sistemi tam əhatə edir. Onun lirikasında və satirasında təşbeh və epitetlər, istiarə, kinayə, mübaliğə və s. kimi sadə və mürəkkəb məcazlar sistemi vardır.

Qasirin istər lirik, istərsə satirik əsərlərində ən çox təsadüf edən məcaz növü təşbehdir. Burada təşbeh ənənəvi bənzətmə sintaktik cütləri vasitəsi ilə, ya da şairin öz dəst-xəttindən irəli gələn təsviri yolla təqdim olunur:

Ox tək qəddi-dilcuyi olub canıma peyvənd,
Ney-ney bir əlifdir, yazılıb can arasında

beytində Qasir, bir tərəfdən, klassik ədəbiyyatdan bəlli olan hürufilik elementlərindən istifadə edib, yarın qamətinin düzlüyünə görə “əlif”ə bərabər tutur. Digər tərəfdən isə, burada təşbehin təsviri yolla verilməsi göz qabağındadır: şair “ney kimi”, “əlif kimi” təşbeh modelindən deyil, bütövlükdə beytin semantikasından faydalanır: beləliklə, birinci misrada məhz model («ox tək») verildiyi halda, beytin tam məzmun tutumu özlüyündə çox güclü bənzətmə yaradır: “Can alan qəddi ox kimi mənim canıma sancılıb, neyə oxşayan bir əlif kimi canımın arasında yazılıb”.

Gördüm gözünü zülfi-siyah ilə dedim bəs,
Nərgiz açılıb sünbüli-rəyhan arasında…

Burada isə heç bir misrada sintaktik təşbeh fiquru yoxdur. Beyt nəqli yolla danışıq dilinin nəzmə çəkilmiş variantıdır: “Gördüm ki, qara saçları gözünün üstünə tökülüb (elə bildim ki) reyhan sünbülləri arasında nərgiz gülü açılıb”. Beyt strukturunda ifadə edilmiş təşbehin maraqlı formasıdır.

Beləliklə, Qasir obrazlılıq yaratmaq üçün adi sintaktik modellərdən deyil, kontekstdən istifadə edir. Məlumdur ki, “poetik obrazlılıq cümlə və ya mətn şəkilli obrazlılıqdır, fikir bitkinliyinə malik obrazlılıqdır” [9, s.40] və müəllif də daha çox belə poetik obrazlılığa əl atır. Hətta sintaktik birləşmə tərzində məcazları da Qasir beytlərinin mətn şəklində, bütövlükdə poetik obrazlılığını təmin etməyə xidmət göstərir:

Necə bülbül, əli güldən üzülsə, ahi-zar eylər,
Onun tək mən də qıllam naləvü ahü fəğan sənsiz

beytindəki söz düzümü əslində Azərbaycan dilinin obyektiv sintaktik qanunlarına cavab vermir və burada şerin tələbi ilə ərəb və ya fars dilinin

qrammatik strukturuna müvafiq konversiya edilmişdir. Lakin bu yolla həm də şair poetk obrazlılığa nail olur, yenə də bəsit sintaktik modelə uymadan orijinal bir təşbeh forması təqdim edir. Burada təşbeh “bülbül”ə deyil, onun “ah-zar”ına, başqa sözlə, hərəkətinə uyğunlaşdırılır: “Əli güldən üzülən bülbülün ahi-zarına bənzər nalə çəkərəm, ahü fəğan edərəm”.

Yüzün cənnət, qəddin tuba, ləbin kövsər, özün huri misrasındakı sadə təşbeh formaları klassik məcazlardan az fərqlənir. Bunu hiss edən şair fikri tamamlamaq üçün sonrakı misradan istifadə edərək, belə sadə bənzətmələri mənalandırır və

Yetişmək çox çətindir bu təmənnayə, bu amalə

deyərək gözəlini ilahiləşdirir; şerdə isə sadə təşbehləri də içərisində əridən mürəkkəb təşbeh, yəni beytlə ifadə olunan mətn şəkilli təşbeh qurulur. Qasir, demək olar ki, bütün şerlərində təşbehin gücündən bu yolla ymumi poetik obrazlılıq yaratmağa çalışmış və istəyinə nail olmuşdur.

Qasirin lirikasında diqqəti cəlb edən təşbeh nümunələrindən biri də ondan ibarətdir ki, şair qəsdən bənzətməni tərsinə aparır və beləliklə, gözəln mübaliğəsini verməklə, real obyektin bədii litotasına nail olur:

Tutubdu zülfi-syahın tək aləmi zülmət,
Götür niqabı yüzündən, cahan münəvvər ola…

Bu beytdə ekspressivlik cəhətdən neytral yanaşılsa, “zülmət aləmi tutan kimi sənin də zülfi- siyahın üzünü tutub” fikri verilə bilərdi. Ancaq Qasirin orijinallığı orasındadır ki, əksinə, o, gözəlin qara saçları kimi zülmətin aləmi bürüdüyünü göstərir. Bununla şerin ikinci lirik qəhrəmanı yüksəklərə qaldırılır: o, bənzəyən deyil, bənzədiləndir və məhz zülmət onun qara saçları ilə müqayisə edilir.

Hətta sadə təşbeh yaratdığı hallarda da Qasir çox vaxt müqəyyəd modellərin əksinə olaraq, sadəcə bənzətməyə əl atmır, o, gözəldəki təşbeh əlamətlərinin təsdiqini verir və cümlədə təsdiq hökmü yaranır:

Qəddü əndamına diqqətlə tamaşa qıldım,
Qaməti-sərv idi, əndamı hamı pərqudur…

Qaməti sərv kimi..deyil məhz elə sərvdir, əndamı
zəriflikdə qu tükünə bənzəmir, pərqu özüdür.

Qasirin satirik şerlərində də müxtəlif təşbeh formaları öz yerini tutmuşdur:

Şurə gəlibdir qoca bülbül kimi,
Olubdu xəndan qızıl gül kimi…
Çayı şirin gər içəm, Xosrova bənzər eyşim,
İndi ağzım acı, oxşar sifətim guhgənə…
Çayı necə çayi, deyəsən, rəngi də yaqut,
Həm tamidə guya ki, gülabilə çəkib dəm…

Ümumiyyətlə, "söz birləşmələrinin və cümlələrin metaforikləşməsi Azərbaycan dilinin poetik obrazlılıq imkanları sırasında ən mühüm yer tutur" [9, s.34] və Mirzə İsmayıl Qasir də həm lirikasında, həm də satirik-yumoristik əsərlərində ana dilinin bu imkanlarından qüdrətli sənətkar kimi istifadə etmiş, zəngin təşbeh konstruksiyaları yaratmışdır.

Bundan başqa, həm müqəyyəd (klassikadan, ümumi danışıq dilindən və şifahi xalq ədəbiyyatından gələn), həm də orijinal epitetlər Qasir yaradıcılığında aparıcı yerlərdən birini tutur:

Bilmisənmi sənə mən aşiqəm, ey gül çöhrə,
Ey diləfruz, cigərsuz, həya nəsrinxiz…
Görüb o Leyli cəmalını əl çəkin məndən,
Qoyun düşəm çölə məcnunsifət, sizi tarı…
Hər tərəfdən tökmişdilə zülfi-siyahı yüzə,
Qara bəxtim açılıb, cilvələnib, biqəm idim…

Təqdim olunan misralardakı epitetlərin hamısı müqəyyəddir: "Gül çöhrə", "diləfruz", "cigərsuz", "Leyli cəmalı", "məcnunsifət", "zülfi-siyah", "qara bəxt" epitetləri Qasirə qədər də Azərbaycan poeziyasında geniş yayılmış və adiləşmiş birləşmələrdir. Qasirin ustalığı yalnız onların düzgün və yerində işlədilməsi ilə bağlana bilər. Onun özünün təqdim etdiyi orijinal epitetlər isə daha çox satirik şerlərində rast gəlir: "matan molla", "balıqudan molla", "babilərin yoldaşı", "minbərdəki külbaş", "hacı filani" və s. Epitetləri

bugünkü dilimiz üçün artıq adiləşmiş olsa da, Qasirdən əvvəlki bədii ədəbiyyatımızda işlənməmişdir və onlardan çoxunun məhz Qasir qələminin məhsulu olduğu faktlardan bəllidir.

Şairin yaradıcılığında maraq doğuran məcaz növlərindən biri də istiarədir. Müəllif ayrı-ayrı predmetlərin ən müxtəlif əlamətlərini, hərəkətlərini və başqa xüsusiyyətlərini metaforik intiqal edərək, özünəməxsus istiarələr sistemi yaradır:

Xəcalətdən bənövşə baş aşağa rusiyah olmuş,
Baxıbdır gülşəni-hüsnündəki müşkin xəttü xalə…

İnsana xas olan “xəcalət çəkmək” xüsusiyyəti bənövşəyə şamil edilir: “Sənin gülşəni-hüsnündəki xəttü xalın bənövşənin xalından da gözəldir və bunu görən bənövşə xəcalət çəkdiyindən üzüqara olub başını aşağı salmışdır”. Füzuliyə istiarədir.

Yaxud: İlahi, hicri sal bir dərdə, görsün ləzzəti-hicri…

İnsana xas olan “dərdə düşmək” xüsusiyyəti poetik bir tərzdə mücərrəd hicrana aid edlir: “İlahi, o hicr ki, məni hicran dərdinə salıb, onun özünü bu dərdə sal ki, hicran dərdinin “ləzzətini” görsün".

Eşq odunda yanıb əriyən cəfakeş aşiqin səmimi dlldə dediyi

Görəndə qamətin yansam, mənə eyb etmə, adətdir,
Görəndə şəmi şövqindən yanar pərvanə, dildarım!..

beyti ən böyük klassiklərimizin ruhunu xatırladır. İstiarələrin işlədilməsi Qasir poeziyasının zinətidir və onun daxili aləminin açılmasına, digər tərəfdən, bir şair kimi poetik nüfuzunun qalxmasına səbəb olur.

Nəzakətlə qoyur hərdəm ayağın, yer çəkər nazın…

“Nazını çəkmək” cəfakeş yar adətidir və bu yar öz məhbubəsinin “ayaqlarının nazını çəkən” yeri bədii canlandırır, ona qısqanır.

Qasir satiralarında da istiarəyə geniş yer verilmişdir:

Təb'imiz etdi kömək, şit sözü duzlu elədik,
Duz sözünü sizə bu növ ilə fərz oldu, demək…

"Şit xörəyi duzlu eləmək"olar. Burada həmin əlamət adicə sözə intiqal edilmişdir. Məlumdur ki, dilimizdə "şirin söz", "şit söz", "duzlu söz" məcaz epitetləri işləkdir və şair həmin imkanqdan uğurla istifadə etmişdir.

İstiarələrin məna tərtibində də Qasirin orijinallığı özünü göstərir. O, burada da tərsinə korelyatdan istifadə edir:

Görən deyir zahirdə çarpayıdır,
Laxlaxda Molla Fəttahın tayıdır…

Məlumdur ki, "laxlax" səsi sınıq çarpayıdan çıxar. Qasir də elə həmin sınıq çarpayısını təsvir edərkən birdən yadına bir-iki ay "gözünün düşməni" olmuş dostu Molla Fəttah düşür və bu səsin məhz ondan çıxdığına işarə edir. Qasir şerində "laxlax" səs çıxarıb "laxlayan" çarpayı deyil, Molla Fəttahdır ki, çarpayı da ona bənzədilir.

Yaxud:

Qatıq demin, bir məhi-tabın deyin,
Səbahətdə Yusifi-Kənan deyin…

Burada da şair orijinallıq edir. Adətən, bir şeyi ağlıqda qatığa bənzədirlər. Qasir isə ona gətirilmiş qatığın ağlığınıYusifi-Kənanın sifətinin ağlığına bənzədir.

Şairlik təxəyyülünün ən bariz göstəricilərindən biri sayılan mübaliğə Qasirin şerlərində sıx-sıx təsadüf edir. Bu məcaz növündən şair əsasən lirikada istifadə etmişdir:

Xəyali-badən ilə Qasir elə məst olmuşdur,
Əgər yüz min Ərəstu gəlsə, bil, gəlməz dəxi halə

beytində Ərəstu reminissentik-tarixi adı bir qədər özünəxas təhriflə "hər dərdin dərmanı loğman" kimi nəzərdə tutulur və sevgilisinin xəyal badəsini

içib məst olmuş Qasiri heç yüz min belə loğmanın da ayılda bilməyəcəyi göstərilir. Mübaliğə “yarın xəyal badəsini içib məst olmaq” və bu məstliyin necə möhkəm olmasıilə əlaqədardır.

Gətirrəm şurə vəhşü teyrü əflakü səmavati,
Əgər lütf ilə baxsa ruyimə ol dilbəri-tənnaz…

Şair göstərir ki, nazlı dilbər onun üzünə lütf ilə baxsa, aşiqə o qədər taqət verər ki, o, heyvanlar və quşlar arasına, fələklərə və göylərə qalmaqal salar. Qasirin müəllif mübaliğəsi kimi qiymətlidir.

Niyə səndən ola bəs əksi-muradım zahir,
Həm kəbab eyləyəsən, həm çəkəsən şişə məni…

Aşiqin bir muradı var: şişə çəkilmiş kabab olub yarının uğrunda qovrulmaq. Aşiq arzusunun çox mübaliğəli tərzdə izharıdır.

Qasirdə kinayə əsasən satiralarda təsadüf edir və məcazın digər növləri ilə müqayisədə çox azdır.

Hələlik çap olunmamış və üzərində “Qasirin bibisi oğlu Qaçaya yazdığı şer” qeydi olan əlyazmada rast gəldiyimiz üç bəndlik əsəri başdan-başa kinayədir. Şerin adından sonra mötərizədə (“Küçələrə su səpmişəm” havası ilə) sözləri yazılmışdır ki, bu da şerin mətndənkənar kinayəsini daha da artırır. Şerdə bibisinin oğlu Qaçayın rəşidliyi və bütün Qarabağda məşhurluğu vurğulanır, lakin sonra məlum olur ki, bu rəşadət və şöhrəti talançılıqla məşğul olduğu üçün qazanmışdır:

Bibimizin rəşid oğlu
Filan Qaçay, bəhman Qaçay
Məşhurdur: Qarabağı
Eyləyibdir talan Qaçay…

Şerin sonrakı bəndlərində “qəhrəman”ın rəzilliyi tam açıqlanır və birinci üç misrada söylənilənlərin yalnız kinayə olduğu məlum olur.

Şerlərin birində Qasir Muğan camaatının əjdaha kimi qoçaq olduğunu qeyd edir, lakin məlum olur ki, bu "qoçaqlıq" Şamaxını "kamə çəkmək" üçün imiş:

Muğanda əjdahalar var qəribə,
Şamaxıni çəkər bir dəmdə kamə…

Qasirin Şirvanşahi adlı şairə mənzum məktublarından biri belə başlanır:

Ey mənə namə yazan şəxs, rəfiüd-dərəcat,
Payeyi-fəhmüni nəzmün əcəb eylibdi sübat…

Bütün şer boyu həcv edib ələ saldığı Şirvanşahiyə "rəfiüd-dərəcat" ("uca", "ali dərəcəli şəxs") deməsini şairin kinayəsi hesab etmək olar.

Mirzə İsmayıl Qasirin bütün yaradıcılığı məcazın müxtəlif formaları ilə zəngindir. Bu faktlar onun qüdrətli söz ustası və mahir sənətkar olduğunu sübut edir. Qasir poeziyası həm daxili, həm xarici mühəssənat mənbəyidir.

Mirzə İsmayıl Qasirin şerləri şifahi xalq yaradıcılığı nümunələri ilə doludur. O, yeri gəldikcə böyük məharətlə atalar sözü və zərbi-məsəllərdən, qarğışlardan və s. paremioloji vahidlərdən istifadə etmiş, onları ayrı-ayrı misralara ya hazır şəkildə, ya da konversiya tətbiq edərək, nizamlanmış tərzdə daxil etmişdir. Məsələn:

Əla, ey bivəfa yarım, gözəllərdə vəfa olmaz…
Müşəxxəsdir, deyərlər ki, xəzinə marsız olmaz…
Dilim sınsın, xüda nakərdə, bəlkə,çeşmi-bəd düşdü...
Sənə hər kimsə yalan söyləsə, versin kəfənə…
Ana südü kimi olsun sənə həlal, ey dust!..
İt-qurd ağzına düşmüş necə gör şairlik…
Mərd özündən bilü, namərd də yoldaşından və s.

Bu nümunələr göstərir ki, Qasir öz bədiiyyatının cövhərini ana dlindən, Azərbaycan xalqının yüzillər ərzində yaratdığı şifahi ədəbiyyatdan almış, öz xalqının və zəmanəsinin oğlu kimi, milli şerimizin yeni zirvələrə çatması üçün əlindən gələni etmişdir.

Beləliklə şairin ədədii irsinin təhlili göstərir ki, Mirzə İsmayıl Qasir Azərbaycan ədəbiyyatı tarixində görkəmli bir satirik kimi etiraf olunmalıdır. Çünki onun bu ədəbiyyat tarixində başlıca rolu ondan ibarətdir ki, Zakirdən başlanan yeni bir cərəyanı əks etdirən çoxsaylı çayların ən qüdrətlisi və ən təlatümlüsü kimi bütün uzunömürlü həyatı boyu zənginləşə-zənginləşə axıb yeni əsrin başlanğıcına çatmış, toplanmış bütün bədii fikir və formaları, bədii ideyalar cəvahiratını satirik şerin zirvəsi Mirzə Ələkbər Sabirə çatdırmışdır. Qasir XIX əsrdən axa-axa gələn qüdrətli və kür çaylardan biri idi və belə çaylardan son nəticədə Sabir kimi bir dərya əmələ gəldi.

## ƏDƏBİYYAT VƏ MƏNBƏLƏR

1. Abdullayev A. Azərbaycan dilinin tədrisi tarixinə dair.- Bakı: Azərnəşr, 1958.
2. Adilov Musa. Klassik ədəbiyyatımızda dil və üslub. - Bakı: Maarif, 1991.
3. Azərbaycan ədəbiyyatıtarixi. Icild. - Bakı: Azərb. EA nəşri, 1960.
4. Azərbaycan mətnşünaslığı məsələləri. I burax. - Bakı: Elm, 1979.
5. Azərbaycan sovet ədəbiyyatşünaslığı (1920-1975) Biblioqrafiya. - Bakı: Elm, 1983.
6. Axundov İshaq. Xatirələrimdə yaşayan Lənkəran. - Bakı: İşıq, 1989.
7. Araslı H. XVII-XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi.– Bakı: BDU nəşri, 1956.
8. BelinskiV.Q. Seçilmi şməqalələr. – Bakı: Uşaqgəncnəşr, 1948.
9. CabbarovXasay. Bədii ədəbiyyatda obrazlılıq. – Bakı: Yazıçı, 1982.
10. CəfərXəndan. Ədəbiqeydlər. – Bakı: Azərnəşr,1966.
11. CəfərXəndan. Uğuryolu. – Bakı: Azərnəşr, 1987.
12. CəfərovM.C. Ədəbidüşüncələr. – Bakı: Azərnəşr,1958.
13. CəlilovJ.İ. M.F.Axundovun bədii irsinin tekstoloci tədqiqi. – ND. –Bakı, 1988.
14. Dadaşov Mustafa, Talışlı Mirhaşım. «Fövcül-füsəha» ədəbi məclisi haqqında. –«Leninçi» qəzeti. 20 sentyabr 1959.
14a. Ədəbiyyatşünaslıq terminləri lüğəti. //Tərtib edəni Ə.Mirəhmədov. Bakı: Maarif, 1988.
15. Ələkbərov Əziz. Nəzəri fikirdə bədii şərtilik problemi. – Azərb. EA Xəbərləri (Ədəbiyyat, dil və incəsənət seriyası).- № 2. - 1990.
16. Əlizadə Ə.Ə. Azərbaycanda mətnşünaslığın inkişaf tarixindən. – Azərbaycan EA Xəbərləri (Ədəbiyyat, dil və incəsənət seriyası). - № 2. 970.
17. Əlizadə Əbdülkərim. Əlyazmaları və arxiv material-larından istifadə üsulları. - Azərbaycan mətnşünaslığı məsələləri. – I burax. – Bakı, 1979.
17a. Əlyazmalar kataloqu. II cild. – Bakı: Elm, 1977.

17b. Ərəb vəfars sözləri lüğəti. – Bakı: Azərb. EA nəşri, 1966.
18. Hüseynbalaoğlu B., Talışlı M. Lənkəran. –Bakı: Maarif, 1990.
19. Hüseynov Firidun. Satirik gülüşün qüdrəti. – Bakı: Yazıçı, 1982.
20. Kərimov P.Ə. Əlican Qövsi Təbrizi «Divan»ının tekstoloji tədqiqi və elmi-tənqidi mətni. – ND. – Bakı, 1991.
21. Köçərli Firidunbəy. Azərbaycan ədəbiyyatı.–I cild.– Bakı: Elm, 1978.
22. Köçərli Firidunbəy. Azərbaycan ədəbiyyatı.–II cild.–Bakı: Elm, 1981.
23. Köçərli Firidunbəy. Azərbaycan ədəbiyyatı tarixi materialları. – II cild. II hissə. – Bakı: Azərnəşr, 1926.
24. Qarayev Nəsrəddin. X1X əsrAzərbaycan ədəbi məclisləri. – ND. –Bakı, 1971.
25. Qarayev Nəsrəddin. «Təzkirei-Ziyai» və «Təzkirei-Nəvvab» haqqında bəzi qeydlər. – Əlyazmalar xəzinəsində. – IV cild. –Bakı, 1976.
26. Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. – Bakı: BDU nəşri, 1956.
27. Qəhrəmanov Cahangir. Nəsimi əsərlərinin tənqidi mətninin tərtibi. – İmadəddin Nəsimi. Əsərləri. – I cild. – Bakı: Elm, 1973.
28. Qəhrəmanov Jahangir. Xalqın mənəvi irsi bizim sərvətimizdir. – Əlyazmalar xəzinəsində. – VII cild. – Bakı, 1986.
29. Qəhrəmanov C.V. Azərbaycan əlyazma kitabı tarixindən. – Əlyazmalar xəzinəsində. – VIII cild. – Bakı, 1987.
30. Quliyeva Mahirə. Klassik Şərq poetikası. - Bakı: Yazıçı, 1991.
31.Mehdiyev Xeyrulla. Klassik şairin ilk kitabı (resenziya). – «Ulduz» curnalı. - №1.1989.
32. Məhərrəmov Tahir. Tənqidi mətn tərtibində vahid üsul yaradılması haqqında. – Azərb. EA Xəbərləri (Ədəbiyyat, dil və incəsənət seriyası). № 2. – 1974.
33. Məmmədov Ə., Dadaşov M., Talışlı M. Seyid Əzim Şirvaninin müasiri Qasir. – «Ədəbiyyat və incəsənət». – 25 iyul 1959.
34. Məmmədov Əzizağa. Mirzə İsmayıl Qasir və onun əlyazmaları. Əlyazmalar xəzinəsində. – IVcild. – Bakı, 1976.
35. Məmmədov Əzizağa. Mirzə İsmayıl Qasir Axundovun mənzum satirik əsərləri: Qarapul; Pul; Bahalıq; Əskinas; Sən öləsən; Şairin cavabı; Ərəverdi. – Keçmişimizdən gələn səslər. 3-cü burax. – Bakı, 1983.

36. Məmmədov Kamran. Önsöz // Qasımbəy Zakir. Seçilmiş əsərləri. – Bakı, 1984.
37. Mir Cəlal, Xəlilov Pənah. Ədəbiyyatşünaslığın əsasları. – Bakı: Maarif, 1988.
38. Mirəhmədov Əziz. Azərbaycan ədəbiyyatına dair tədqiqlər (XIX-XX əsrlər). – Bakı: Maarif, 1988.
39. Mirzə İsmayıl Qasir. Şerlər. – Bakı: Yazıçı, 1988.
40. Mustafayev M. XIX əsr Azərbaycan şer nümunələri. – Bakı: APİ nəşri, 1983.
41. Mustafayev M. Mirzə İsmayıl Qasir və onun ədəbi irsi. – «Leninçi qəzeti». – Lənkəran. – 20, 22, 25, 27 iyun 1985.
42. Mustafayev M. Mirzə İsmayıl Qasir və onun ədəbi irsi. // Mirzə İsmayıl Qasir. Şerlər. – Bakı, 1988.
43. Mümtaz Salman. El şairləri. – I cild. – Bakı: Azərnəşr, 1927.
44. Mümtaz Salman. El şairləri. - I cild. – Bakı: Azərnəşər, 1935.
45. Mümtaz Salman. Azərbaycan ədəbyyatının qaynaqları. – Bakı: Yazıçı, 1986.
46. Müsəddiq Məmmədəli. Mirzə Mehdi Şükuhi. – Bakı: Yazıçı, 1988.
47. Nurəliyeva Tahirə. M.İ.Qasir yaradıcılığında ictimai motivlər. – Əlyazmalar xəzinəsində. – V cild. – Bakı, 1979.
47a. Poetik məclislər // Təritib edəni Nəsrəddin Qarayev. – Bakı: Yazıçı, 1987.
48. Sabir Mirzə Ələkbər. Hophopnamə. – Bakı: Yazıçı, 1992.
49. Sadıqov Əvəz. Seyid Əzim Şirvaninin əsərlərinin dili haqqında bəzi qeydlər. – Azərb.
EA Xəbərləri (Ədəbiyyat, dil və incəsənət seriyası). № 3, 1990.
50. Seyidov F.S. Qori seminariyası və onun məzunları. – Bakı: Maarif, 1988.
51. Səmədzadə H. Hacı Seyid Əzim Şirvani // Şirvani Seyid Əzim. Seçilmiş şerləri.- Bakı: Azərnəşr, 1937.
52. Şaiq Abdulla. Əsərləri. – Vcild. – Bakı: Yazıçı,1978.
53. Şərif Əziz. Sabirin nəzirələri. – «Azərbaycan» curnalı. - № 5.1962.
54. Şirvani Seyid Əzim. Seçilmiş şerləri. – Bakı: Azərnəşr, 1937.
55. Talışlı M. 125 yaşlıməktəb. – Bakı: Maarif, 1983.
56. Talışlı M. Mirzəİsmayıl Qasir. – «Ədəbiyyatvə incəsənət» - 1 iyun 1968.

57. Talışlı M., FərzəliyevV. Mirzə İsmayıl Qasir. –«Azərbaycan müəllimi». – 8 iyul 1983.
58. Talışlı Mirhaşım. M.İ.Qasirin şerlər kitabı (resenziya). – «Leninçi» qəzeti. – 14 aprel 1988.
59. Halil Açıkgöz. Mirzə İsmail Qasir. – Türk edebiyatı dergisi. - № 177.– İstanbul, 1983.
60. Аллахяров К.Г. Текстологическое исследование Дивана Амира Шахи Шабзавари. – КД. – Баку, 1978.
61. Антология узбексокй поэзии. – II том. – Ташкент, 1961.
62. Виноградов В.В. Лингвистические основы научной критики текста – Вопросы языкознания. - №2. – 1958.
63. Гончаров В.Р. Звуковая организация стиха и проблемы рифмы. - М.: Наука, 1973.
64. Ибрагимбейли Х.М. Россия и Азербайджан в первой трети XIX в. – М.: Наука, 1969.
65. Каграманов Дс.В. Республиканский рукописный фонд Академии наук Азербайджанской ССР – В сокровищнице рукописей. – VI т. Баку, 1983.
66. Лихачев Д.С. Текстология. – Л.: Наука, 1983.
67. Магеррамов Т.А. Научо-критический текст поэмы «Малта ал-анвар» Амира Хосрова Дехлеви, ее текстологические и филологические исследования. – АДД, Баку, 1975.
68. Миллер И.В. Талышский язык. – М.: Изд-воАН.ССР, 1953.
69. Нагиева Дс.М. Навои и Азербайджанская литература. – Ташкент: Фан,1991.
70. Рейсер С.А. Палеография и текстология нового времени. – М.: Просвещение, 1970.
71. Селиванова С.Д. К вопросу о проблематике текстологического анализа. – АКД – М., 1977.
72. Азербайджанская Советская Энциклопедия. III том. – Баку,1979.
73. Азербайджанская Советская Энциклопедия .VI том. - Баку,1982.
74. Азербайджанская Советская Энциклопедия. VII том. – Баку,1983.
75. Большая Советская Энциклопедия. 47 том. – 2-е изд.
76. Qəhrəmanov c.M., Musayeva A.Ş. Toplu kataloq. IIIcild (makinaçapı). – Azərb. MEA Əlyazmalar İnstitutunun elmi arxivi.

77. Fr - 1266 – Qasirin əlyazma irsi
78. Fr –1267 – Qasirin əlyazma irsi
79. B – 1546 – Qasirin əlyazma irsi
80. B – 852 - cüng
81. B – 132 - cüng
82. M – 264 - cüng
83. M – 269 (II) - “Təzkirei - Ziyai” (əlyazma)
84. M – 134 - H. Qayıbov. Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir. III cild (əlyazma)
85. Fr – 439 - Şerlər (əlyazma)
86. Fr – 1154 - Şerlər (əlyazma)
87. B – 335 - Şeyx Mahmud Şəbüstəri. Kənzül –həqaiq (əlyazma)
88. A – 607 - Hafiz. Divan (əlyazma)
89. D - 6828 - T. Bayraməlibəyov. Tərcümeyi – halı (makina)
90. Fond 23 / s.v. 226.
91. Fond 23 / s.v. 217.
92. Fond 23 / s.v. 54 - ƏlabbasMüznib. Gənclik yaşlarım (əlyazma)
93. Fond 24 / s.v. 584.
94. Fond 24 / s.v. 145.
95. Fond 24 / s.v. 146.
96. Fond 24 / s.v. 308.
97. Fond 14 / s.v. 821.
98. Fond 3 / s.v. 19. – Həsənbəy Zərdabinin tərcümeyi – halı (ruscaəlyazma)

*

# در توحید باری تعالی شانه

بسم الله الرحمن الرحیم

سپاس فزون بر خداوند در — بو عالم سراسر انکا بنده در

خداوند حق و علیم و قدیر — محیط و توانا سمیع و بصیر

اولوب وصفدن ذات پاکی غنی — صفاتی ثبوتنده فکرت دنی

نه حمدی فراموش اولور دکردن — نه شکری کیدر خاطر فکردن

دیردب حمدون گلشن فکره آب — گلور طبعدن بیله بوی گلاب

اونون امرینه نهی ایدوب برزیق — چکوب رود نیل ابحره ایدوب غریق

تکبر انکا قیلدی نمرود نام — که بر پشه اوندان آلوب انتقام

که ذاتی صفاتی صفاتیدر ذات — بونکا عقل حیراندر فکر مات

چو ذات صفاتنده یوخ اشتباه — تکلم بو معناده تاپمویدر راه

خیال و خرد فهم و فکرت فقط — همیشه ایدوب اعتراف غلط

صفاتی بیاننده عقل دقیق — اولوب لجهٔ حیرت ابحره غریق

ولی ذاتی بکیدر آندان علا — که درشی ذهن درخینه قفل لا

جلالی یاننده جهان بر سراب — یم قدرتنده فلک بر حباب

کلوب صورته لوح کرسی و عرش — سماوات و افلاک و دریای فرش

عناصر که وار اختلاف مزاج — وجودندن آنون تاپوب استراح

اولمتبوع اچون حکم اولوب تابعه — اولوب عالمه علّت رابعه

که بر اسمیدر حضرت مصطفی — ویروب صفحهٔ کاینانه صفا

احد برله احمد ده حی و قدیم — اراده قویوب فرق بر حرف میم

بو اسماده رمیم اگر فرق در — رمیم اچره عالم تامی غرق در

بو دعویده عقل فلاطون شیم — ایدوب میم ده جنبه حرف (لفظ) یم

ایان خدا مطلع وحی در — بلی صاحب امر در نهی در

الف کبی دوز دُر بعهد وفا — اولوب اوّل و آخر انبیا

که استرایده شان فضلینی ذکر — تحیّرده قالمش ارسطوی فکر

تیشمز اوزان فضلنه فصل و باب — اگر یازسه لقمان یوز بین کتاب

ازل روزده کثرت معجزات — تاپوب کشتی نوح اوندان نجات

اوزان پرتو حسنیدور آشکار — ایدوب یوسفی شهرهٔ روزگار

اولوب لطفی موسی اچون رهنما — عصاسین الینده ایدوب اژدها

او دربی‌گمان خالق انس و جان ایکی حرفدن خلق ایدیب بر جهان

مرکّب اولان قدرته کاف و نون یاراندی بو دوقوز فلک بیستون

اگر وار دربوق آنکا برکنار ایدر یوق لقی وارلقین آشکار

ویریب ظاهره زیب منقول دن ایدیب باطنی طیب معقول دن

نه قهر یندن ایمن هنا جانی لر نه محروم لطفی خرابا تی لر

ایچوب قطرهٔ ابر فیضین بحور ییوب دانهٔ رحمتین مرغ و مور

یتوریش خورش ماهیه سوارا ویروب پرورش شکسه گوزگو ارا

بیله خالقه عقل ایدر مقتضا نه اوّل تصوّر دور نه انتها

صفاتنده عاجز دور فکر و خیال وذاتنده قاصر دور عقل و کمال

همان بس که اوصافنده عقل کل ورخیده‌دور دیوب ماعرفناک ختم رسل

## در وصف نبی صلّی الله

محمّدکا دور مخزن معرفت درر و گوهر و معدن معرفت

مخاطبدر و آیات لولاک ایچون بو درشان اول گوهر پاک ایچون

اونون نوری امکانه توحید قدم وجود یله گلدی وجوده عدم



ویروب تربیت هر بیره اول افصح — که امواته احیا ایدردی مسیح

خداوند آنکا گوندروب کتاب — پیمبرلر ایچره ایدوب انتخاب

بو اعجازی آنجق کفایت ایلر — که بر بار ماهی ایتدی شق القمر

بیلوب قرب معراجین خاص و عام — آنکا هر نفس مین صلواة و سلام

*- Mirzə İsmayıl Qasirən öz əliylə yazılmış nümunə

## DƏR TOHİDE BARİ TƏALA
## BESMELLAHER RƏHMAN RƏHİM

Sepase fuzun bər xudavənddür,
Bu aləm sərasər ona bəndədür.

Xudavənde həyyo qədir,
Muhito təvana səmiyo bəsir.

Olub vəsfdən zat paki ğəni,
Sifato subutundə fikrət dəni.

Nə həmdi fəramuş olur zikrdən,
Nə şukri kidər xateri fikrdən.

Dirub(virub) həmddən gülşəne fikrə
ab, Gəlir təbidən beylə buye gülab.

Onun əmrinə nəhy idub bər fəriq,
Çəkub rudi nil içrə ilub ğəriq.

Təkəbbur ankə qildi Nəmrud nam,
Ke bər pəşşə ondan alub intiqam.

Ke zati sifati sifatidu zat,
Bunki əql heyrandur fikr mat.

Ço zati sifatında yox iştibah,
Təkəllum bu mənadə tapubdur rah.

Xəyalo xirəd fəhmo fikrət fəqət,
Həmişə idub etirafi qələt.

Sifati bəyanındə əqli dəqiq,
Olub ləhceye heyrət içrə qəriq.

Vəli zati pakdur andan əla,
Ki vermiş dəhən dürcünə qufli la.

Cəlali yaninda cəhan bər sərab,
Yəmi qudrətində fələk bər hubab.

Gəlub surti loh kursio ərş,
Səmavato əflako dəryavo fərş.

Ənasur ki var ixtilafi məzac,
Vucudundən anun tapub istirax.

O mətbu üçün hökm olub tabeə,
Olub aləmə illəte rabeə.

Ki bər ismidir həzrəti Mustəfa,
Verub səfheyi kainatə səfa.

Əhəd birlə Əhməddə həyyo qədim,
İradə qoyub fərq bər hərf mim.

Bu əsmadə gər mim əgər fərqdur,
Bu mim içrə aləm hamı ğərqdur.

Bu əqli Fəlatuni şim,
İdub mim də beynni hərfi (ləfz) im.

Əmini xuda mətləe vəhydur,
Bəli sahibi əmr dür nəhydur.

Əlif kimi düzdür bi əhdu vəfa,
Olub əvvəlo axəre ənbia.

Ki əstaridə şəən fəzlini zekr,
Təhəyyurdə qalmış Ərəstuye fikr.

Yetişməz onun fəzlinə fəzlo bab,
Əgər be izne Luqman yuzmin kitab.

Əzəl ruzdə göstərub möcüzat,
Tapub keştiye Nuh ondan nicat.

Onun pərtove hüsnüdür aşikar,
İdub Yusfi şöhreye ruzqar.

Olub lutf Musa içun rəhnuma,
Əsasın əlində idub əjdəha.

Odur bi guman xaliqi inso can,
İki hərfdən xəlq idub bu cəhan.

Mürəkkəb olan vaqtidə kafo nun,
Yarandi bu doqquz fələk bisütun.

Əgər vardür yoq ankar bərkənar,
İdiruq nəfi varlıqın aşıkar.

Vurub zahirə zibi mənquldən,
İdub batini teyb məquldən.

Nə qəhrindən imən munacatilər,
Nə məhrum lutfi xərabatilər.

İçub qətrye feyzin be hur,
Yeyub daneye rəhmətin morğo mur.

Yeturmuş xuruş mahiyə suvara,
Vırub bər dərəş əksə güzguara.

Bilə xaliqə əql idər muqtəza,
Nə əvvəl təsəvvür nə itiha.

Sifatında acizdu fikro xəyal,
Və zatında qasirdur əqlo kəmal.

Həmin bəs ki osafidə (tovhidə) əqli kull,
Deyub ma ərəfnakə xətmol rosol.

## DƏR VƏSFİ NƏBİ SƏLLİ ALLAH

Məhəmməd ki odur məxzəni mərifət,
Dəru gövhəre mədəne mərifət.

Muxatəbdu ayat lolak içun,
Bu dur şən ol gövhəre pak içun.

Onun nuri imkanə qoycəq qədəm,
Vucudilə gəldi vucudə ədəm.

Virub(verib) tərbiyət Məryəmə ol fəsih,
Ki əmvati ehya edərdi Məsih.

Xudavənd anki göndərib bər kitab,
Peyğəmbərlər içrə idub intixab.

Bu ecazi an həq kifayət eylər,
Ki barmağı etdi şəqqol-qəmər.

Bilub qorb meracını xaso am,
Ankı hər nəfəs min sələvato səlam.

Bare feraqe dustan bəske neşəst bər deləm,
Mirəvəmo nemirəvəd nafe be zire məhmeləm.

Bare keşideye cəfa pərde dərideye həva,
Rah ze pişo del ze pəs vaqeyist moşkeləm.

Çəmən emruz dər beheşt əsto to dər miyani,
Ta xəlayeq həme quyənd ke hurol-eyn əst.

*- Ərəb əlifbasından çevirən Məhəmməd Purmoxtari

## ŞƏRHE-HAL*

İbtida kərdəm benamət, ey xudaye-laməkan,
Xastəm ta təb'e-xodra mi nümayəm imtəhan.

Zərreye əz afitabe-feyz bər qəlbəm betab,
Qətreye əz bəhre-hekmət bər dəmağəm murəkan.

Bud dər tarixe-u tarix əz hecrət ke, mən,
Mülcəmo, vəssaf vəz inşaye Mirzə Mehdixan.

Nəsli-Dövlətxan, İsmayıl əz səb Səlim,
Mənşəəm Gilanzəmin, ələm ze xake-Şirvan.

Əz təvarixe-dəfad vəz tərəf su seyyima,
Un soxənhara kitabət kərqəm əndər Lənkəran.

Dər səraye-Mirzə Sadıq bəy ke, bud əz əhle-del,
Daşt məirufiyyətəş, əndərmiyane-arifan.

Zifinunü sahibidrakü xəbərdarəd ülum,
Aqilü kamil, fəsihü xorde daneş nöqtedan.

Dər miyan mi bud, mixandənd ətfal əz həvəs,
Dər löğət səd beyt əz şe'rü bədey'ü on zəman.

Dərs miqövtəmmən işənra dər un fəsli-bahar,
Əz ülume-farisi, fəm əz siracü əz xəzan.

Dər həmən ca torfe məktəbxaneye kərdəm bena,
Gird aməd bərsərəm pəncah tufle-dərsxan.

*-Şeir Fars dilində yazılmışdır

## ŞƏRHİ-HAL*

Adın ilə başlayıram, ey məkansız yaradan,
İstəyirəm ta eyləyim öz təb''imi imtahan.

Zövq günəşin zərrəsidir ürəyimə nur səpən,
Hikmət bəhri qətrəsidir damağımı isladan.

Ömür tapdım tarixi-u tarixində hicrətin,
Amma qurmuş təməlini onun Mirzə Mehdixan.

Səlim oğlu İsmayılam, Dövlətxanın nəsliyəm,
Mənşəyim Gilanzəmin, ana yurdum da, Şirvan.

İndi dəfad tarixində, otuz üçüncü yerdə,
Torpağında sözlərimi kitab etdim, Lənkaran.

Ariflərin arifidir burda Mirzə Sadıq bəy,
Duz-çörəkli, düz ürəkli, könül əhli bir insan.

Elmin bütün nöqtəsinə dəymiş onun qələmi,
Saf idrakı bir dəryadır, kamalısa asiman.

Onun urfan ocağında oxuyurdu uşaqlar,
Yüz beyt də lüğət yazdım mən şe'rlə o zaman.

Fars dilindən, şəriətdən, bir də şe'r-sənətdən,
Dərs deyərdim, bülbül gülü səslərsən astadan.

Burda gözəl məktəb açdım, tez yığışdı başima,
Elmin əsli pərvanəsi – oxumağa can atan.

*- Fars dilindən tərcümə edən Xeyrulla Mehdi

## QARDAŞ

Eşit, dərdi-dilimin şərhini, ey növcavan qardaş,
Edibdür gərdişi-dövran qədimi çün kəman, qardaş.

Əgər ki, çəkmişəm əl, ol büti-xünxaridən, əmma,
Edibdür firqəti ğəlbim evin bixaniman, qardaş.

Anama söyləgilən, etməsin qəm, qorxmasın, gəlləm,
Məbadə, məndən ötrü çəkməsin ahü fəqan, qardaş.

Qəza eylüb pərişan halimi, bu ruzigar içrə,
Axar daim gözümdən səfheyi-rüxsarə qan, qardaş.

Vüsalə yetmədim, çıxdı əlimdən rişteyi-məqsud,
Gəlib bu qissəni əlbəttə et, eldən nihan, qardaş.

Söylə, ol mehriban xahərlərimə, nuri-çeşmanim,
Gəlir yanuza qardaşuz, edər axir məkan, qardaş.

Bəradərcan, mənim barəmdə bir fikrü təəmmül qıl,
Gedibdür ixtiyarı, çox olubdur natavan, qardaş.

Əcayib xoş demişlər bu sözü arif olan kəslər,
Gülün bülbül görər vəslin, cəfasın bağiban, qardaş.

Mənim ərzi-səlamımı yetir cümlə əhibbayə,
Mənim barəmdə söylə olmasınlar bədgüman, qardaş!

Nigarın firqətində bəs ki, məhcurəm bu qayətdə,
Edibdür sineyi-zarımda qəmlər aşiyan, qardaş.

Yahudinin əlindən gövhər almaqlıq deyil müşkül,
Bu var kafirdən olmaq eyb olur, həm kəsri-şan, qardaş.

Edib mən binəvaya dilbəri-məhpeykəri düşmən,
Görüm daim ola dilxəstə, bədxahü yaman, qardaş.

Necə dilbərdü zülfi müşki-ənbərdür, ləbi şəkkər,
Əgər məstanə baxsa, bəxş edər əmvatə can, qardaş.

Əgər ki, xubrudur beççeyi-tərsa, vəli qorxum,
Budur qalsın onun zatində küfründən nişan, qardaş.

Giribanın fələk tutsun, suxənçin ilə nəmnamın,
Görüm vursun dilindən, hər nə bədku var ilan, qardaş.

Məni etmişdi zindani zənəxdanında şol məhbus,
Edib zənciri-zülfün gözlərindən pasiban, qardaş.

Sənə mə'lumdur divaneyi-eşqim, yoxdur bak,
Deyil divanəyə eyib, olsa rüsvayi-cahan, qardaş.

Əlim boşdur, üzüm qarə, məni əfv et, sərəfraz et,
Yazıb bu şe'ri göndərdim, onunçun ərməqan, qardaş.

Mənim qəsdim degildi qönçə almaq bu vilayətdə,
Edirdim bir parə nakəsləri mən imtahan, qardaş.

Məqami-həzrəti-sahibdə məni-zarə dua eylə,
Edə dərdimə çarə sahibi-əsri zaman, qardaş.

Çəkər hicrin əlindən Qasiri biçarə hər dəmdə,
Aman qardaş, aman qardaş, aman qardaş, aman qardaş.

## SAHİBƏ

Sənə var, Sahiba, bir parə ərzim,
Gümanım var ola məqbul, ya nə.

Ümidim var, qəbul olsun bu fərzim,
Düşənlər düşməsin özgə gümanə.

Əgər mə'ruzəmiz məqbul bulsa,
O vəqtdə sal bu məktubi bəyanə.

Bunun əksi əgər mövcud deyilsə,
Məbadə salma, əlbəttə, ə'yanə.

Səbəb, rişxənd edib aləm deyərlər,
Filankəs namə yazmışdı filanə.

Mənə bir çuxa al sabiqdəki tək,
Qərəz, şayəstə olsun ərməğanə.

Belə çuxa ola xeyli münasib,
Geyən vəqti fərəh versin rəvanə.

Çoxun bu işdə qıldım əzimudə,
Qərəzsiz mən çəkərdim imtahanə.

Əgər alsan və gər ki, almasan da,
Bu söz məşhur olub əhli-zamanə.

Mənim, əlbəttə, aldır xəl'ətimi,
Gələn vəqtdə gətirmə bir bəhanə.

Olursuz azimi-şəhri-Şamaxı,
Sizi heç salmasın xalıq ziyanə.

Bir özgə ərzimiz vardır, cənaba,
Rəva olmaz düşə hərgiz nihanə.

Əgər görsən bizim sərvi-səhini,
Mənim dəstimlə çək zülfünə şanə.

Sölə, sərvi-səhi, Qasir yazıbdır,
Mənə göndər o zülfündən nişanə.

## SAHİBƏ

Ey sürən ərseyi-cahanda səmənd,
Yetməsin ol əsasə hiç kəzənd.

Diqqət ilə bu nəzmimə nəzər et,
Olasan eşq daməninə pasənd.

Eşqbazilik aləmində mənə,
Şahidi-əqlim belə vermiş pənd.

Yoz bu qövlümdə heç kizbü riya,
Hüsnünün caninə ola sövkənd.

Çün pərişan olanda türrələri,
Boynuma keçdi həlqə-həlqə kəmənd.

Xatirinə onun yetişdi məlal,
Düşdü başimə qülleyi-əlvənd.

Həsəni, kim gələndə göftarə,
Dəhənindən tökərdi şireyi-qənd.

Səngidillər onu qılıb mə'yus,
Yerini etdi layiqi-rişxənd.

Hərçi sə'y ilə guşiş etdim mən,
Olmadı ol zamanda faidəmənd.

Sahiba, Qasirin bu göftarı,
Həsənin xatirinə eylə pəsənd.

## DUZ

Bir baxgilə bu Qasiri-dilsuzə, bəradər,
Gəl eylə vəfa söhbəti-diruzə, bəradər.

Bir torba götürmüş əlinə gəldi uşaqlar,
Ümmidilə dərgahımıza düzə, bəradər.

Duzdan ötrü daireyi-sərhədi gəzdim,
Geydim ayağıma neçə gün muzə, bəradər.

Bilməm nə səbəbdən duz olubdur belə nayab,
Xalqı eliyibdür hamı dəryüzə, bəradər.

Bir torba o ağ duzdan əgər olmasa məqdur,
Barı bizə göndər gilə bir küzə, bəradər.

Şit zadi yeyə bilməyirəm çox qalıram ac,
Bais budu gündə tuturam ruzə, bəradər.

Yoxdur yeməgə yelpənəgü meyveyi-digər,
Nə qarpuzumuz var, nə də xərbuzə, bəradər.

Hərgiz ola bilməz bir ovuc duza, bəradər,
Düşsə ələ bir mə’dəni-firuzə, bəradər.

Payızda bir az duz gətirmişdi üşaqlar,
Ancaq ki, çıxartdı bizi novruza, bəradər.

Gəlmişdi bizə kərbi bəlali kişi mehman,
Bağlub dalı qarpız qədəri qozə, bəradər.

Saqqalına bir şanə çəküb, eylədi siyqəl,
Eşdi buğunu oxşadı buynuzə, bəradər.

Əlqissə, bizmiçün duzu göndər gələ zair,
Döndərgilə bu qəlbimizi buzə, bəradər.

Naqis eləmə torbanı duzdan, elə təzif,
Əcvəf qala gər oxşar o məhmuzə, bəradər.

## HACI MƏHƏMMƏDƏ

Müşfiqa! Hacı Məhəmməd! Eylə bu nəzmə niqah,
Mail olsan yazaram şe’r sənə gahbəgah.

Sənə əmrim budu məndən elə bu pəndi qəbul,
Salik ol sidqilə hər mətləb üçün bulsan rah.

Daima fəzlü kəmal əhli ilə eylə sülük,
Ki, məbada tutasan bu əməli sən ikrah.

İndi guş eylə, yazım mən sənə öz halətimi,
Az qalıb ömrüm ola bu iki-üç gündə təbah.

Dəgmişəm çox yerə bir börk təpəsindən ötrü,
İddə verdi biri bir il, biri bədəz iki mah.

Gəlmədi rast işim bəxt müxtəlif oldu,
Gəlmişəm şurə, nəva başlayıram, gah segah.

Gərək ol nöqtə kimi biz dolanaq başıaçıq,
Hər görən fəhm eliyə bu kişi neylübdü külah.

Müxtəsər özgə tərəfdən üzülübdür əlimiz,
Ki, bu börkün təpəsin sən verəsən xah-nə xah.

Gər tapılmasa təpə qaldım əcəb başı açıq,
Özgə vəz ilə dolanmaq olacaq mənə günah.

Diqqətilə elə əxbarütəvarixə nəzər,
Oların, qovli mənim sözlərimə vardu güvah.

Yoxudu yazmağa bu sözləri bir dəstaviz,
Bir papaq guşəsi əndişəmi etdi kütah.

Namünasibdir mənə qırmızıvü ağü sarı,
Abi və sürməyüyü yaşıl ola, ya da siyah.

Mənə bir börk təpəsi səndən əgər olsa vüsal,
Elə bil başıma bir tac qoyub etdin şah.

## XƏLİLƏ

Ey özünə bəzmi-ürfanda bilən həmdəm məni,
Gər bərabər tutmasan bir az hesab et kəm məni.

Müddəti tə'limü tədrisimə oldun feyziyab,
Ehtiram ilə bilib ustadi-əl-ə'zəm məni.

Gər olam naqis bir az cəm' içrə bə'zidən,
Bə''zilərdən bilgilən hər barədə ə''ləm məni.

Zeybü zinətlə deyil fəhmü kəmalü mə'rifət,
Cürbəcür vəsfilə görmüş cani-mən, aləm məni.

Əvvələn şirin xuramız çox mübarəkdür sizin,
Sanmayın yandırdı bu mətləb misali-sən məni.

Dostü düşmən cəm ola şirində bir mən olmuyam,
Bilmiyibsiz siz məgər nov'i-bəni-adəm məni?

Gər mənimlə dostsən bu növ qəflət bəs nədir?
Xeyli bu kirdarı nahəncar edib dərhəm məni.

Müstəid oldu, vücudin etdi təhsili-kəmal,
İndi bə''zini pəsənd eyləməzsən, həm məni.

Də'vət etdin şirniyə xalqı sərasər bəs neçün,
Bəs neçün bildin bu cəmiyyətdə naməhrəm məni?

Bir mənimlə həmrah idi, ol büsatə Mircəlal,
Ey Xəlil, bu həqiqət incidüb möhkəm məni.

Bə'zi kəslər məndən orda olmamaq vəchin sorub,
Getmişəm fikrü-xiyalətə, basıbdır qəm məni.

Gər təlafisi muradımca bu karın olmasa,
Onda seyr et, zərbi-dəsti, bilgilən Rüstəm məni.

Gər məni sərkar hacı yada salmır, eybi yox,
Çərx pir eylər onu birdəm, edər bir dəm məni.

Bil ki, indi sən Xəlil ol, mən də İsmayıl olum,
Ol vəfa kuyində sadiq edəsən xürrəm məni.

## HÜSEYN YÜZBAŞIYA

Yüzbaşı, gəlmiş idim bəndə, dəyirmanə bu gün,
Az qalıbdır yetişəm, doğrusu, mən canə bu gün.

Qulaq as, ta sənə əvvəl yazalım şərhü bəyan,
Şad olub eylə nəzər sən belə dəstanə bu gün.

Bir araba, bir özüm, iki öküz, bir Yusif,
Güzər etdik sizin ol kuçeyi-kən'ana bu gün.

Xan verən buğdanı aldım, gecə sizdə qaldım,
Etdilər xeyli məhəbbət belə mehmanə bu gün.

Elədik üç gecə sizin evi mehmanxanə,
Tutduq iman ilə bir-bir neçə meyxanə bu gün.

Buğdanı un eyləməkdən ötrü filvage',
Güzərim düşmiş idi yə'ni bu samanə bu gün.

Xeyli diltəng oluram bir para əhvala görə,
Deyərəm mən sənə düşsün onu pünhanə bu gün.

Əlqərəz, xanlara məndən yetirin ərzü salam,
Vacib idi ki, gələm mən görünəm xanə, bu gün.

Leyk şüğlüm çox olub, oldu dəyirman mane,
Gəlübən yetmədim ol feyzilə ehsanə bu gün.

Mənə bir çüxa gərəkdir alasan xanlardan,
Ta geyim əynimə mən xəl'əti-şahanə bu gün.

## BƏYZADƏYƏ

Ey bu sözü eyləyən inşa mənə,
Hər eybimi qılan hüveyda mənə.

Sözün hamı əsldən müşşəqdir,
Yə'qin oldu tamamisi həqqdir.
Qaydadır deyiblər əhli-xirəd,
Namərdi namərd tapar, mərdi mərd.

Bir də bu ki, tapar həpəndi həpənd,
Su çuxuru, kor koru, ləvəndi ləvənd.
Məni hər kəs qaşısa, borc qaşıram,
Dursa durram, oynaşsa oynaşaram.

Təpik atsa, təpiginə dözərəm,
Mən də atsam kəlləsini əzərəm.
Yaxşılara canı nisar eylərəm,
Hər tövrilə etsə rəftar eylərəm.

Bu səninlə görmüşəm hər büsatı,
Əcəb billəm məqami-inbisatı.
Sənin kimi çıxmaram əndazədən,
Köhnə sözü danışmaram təzədən.

Yalan sözü xalqa nisbət verməri,
Aşinaya heç rəva da görmərəm.
Hər kəsilən eyləsəm aşinalıq,
O eyləcə, mən etməm bihəyalıq.

Bu sözlərdən aşinalıq olur yad,
Qət' bulur təriqeyi-ittihad.
Özgə gunə eyləmisən söhbəti,
Sənin qəsdin kəsmək imiş ülfəti.

Bivəfalarə yoxmuş e'tibar,
Dəmirsizmiş, simimiş aşkarınız,
Mə'lum olur, eyrəti-insafınız,
Bizim ilə vurduğunuz lafınız.

Doğruymuş, ağlıq olmaz qarədə,
Eşitdiyim sözlər sizin barədə.
Müşəxxəsdir kim bərü bəyzadəsiz,
Baş qovzayıb sərv tək azadəsiz.

Onun kimi etməyin azadəlik,
Yaxşı olur, həqiqət, üftadəlik.
Mənim kimi siz də xaksar olun,
Dil şişəsi daim inkisar olun.

## DOSTLARIMA

Məndən əl üzənlər, görünür yar tapıbsız,
Güya özüzə yarü vəfadar tapıbsız.

İsavü Məhəmməd, Həsənü, Seyyidü Zərgər,
Müddətdi ki, bir yaxşı xiridar tapıbsız.

Mən eyləmişəmmiş belə bazarızı kasid,
Əlhəmdi ki, bir rayici-bazar tapıbsız.

Çox cümlə yetüb axirə məndən xəbəriz yox,
Mə’lum ki, bir məşqələvü kar tapıbsız.

Qoyduz məni bülbül kimi nalan qəfəs içrə,
Böylə bilirəm güşeyi-gülzar tapıbsız.

Əlbəttə ki, bica yerə vermün gülü əldən,
Birdən biləsiz gül yerinə xar tapıbsız.

Bir yar tapıban siz məni qoyduz ki, kənara,
Sonra biləcəksiz necə əğyar tapıbsız.

Yainki hesab eyləmüsüz Qasiri qafil,
Ya ozlərizi aqilü hüşyar tapıbsız.

Bilməm nə edib cümə günü sizləri pabənd,
Yoxsa, lotular, badeyi-gülnar tapıbsız?

Birdən-birə əl çəkməzidiz, doğrusu, məndən,
Hökmən, bilirəm, siz onu zinhar tapıbsız.

Sərraf o gündən açıb ol guşədə dükkan,
Əgləşməgə, keyf çəkməgə anbar tapıbsız.

Ya xəlqi-zamandan özüzü küncə çəkibsiz,
Ya söhbətə ol künci səzavar tapıbsız.

Ol zad ki, elərdiz ola misqali-təmənna,
Guya diyə billəm, onu xərvar tapıbsız.

Bir tünd haramzadə olubdur sizə munis,
Bəh-bəh, nə əcəb şuxi-şəkərbar tapıbsız!

Bari çağırın kök Baxışı çalmağa zurna,
Gər badəvü tənbürü dəfü tar tapıbsız.

Hər bisərü parəilə, balam, durub oturmun,
Ondan habelə dəftəri-tumar tapıbsız.

Bilsüz necə verrəm sizə bir iş, iş içində,
İşdən olasız ta ki, xəbərdar tapıbsız,

Qorxum budu əğyar eliyə sirrinizi faş,
Necə ki, edüb aləmə izhar tapıbsız.

Bir daireyi-tazə çəkin olsa müyəssər,
Büxl əhli hesab eyliyə pərgar tapıbsız.

Bir parə rəfiqiz varimiş əsl münafiq,
Güya özüzə məhrəmi-əsrar tapıbsız.

Onlar sizi gümrahü günahkar biliblər,
Siz onları dostluqda nə kim var tapıbsız.

Hər ağzı cırıq kimilərə vermiyəsiz yol,
Qafil düşüb, öz böyrüzə mismar tapıbsız.

## GUŞ EYLƏ, EY ƏZİZİM...

Guş eylə, ey əzizim, ey vəsli-ruhi-canə,
Təşrifiniz nədəndir, az-az gəlir dükanə.

Biz aşiqi-camalın bu illətü ləalun,
Biz şayiqi-vüsalın çəkmə özün nihanə.

Bu qəlb saf olubdur, əzmi-məsaf olubdur,
Və’din xilaf olubdur, çox düşmüşəm gümanə.

Axır çe kərdi didi, səbri-məra boridi,
Verdün bizə ümidi, gəldi könül fəğanə,

Yox məndə zad, ey can, bu barədə bil hər an,
Bu Qasiri-pərişan müştaqdır filanə.

Görsün qədi-nihalın, ruyində xəttü xalın,
Çəksün o məh cəmalın, zülfünə bəlkə, şanə.

Faiz ola gözündən, şəhdü şəkər sözündən,
Ac quş kimi yüzündən salsın əlinə danə?

Bu zari-dilfikarı, eşqin olan şikarı,
Görməkliyə o yarı getmiş gülsitanə.

Ey dusti-mehrəngiz, didəm olubdu xunriz,
Siz bizi, ya biz sizi çəkdük bu imtahanə.

Mahmüdinin Ayazı, az eylə ərkü nazı,
Əlbəttə, sən bu razı qoyma düşə əyanə.

Hər dəm çağır, xudaya, mən tək olursan, aya,
Qıl bu gecə mühəyya cəngü neyü çəğanə.

Ey bu əməldə basir, imdadın ola nasir,
Qoyma fəğani-Qasir, çulğaşsın asimanə.

## ƏBU TALİBƏ(N)*

Ey Əbu Talibi, niku kirdar,
Dusttari-əimmeyi-əthar.

Çünkü ismin olub Əbu Talib,
Həm olub əqli nəfsüvə qalib.
Talib olduqda olmusan mətlub
Bə'zi halın edibdi cəzbi-qülüb.

Talibin var nəzərdə mətlubi,
Talıb olmaz yox ictə məhbubi.
Ya həqiqət olur və ya ki məcaz,
Eyləməz izzi nəfsi məhrəmi-raz.

Talibə bə'zi  söylər aşiqdir,
Bu iki ləfzi çün müvafiqdir.
Eşq əhli məhəbbət əhli olub,
Daima dərdü möhnət əhli olub.

Bə'zi kəslər vurar məcazidə dəm,
Bə'zi qoymuş həqiqət üzrə qədəm.
Bə'zilər eşqidən vurubdu laf,-
Çoxları qəlb olubdu, üzləri saf.

Zahir eylər bu sirri-əf''ali,
Xalq bu qissədən olur halı.
Bilinir əhli-həqqlə batil,
Ola mə'lum naqisü kamil.

Görünür, cadədən düşübdür kənar
Ki, olub dərələrdə qula duçar.
Əlqərəz, olmasın bu mətləb tul,
Nəzəri-Taliba gələ məğbul.

Çün bu dibacədə budur məqsud,
Ta ola sinə çak görsə həsud.
Bu müxatib ki, ismi Talibdir,
Talibi bir para mətalibdir.

Bir qədər təbi' şe''r edib hasil,
İstəyir haqqına ola vasil.
Nədir ixlasi-ali-tahaya,
Kim yazar mədhlər o mövlaya.

Eyləyib bir təkyəgahi əsas,
Od qoyub Fatməyə məcməül-nas.
Türəfə mənzildü dilbəndi məqam,
Zikr olur orda göftguyi-imam.

Neçə gün orda sərf olur ehsan,
Çayü-qəndü bürüncü rövqənünan.
Oxunur həm məsayibi-şühəda
Özünü eyləyir Hüseynə fəda.

Bir para növhə həm edib inşa,
Oxuyurlar onu besövtü səda.
Ona şairlik olmayıb mənzur,
Şüəra içrə ta ola məşhur,

Necə kim Yusif, oldu bazari,
Xalq da oldu onun xiridari.
Götürüb hər kəs öz yoxu-varın,
Yusifin gərm etdi bazarın.

Bir kələf götdü pərdə zali dəğəl,
Müştəri oldu çün o mahə züxəl
Etdi bir kələflə cani ala,
Yə'ni o kəcra yegani ala.

Birəzəntək bu mərdi mərdana
Bu kələflə giribdü meydana.
Bə’zi şe’ri edibdü dəstəviz
Tusəni-lənginə verib məhmiz

Gözləmir vəznü qafiyə, nə rədif,
Kişi Firdovsiyə olubdu, hərif.
Gah yazır Zübdəhi nasə,
Əkbərü Qasımla Abbasə.

Eşqi var sərvəri-şəhidanə,
Göz tikibdir qüsuri-rizvahə.
Şüəda halətin edir yad,
İki-üç nohə eyləyib bünhad.

İstəyir kim, qoya behiştə qədəm,
Müft ola hureynilə həmdəm.
Ordada bizləri edə mehman,
Ey belə e’tiqada mən qurban.

Çün görür yox vəfalı dünyada,
Yapışıb daməni o mövladan.
Qasira, çox verme mətləbə tul,
Cümlə nəzmin əgərçi var mə’qul.

Bir Əbu Talibi mühübbi-Əli
Möhür edib kağızın Nəbiyyi-Vəli
Məni mürşid bilir özünü mürid,
Gəlübən gah-gah eylər did.

Hər gələn vəqtda görər pirin,
Ağzını qənd ilə edər şirin.
Çünki var onda bir əqideyi-pak,
Gətirir gah tütün, gahi tiryək,

Edər ustad pirinə dilşad
Tapsa fürsət, həmişə eylər yad
Eyləməkdə bu sözləri izhar
Edərəm həqqə sidqilən iqrar.

Belədir ol əzizin övsafı,
Kişi verməz yalan yerə lafı.
Gah Mirzə Səlimi eylər yad,
Barillaha, evin elə abad.

Annasa şəxs dəhrdir fani,
İstəməz çox da malü dünyani.
Bu bizim əsrdə Xudaya pənah,
İstəyir kim gəda özün edə şah.

Pul, dövlət əziz olub candan,
Keçməz ondan kişi, keçər candan.
Çün bu dünyanı əhli-hikmətü hal,
Eyləyib bir əcuzəyə timsal.

Özünə eyləyib bəsi zivər,
Sala başdan-ayağa zinisar.
Qura bir pəhgüzərdə dami fərib,
..............................................

Ey bizə ustad Mövlana cənab.
Nə Səməddən, nə Qasımdan olmaz cavab,
Çünki onlar layiqi mədh deyil.
Bəlkə, onlar mə’rifət əhli deyil,

Məsləhətdir, bir qəzəl manəndi şe’r.
Olara məxsus olsun şərti-şe’r,
Nə ki, tə’rifü tovsif ola.
Bəlkə, bil-küll təmam bihəcv, ola.

Ta ki, olsun onlara tənbihi-səxt,
Bərk əncamına qılsın cəhdi-səxt.
Bəski, onlar türk heyvan məhzidir,
Adəmi-nadan, layiqi-həcvidir.

Xahişi-külliyi bizdən var sizə,
Onları həcv eyləyib, göndər bizə.
Əgər olar börkə əncam verməsə,
Biz alıb börki göndərrik sizə.

*-Nəşr edilən əsərlərin bir qısmi müxtəlif səbəblərdən natamamdır. Belə halda onlar -(N)- işarəsi ilə qeyd edilmişdir.

## ŞİRƏLİ BƏYƏ

Bir gün var idik bir neçə həmsöhbəti-həmdəm,
Sər həlqəyi-ol cəm’ olub xani-müəzzəm.

Bu cəm’i edib də’vət sərkar Nəsirbəy,
Bir dəvət kim, layiqi-Keyxosrovu həm cəm.

Bir-bəbir adın ol şəxslərin eyləmişəm zikr,
Bir nəzmidə kim yazmış idim, bundan əqdəm.

O nəzmidə həm etmişi dim, bə’zi zərafaət,
Gah eyləmişəm söhbəti-tiryaü gəhi cəm.

Bir misrada yazmış idim riştеyi-ziba,
Bir beytdə gah mədh, gah eyləmişəm zəm.

Xassə bu ziyafətdə səzavarü mədayeh,
Xaməm eyləyib törrə sifət piç gəhi xəm.

Bu nəzmdə həm hasil əgər olmasa məqsud,
Gər zəxmi-dili-çakim üçün olmasa məlhəm.

Onda yazılar bir vərəqi nameyi-ə’mal,
Nuki-qələmim həm olu bir əfiyi-ərğəm.

Zikr oldu qaziyyə nəticə ola hasil,
Xoşdur belə övsafi-ziyafətdən ola qəm.

Bəh-bəh nə ziyafət, nə təam, nə tədarük,
Görmübdü belə mahəzəri-dideyi-Hatəm.

Əzəl verilib məclis ara çay ilə tərtib,
İçməyib belə çayi, deyə billəm ki, hər adəm.

Hər istəkani çay ilə ləbrizu ləbaləb,
Hər ləhzə edibdür peya-pey dəmadəm.

Bir yanda yetib guşimizə cüşü səmavər,
Guya birisi şur oxuyur, zil, gəhi bəm.

Çayı, necə çayı deyəsən, rəngi də yaqut,
Həm tamidə guya ki, gülabilə çəkib dəm.

Çay ki, o məclisdə olub sərf mənim tək,
Heç kim ola bilməz onun əsrarına məhrəm.

Çay söhbəti bu rəng ilə itmamə yetişdi,
Ovsafi-təami eylədi qiblə mücəssəm.

Məcmuə gəlib bəzmə nizam ilə düzüldü,
Hər dairədə oldu zürufati münəzzəm.

Akulə plovdi, bədəli-sədriyi-Şiraz,
Ağ və yumuşaq necə pürqonçəyi-qaqəm.

Bir zərfdə həm düşdü dolma və çığırtma,
Olmuş dilə irad fisincanə müsəmməm.

Aluyi-Buxara ilə aluçeyi-Qəzvin,
Dəstgahü müsəmmada o müzmərdi, bu mədqəm.

Hər dövrü təbxi be təriqi süpəri-Zal,
Hər mürğü kəbabi məsəli-gürzeyi-Rüstəm.

Yəxni tərəzərrin təreyi-süfreyi-Pərviz,
Xalis kərə çün niyyətiiİbrahimi-ədhəm.

Heç bəzmidə olmaz belə ehsan behəqiqət,
İllah ki, orucluq ola, ya mahi-məhərrəm.

Məqzi püstə zirə kabab ilə mürəkkəb,
Aluyü zirişk ilə olub küftiyə toəm.

Nümrüyi-sicaq xoşkilə, küküyi-müsəlləs,
Şamuyi-müdəvvər həbəşi zadeyi-diləm.

Həm fındığü badamü və lüləyi-kəbabı,
Guya o mütərcimdi kəbabə bu mütərcəm.

Dolmavü kədüvü qatığü sirkə sarımsaq,
Bir süfrə ara xadimi – məxdumi mükərrəm.

Rübbü behü həm turşu xiyar ilə badımcan,
Cəm olmuş idi dairədə pişü digər kəm.

Hər kasayi-qəndab pür əz danəyi-reyhan,
Bir şərbəti dinar idi, bir qətrəsi Zəm-Zəm.

Həm cövhəri nanə ilə, həm əfşureyi-qənd,
Ol qatei-sərfa idi bu dafei bəlğəm.

Hər guşədən əhbab eyləyib meyli-tənavül,
Münim özü bu bəzmdə olmuşdu tənəəm.

Çünki yetişib növbəti tərtib ilə təqsim,
Bir məcməiyə düşdü müqabil iki adəm.

Girdik işə bazari bezən beşkən olub gərm,
Guya ki, düşüb seydigəh içrə necə zeyqəm.

Bir həmlədə yüz parə edib cücə kəbabin,
Etdilə xüruşi hami bir ləhzədə bərhəm.

Gahi birisi dolma xəbati ilə olub rast.
Gahi biri bir loğma həvasi ilə olub cəm.

Məclicdəki dərvişi qəni oldu hamı sir,
Hər kimsənə tutduqca edib qarnını möhkəm.

Ondan sora mən yazdığım əş’ar oxundu,
Məzmundan agah olub, cahilü ə’ləm.

Çün etmiş idi Qasir hüzzari cərimə,
Nəfs adamı gəhi edər ərzəl, gahi əkrəm.

Pəs şair üçün cəm olub qəndi bəhasi,
Verdi hərə bir məbləğü mə’lum nə mübhəm.

Ağayi Nəsir bəy özü məğruz qalıbdır,
Ümmüdüm odur lütf edə qəlbi ola mülhəm.

Pul söhbəti çox şəxsin açıb cövhəri-zatın,
Verrəm, deyə bilməz ola fövrən dili əbkəm.

Puldan ötəri çoxları tərk etdi behişti,
Çox nəfs bu mənidə qəbul etdi cəhənnəm.

Bir xələti-şayistədir öz xərçinə layiq,
Lütf eyliyə mərdanə məni eyliyə xürrəm.

Bu mədh bu övsofi gərək etmiyə mə’yub,
Nuki-qələmimlən özünü qılmaya mö”cəm.

Zatində hər ol kimsənin olsa dənaət,
Əfzəldür elə kimsənədən kəlbü müəlləm.

## ŞİRƏLİ BƏYƏ

Bizləri bir gecə etmişdi Nəsir bəy mehman,
Şəbi-yekşənbə idi, axıri-mahi-şə'ban.

O gecə bir neçə əsnaf olub məclisə cəm',
Edirən ismlərin mümkün əgər olsa bəyan.

Birisi bəndəyi-Qasir, birisi Şirəli bəy,
Birisi Hacı Əli, biri Rəhim bəydir həman.

Mir Bağır xanü, digər Mir Musa xan, Mehdixan,
Kərbəlayi Əsədüllahü filanu behman.

Ağahacı Əli və bir də bizim Ağa Bağır,
Biri Mirza İbadulla bəy, ol pak rəvan.

Birisi Mehdi Hüseynqulu, biri Məmmədağa,
Hər ikisi deputat biri çinin, biri çinan.

Bir nəfər də ki, onun isminə xətm oldu kəlam,
Yə'ni sərkari-bilənd əxtərü Mir Əsgər xan.

Mən hesab etdim, on üç şəxs olub bu cümlə,
Adları zikr olunan kimsə çe pirü, çe cavan.

Bəs gərəkdir ki, Nəsirbəy də ola burda hesab,
Ola on dörd nəfər xeyr ola zahir, nə ziyan.

Çay olub sərf ki, insafən əcayib çay idi,
Zahirən çayi-Popovdur, by nə çayi-İran.

Bə'd əz an eylədilər Gəncəfə bazarıni gərm,
O macal olmadı ortalıga gəlsin ehsan.

Doğrudu, olmaz imiş heç toxun acdan xəbəri,
Mən yazıq acü-susuz gözlərim oldu nigaran.

Diksinirdim açılanda qapı, mən biçarə,
Eylə bildim gətirir əlsuyu guya Qurban.

Belə billəm ki, Nəsirbəy məni dustaq eləyib,
Az qalıb ölüm acından, nə pilov verdi, nə nan.

Əlqərəz, bu gecə üç dəstə olubdur həzərat,
Çəkib əsnası, töküb pulu, qızışdı meydan.

Birinin əlinə üç çıxdı, birinə asu cüft,
Gah çıxardı birinin dəstinə dörd şah o zaman.

Gah biri qalib olurdu, biri gahi məğlub,
Birinin qahi işi yaxşı olub, gahi yaman.

Biri verməzdi o məclisdə bir abbası şətəl,
Vacib oldu ki, yazım bu işə özgə ünvan.

Hamı etmiş özünə asnası məşquliyyət,
Yoxdu məndən xəbəri kim üzülüb tabu təvan.

Mən həqiqət nə nahar eyləmişəm, nə çştı,
Ürəyim getdi acından, aman allah, aman.

Mizəbanın varımiş mənilə guya qərəzi,
Az qalıbdır ki, acından bədənimdən çıxa can.

İstərəm kim, çığıram naləvü fəryad çəkəm,
Ələ düşməz ki, yiyim bircə tikə nani-yavan.

Qızışıb xalq qumarə gecə keçdi yarıdan,
Az qalıb sübh ola, çəkdi xoruzlar hamı ban.

Mən qalıb küncdə diltəng, nə munis, nə rəfiq,
Bu deyil rəsmi-rəfaqət, nə təriqi-ürfan.

Pəs gərək oynayan əşxas cərimə çəkələr,
Hərəsi bircə manat olmaya hərgiz nöqsan.

Verməsə hər birisi naməyi-ə’mal yazıb,
Verərik sol əlinə onda olur şərhi-bəyan.

## KATİBƏ

Arifü aqilü cavan katib,
Gənci-əş'arə pasiban katib.

Bülbüli-nəğməguyü xoşdəstan,
Talibi-vəsli-gülsitan, katib.

Təb'inun lə'li-abidarindən,
Bizə göndərdin ərməğan, katib.

Fil-həqiqə, fənayə getmişdim,
Cismimə verdi təzə can, katib.

Belə mə'lum olur kəlamindən,
Səndə var eşqdən nişan, katib.

Əhli-eşqin kəminə çakəriyəm,
Buna şahiddir arifan, katib.

Bir lətifə sənə bəyan eylim,
Düşməsin qəlbinə güman, katib.

Qasir ilə düşən mücadiləyə,
Yeyər axırda bil yavan, katib.

Aləmi-laməkanı seyr etmiş,
Mənə yazmışdın, ey filan, katib.

Laməkani görən məkan neylər,
Var bu mətləbdə çox ziyan, katib.

Laməkanə məanda daxildir,
Fərq var beyni-inü an, katib.

Meylin etməz nəşiməni-ərzə,
Sakini-fövqi-asiman, katib.

İstədim gəndüm ilə darınızı,
Ac olan şəxsə xoşdu nan, katib.

Sərsəri-təb'imin hərifi elər,
Bil hava üzrə badiban, katib.

Qayibanə məhəbbəti eşqin,
Qıldı qəlbimdə aşiyan, katib!

Qərəz, olma bu nüktədən dilgir,
Qasiri etmə bağrı qan, katib!.

## MİRZƏCANA

Mirzəcan, bircə sözüm var sənə lazımdı demək,
Təb''dən istəmişəm bu sözü yazmaqda kömək.

Bu söz oldur ki, bizim evdə bişir nan ilə guşt,
Nə yazım, doğrusu kim, şit olu, müşkildi yemək.

Yeməyə tap şit zadı, ya eylə həkimanə əlac,
Ya ki tap, mümkün əgər olsa da hər qədri nəmək.

Firni, halvavü, tərək, duzsuz olur kim böylə,
Çox çətindir ki, girib çillə, yetib fəsli-səmək.

Getdi şə'ban, bizimçün ramazan mehmandır,
Binəmək hər nə bişə badə gedər sə'yü əmək.

Tə'bimiz etdi kömək, şit sözü duzlu elədik,
Duz sözünü sizə bu növ ilə fərz oldu demək.

## MİRZƏ HƏBİBƏ

İsmim Baba Dərviş, özüm Mirzə Səbihəm,
Gah şairi-şirinsüxənü gah məlihəm.

Bir müddəti bəstərdə məriz oldumü mə’lum,
Min şükr xüdavəndə, bu günlərdə səhihəm.

Bundan irəli mən sizə mənzur idim, amma,
İndi nəzərizdə nədir illət ki, qəbihəm.

Gər qəhr edəsən cövrü, gər lütfü şəfəqqət,
Bən də sizə hər vəqt duaguyü mədihəm.

Tutma mənim əş’arıma, həm sinnimə irad,
Qasirdir adım, yə’ni ki, fərzəndi-Zəbihəm.

## MİR ƏHMƏD XANA

Nameyi-şirinsüxənü xoşxüram!
Hüzuri-xanə yetişib qıl səlam!

Söyləgilən Qasiri-pirü nəzar,
Əyləşibən evdə çəkir intizar.

Şurə gəlibdir qoca bülbül kimi,
Olubdu xəndan qızıl gül kimi.

Düşüb onun başına şövqi-qatıq,
Danışdırır gər necə zövqi-qatıq.

Vəhalonki yıxılıb çarpayidan,
İnciyibdi bir azacıq paydan.

Çarpayının payələri laxlayır,
Üç-dörd ildir Allah onu saxlayır.

Bu növ ilən keçirirəm günümü,
Qonum-qonşu eşitməyib ünümü.

Filankəsin ağriyır başı, canı,
Üstündə yatıb, gedibdir yanı.

Görən deyir: bu çarpayı tazədir,
Nə bilsinlər böylə biəndazədir.

Bir həsir var üstündə, bir palaz,
Demək olur təptəzədir, xeyli saz...

Amma bu gün səhər işim lax olub,
Tərpənəndə kəllə-mayallaq olub.

Qasir ağa yarım saat mil durub,
Ağa Səbih durub təzədən qurub.

Görən deyir zahirdə çarpayıdır,
Laxlaiqda Molla Fəttahın tayıdır.

Qərəz hələ kəlam tul olmasın,
İş düzəlməz əgərçi pul olmasın.

Mirəhməd xan eyləyibdi fərmanı,
Yetişmədi dərdimizin dərmanı.

Varımdı xeylək qatığa ehtiyac,
Qıçımın ağrısına eylər əlac.

Qatıq gəlincə ayağım axsaya,
Gərək deyim ki, toxunub saxsıya.

Demək olmaz xəlqə ağrır payimiz,
Yıxılanda toxunub çarpayımız.

Müxtəsər ki, işlərimiz ləngdir,
Hövsələmiz xeyli-xeyli təngdir.

Gəlmədi mə’şuqəmiz ol şux qatıq,
Yə”ni ki, qaymağa qarışmış qatıq.

Qatıq demin, bir məhi-taban deyin,
Səbahətdə Yusifi-Kən’an deyin.

Necə qatıq maya tutub şirdən,
Güya kəmərbəst olub pirdən.

Yiyən kimi Qasiri irşad edir,
Başdan ayağa ürəyin şad edər.

Fətəliyef görsə deyər mərhaba,
Gəlsə qatıq, dalınca gəlir əba.

Biz bilirük, bu özgə işarədir,
Nəğmeyi-üzzalü zəminxarədir.

Onun üstən gəlir havayi-qatıq,
Mahurlan şurü nəvayi-qatıq.

Eşitmisüz Fəlatün girib küpə,
Havalərə cəm edib düzüb ipə.

Haman küpə töküblərmiş şirü-mast,
Çəkməz imiş yoxsa çargahu rast.

Şirəli bəydən soruşun kamını,
Havaların bir-bir məqamını.

Bu halda var könüllərdə vəlvələ,
Bu sözü yazdım edəsüz məşğələ.

Mir Əhməd xan, Ağa xan xoşdil ola,
Həm Qasirin məqsudi hasil ola.

## MİR ƏHMƏD XANA

Şəhri-hali-dilimi yazmışam, ey xan, sənə,
Göstərib çərxi-fələk cövrü cafasını mənə.

Bizə yeksər necə gər ariz olubdur təbülərz,
Tiflilər nalə çəkər gah dədə, gah nənə.

Səni dərd əhli bilib dərdimi izhar etdim,
Demərəm dərdimi dərd bilməyibən dilşikənə.

Çünki sərhəd yeridir bir para zad düşməz ələ,
Qeyri qanqal deyil iydəsi, bir də çətənə

Məsələn, indi mənə lazım olub qəndlə çay,
Bir nəfər müftə verən yox, nə də qərz-ül-Həsənə.

Çay əgər olmasa da səhlidü darçın tapılır,
Müxtəsər, qənd tapılırsa, tapılır hər nəmənə.

Müftəxor çayi içən dəm vurar hey batmandan,
Mənə misqalı müqabildir onun bir tümənə.

Nə də kişmiş tapılır, bəlkə içək dişləmə çay,
Ya zərər eyliyə, ya nəf' həqiqət bədənə.

Belə bir şey tapılmaz becüz əz nani-yavan,
Rusiya çayı böyük üzrdü mehman gələnə.

Filhəqiqət ki, olub qənd kərəm tək nayab,
Satsalar müştəriyəm gər verələr min tümənə.

Çayı şirin gər içəm Xosrova bənzər eyşim,
İndi ağzım acı, oxşar sifətim guhgənə.

Hər cəhətdən işim əskikdi bu il, vaveyla,
Gündə beş yol açaram fal "Kəlilə Dimnə".

Bizə bir qədər əgər qənd şəfəqqət etsən,
Verilər hər tikəsi nisbət əqiqi-yəmənə.

Minnətim yoxdu bu il eyləyim, övzai-dürüst,
Sənə hər kimsə yalan söyləsə versin kəfənə.

Ola, ya olmaya şair yazacaqdır ovsaf,
Düşə avazəsı hər mülkdə dəhəndən-dəhənə.

## MİR ƏHMƏD XANA

Ey xani fələkşən işim rəncü təəbdir,
Şəb fikri günüz, gündüzüm əndişeyi-şəbdir.

Talışda çalışdım neçə günlər, neçə aylar,
Bir işdən ötrü adı onun eyşi-tərəbdir.

Yüz möhnəti-ənduhilə gəldim bu diyarə,
İndi yetişib fəsli-zimistan, mahi-rəcəbdir.

Gördüm ki, bizim buqədə heç yoxdu tədarük,
Çoxdandu ocaq yanmır müştaqi hətəbdir.

Oldum yenə diltəng məni basdı xəyalat,
Gördüm qutarıb buğda çuvaldan bu əcəbdir.

İndi bizim ev Misrdir, Kən’an dəyirman,
Guya birisi Şam, biri mülki-Hələbdir.

Dedim özümə, qəm yemə, get xidməti-xanə,
Həm himməti-alidü, həm ali nəsəbdir.

Xoş xülq, xoş əhvaldü dərviş-təbiət,
Arif dili mərdanəvü pakizə həsəbdir.

Sabiqdəki tək dərdüvə eylər yenə dərman,
Xurma ki, düşmüyüb hələ əyyami-rətəbdir.

Ümmidim olur eyləməyə bəndəni novmid,
Lütfü kərəmi olsa, ümmidimə səbəbdir.

Yoxdur ona bir xidmətim olsun mənə hörmət,
Mənzur keçən xatiri-hali-cəddü əbdir.

Bundan irəli fikrü qəmim az idi, amma,
İndi qəmim artıb, mənə bu qeyd qəzəbdir.

Mollalara halvəyü çilo, nanü mütəncən,
Meyxanələrin istədiyi mai-ənəbdir.

Bir tayfada mədhü dua himməti xidmət,
İstər belə də cudnüma adəti dəbdir.

Xaliq səni, övladivü hifz eyliyə, daim,
Çox da sizə israr eyləmək tərki ədəbdir.

Öz şə'ninə layiq mənə buğda kərəm eylə,
Özün bilüsən, Qasir, həngami-tələbdir.

## MİRZƏ İSA ARİFƏ

Mirzə İsa, mana bir namə götür yaz, kişi,
Ola əbvabi məhəbbət yüzümə baz, kişi.

Bilirəm vardı təbində sənin istiğna,
Bu qədər bəsdi, edirsən mənə sən naz, kişi.

Az ol aludə bu dünyayi-dəninin işinə,
Sənə şayəstə deyil hirs, elə az, kişi.

Səni görməkliyə çox talibi-müştaq olmuş,
Hər zaman eyliri, şövqim quşu pərvaz, kişi.

Əhdü misaqi-vəfa zövqü səfadə əlhəqq,
Eyləmişdim rüfəqadən səni mümtaz, kişi.

Uyma çöx qəflətə, bilmərrə məni eyləmə tərk,
Sən deyildin mənə həmsöhbətü həmraz, kişi.

Eydi-novruz sənin kimi nəzakətlə gəlir,
Əmrdən gərçi gedir, leyk gəlir yaz, kişi.

Açılır sünbülü reyhan çəmən bağ içrə,
Nəğməvü ləhcəyə bülbül edər ağaz, kişi.

Kişi bu fəslidə bu qədr edirmiş qəflət,
İstəməzmiş qəzəlü çəngü neyü saz, kişi.

İndi hər guşə müsəlladü həmi rüknabad,
Lənkəran mülki olub xutteyi-Şiraz, kişi.

Var necə kimsə edər də'viyi-peyqəmbərlik,
Göstərir münkir olan kəslərə e'caz, kişi.

Biri bir ism deyir, qarğa olur qırqovul,
Biri bir məntor oxur, ördək olur qaz, kişi.

Keçəl olmadı başım, mən də oleydım xöşbəxt,
Çünkü xöşbəxt olub hər keçəlü daz, kişi.

Keçən əyyamda guya kişi as-çox varımış,
İndi var, mən biləni, şəhridə çox az kişi.

Ömrümüz keçdi qayitmaz geri, zövq üstünə gəl,
Namə yaz Qasirə, ol qafiyəpərdaz, kişi.

## MİRZƏ İSA ARİFƏ

Dusta, bax sözümün surəti həm xəddi üçün,
Mə’niyi-zahirinin sə’y eyləmə rəddi üçün.

Hansı sözdür ki, sərapa ola ol biillət,
O necə eyşidir itmama yetə bimöhnət.
Kəsrəti-şüğl olub maneyi-feyzu söhbət,
Tutma tənvinü zəbər-zirü poşinə diqqət,
Cəzmü təşdidu əlif həmzövü həm məddi üçün.

Hər sözün sən bilüsən köhnə ilə tazəsini,
Tikmisən çox füqəra dəftərü şirazəsini,
Çün üsul əhli tanır nəğmənin avazəsini,
Nə məratibdə ğörər tə’bimin əndazəsini,
Verilib qisməti hər kimsənin öz həddi üçün.

Bir nəfər düşmür ələ mərdumi-sahibihimmət,
Xoş sifət, həm də cəvanmərdü təhəmtən cür’ət,
Yeğdür əbnayi-zamandan ola qət’i ülfət,
Çün eşitdim ki, dünən bir neçə Məryəm tinət,
Bir qəbayi biçüb İsayi-zəmin qəddi üçün.

Sənə, ya inki mənə lütf eliyə arxalıq,
Sidqilə bir-birimizə edərik arxalıq,
Mən ki ləngəm, səni ya rəb, eyliyə arxalıq,
Çünki bildim yetəcəkdür mənə bir arxalıq,
Yazmışam bir neçə əş’’arı onun şəddi üçün.

Talibəm sən kimi arxaliqi-bidamənə mən,
Olsa astarı birə on raziyəm bir dənə mən.
Bu pərişanlıqla halətə bir bax, yenə mən,
Sən yəqin eylə ki, arxalığı verməm sənə mən,
Doğrudan-doğrusu, Seyyid Bədəlin cəddi üçün.

Müştəri yoxdu, gilaludə olub cövrəyi-təb’,
Qüssədən lal olub nitqi-süxənpərvəri təb’,
Xəlqi-gümrahdu qalıb küncdə peyğəmbəri-təb’,
Nəfsi-yəcucini qalib görüb İskəndəri-təb’,
Bu neçə fərdi-bina etdi onun səddi üçün.

Qasir, ögmə özünü az sözünü lafə yetir,
Özünü cəhd elə Simürq kimi Qafə yetir,
Hər sözün olsa onu sahibi-insafə yetir,
Müxtəsər, simü-zəri-təb’ini sərrafə yetir,
Onda həm cinsin olur qaidə sərhəddi üçün.

## MİRZƏ İSA ARİFƏ

Ey dil, yenə bir gəlgilə göftarə gərəkdür,
Bir ləhzəyi gəl nitqi-gövhərbarə gərəkdür.

Tök-dürci-dəhəndən yenə lö'löyi-cavahir,
Lazım ola, əlbəttə, xiridarə gərəkdür.

Gahü gəhi bə'zilərə əş'ar ola lazım,
Amma qəzəl əhlinə bu həmvarə gərəkdür.

İzhar elədim zimnidə nöqsani-əbani,
Nöqsanına, əlbəttə, onun çarə gərəkdür.

Nöqsan səbəbinə bu əba başa yetişmir,
Qasir bürünə, bir gələ bazarə gərəkdür.

Hər bir zadı hazırdı, iki cüzidi naqis,
Düşsün gərək ol cüzilər izhara gərəkdür.

Ol astarı kim bizə olmuşdu şəfəqqət,
Əskikdü bir arşın qədəri parə gərəkdür.

Bir şeyi-əlahiddədə dövrünə sərapa,
Yə'ni göbələk rəngi ola qara gərəkdür.

Gör astaridə olmasa nöqsanı müyəssər,
Bir şey də verün, bəlkə gələ karə, gərəkdür.

Çün əsli yetib, fər'i də lazımdı yetişsin,
Ta düşmiyə iş dirhəmü dinarə gərəkdür.

Billəm sənə lazım dögi bu şey sərapa,
Tə'cillə göndər ki, məni-zarə gərəkdür.

## MİRZƏ İSA ARİFƏ

Mirzə İsa, qıl nəzər, naməmdə ünvan altına,
Səbt olub zahirdəki məqsud pünhan altına.

Lənkaranı tərk edib Bakı ara tutdun vətən,
Saldın əhbabı sərasər, yari hicran altına.

Çox da Bakuda yubanma, Lənkəranə qıl səfər,
Müddəi söylər yığıb sərraf milyan altına.

Xeyli müddətdi, gedibsən Badkubə şəhrinə,
Kuyi-mətlubun düşüb məqsudi-çövkan altına.

Orda çox gəlirdi mişkin buyi xoşbulər olur,
Kim salıb gül yarpağın bir dəstə reyhan altında.

Ey xoşa, əndişə kim çəkdi səni bu pişədən,
Bülbüli-şeyda kimi saldı gülüstan altına.

Bizdə yox teyr etməyə kim, möhkəm balü pər,
Qara daş tək düşmüşük tanrıdan bu viran altına.

Başə düşmüş iştiyaqi vəslin, ey şirinsüxən,
Ordasan, bir yerdə düşmür kar saman altına.

Çün bu bir məşhur sözdür, namə nisfi-vəslidir,
Hər kitabın yazmışlar nöqtə səncan altına.

Guş qıl, bir ləhzə, halından onun eylüm, bəyan,
Aç oxu üstinə bax, xəndan-xəndan altına.

Zöhrə tək tazə dükanlar guşəsində əyləşir,
Əsl vəqti can basar köhnə dəyirman altına.

Üstü-başı yırtılıb, şaxtada çıxmaz küçəyə,
Qar yağanda dürtülür biçarə yorğan altına.

Çuxa köhnə, arxalıq sədparə, köynək çak-çak,
Mündəris şalvarı keçmiş lıqqa tuman altına.

Börkü başından atıb, hər kimsə görsə vəhm edər,
Filməsəl, qızmış girib meydana qalxan altına.

Üz-gözü çox tükləşib tərkibi digərgun olub,
Guyiya kirpi girib xari-müğilan altına.

Diş tökülmüş, laxlayır əngi və burnu sallanıb,
Üst dodağı sallanıb girmiş giriban altına.

Hər kəsə yetsin diyər məndən alıb dörd-beş manat,
Bir yalan sözdür, düşüb biçarə böhtan altına.

Heykəli bütyarədir tərkibi misli-kürdədir,
Girməyib əndazəvü qanunü mizan altına.

Baltasın Nəccar alubdur, kərkisin Mir Əlnəqi,
Mən də çəkdim körpüsün sal sən də suhan altına.

Gecələr bə’zi dükanlar səmtinə azim olub,
Gəh gedir, gahi çıxır dükkanı divan altına.

Kibrdən biçarədir, amma ki, çoxbiçarədir,
Çub qoyub biçarənin məl’un şeytan altına.

Bir günü gördüm yazıb Nəccar bir kaqiz sənə,
Taxça üstündə büküb qoymuşdu Quran altına.

Oxudum, gördüm şirindir, xeyli xoşməzmundur,
Rişteyi-təbi düzüb muncuqi-mərcan altına.

Çün hərfi "ra" ilə çıxmışdı müzhən üstünə,
Mən də "nun" hərfilə girdim əhdü petman altına.

Zahirən, vazehmidir ol şəxsin sənə hər haləti,
Məzhəb üstə cəhl edib vurdu o imanaltına.

Lazım oldu, bizdə cəm etmək mətai-tə'bdən,
Ta çəkək nəzminlə ol heyvani zindan altına.

## ƏBDÜL ƏHƏDƏ

Əbdül Əhəda! Təbi-süxəndan varındır,
İnşallah ki, gənci-firavan varındır.

Bir nüktə yetib xatirimə eylərəm inşa,
Çünki bilirəm nükteyi-ürfan varındır.

Bazarı bu gün seyr eylədim, söylədim, ey dil,
Axır iki həmsöhbətü canan varındır.

Yə’ni Hacı Dərvişlə ağayi-mükərrəm,
Səninki olara dideyi-ehsan varındır.

Fürsətdü gedib onları həm eylə ziyarət,
İndi nə ki, hər vəqtidə imkan varındır.

Getdim, elədim, müxtəsər onları mülaqat,
Mə’lum elədim bu gecə mehman varındır.

Oldum mütəfəkkir, elədim xeyli təəccüb,
Mənsiz necə işdir bu ki, pünhan varındır.

Bir yerdə ki, dərvişlə səyyah ola həmriş,
Bir kəlmə ki, bir məclisi-rindan varındır.

Vazehdü həmin məclisi-məxsusidə əlhəq,
Həm çay və həm qəhvəvü-qəlyan varındır.

Bilməm nə səbəbdəndir olub bəndə fəramuş,
Mə’lum təamında fisincan varındır.

Gər ayrı zad olsaydı məni də’vət edərdin,
İndi bilirəm in yoxun, an varındır.

Biz də əgər ol bəzmdə olsayduq, əzizim,
Fərmayiş elə ta ki, nə nöqsan varındır.

Üzrün ola gər bu gilü bu lehməvü bu lay,
Onda bilunur təb'i-pərişan varındır.

Sən ki bilüsən qeyri-fisincanü müsəmma,
Xoşdur mənə bir loğma, əgər nan varındır.

Yazgilə cavabım, ola gər nəzm və ya nəsr,
Həm xaməvü qırtasü qələmdan varındır.

Gər olsa bu də'vətdə çığırtma ilə kükü,
Təklifə sənün fürsətün ə'lan varındır.

## MİR ƏSGƏR XANA

Alicaha, eşitdin lütfilə dəstanımızı,
Ərz edək xidmətüzə mətləbi-pünhanımızı.

Yoxdur bu mülkdə şe'rü qəzəlin müştaqi,
Çəkdirə rişteyi-nəzmə dürü mərcanımızı.

Tutub axır necəayineyi-qəlbi kədər,
Dərdü qəm lal eyləyüb təb'i-süxəndanımızı.

Dəftərü kağızımız hər biri yüz parə olub,
His basıb küncü bucaqlarda qələmdanımızı.

Bilmirik dərdimizi biz kimə izhar eləyək,
Nəbzi-halımı bilib göstərə dərmanımızı.

Məsləhət eylədim öz munisi-həmdəmlərimə,
Dedilər mədh elə, Qasir, yenə öz xanımızı.

O bizim sovməənin oldu binasına səbəb,
Saldı təşvişidən asudə edib canımızı.

Götürüb mən bu sözü xidməti-sərkara yazım,
Göstərə mərhəmətin, kəsməyə ehsanımızı.

Mahi-zilhiccə əyan oldu, çəkib tiği-hilal,
Məni hər gündə nizar etdi, töküb qanımızı.

Pulumuz yoxdur alaq biz də bu il qurbanlıq,
Bəs gərəkdir ki, sataq balışü yorğanımızı.

Çün bu viranədə bir loğma çörəkdən ötrü,
Vermişik badə hamı məhzəbu imanımızı.

Olu mə'lum pərişanlığı əhvalımızın,
Oxuyan vəqtidə bu şe'ri-pərişanımızı.

Hər kəs öz halına nisbət sərü samana yetüb,
Biz hələ tapmamışıq öz sərü samanımızı.

Qısnıyır xırda uşaqlar məni qurbandan ötür,
Gah tutar damənimi gahi giribanımızı.

Sən ricu eylə bizi xırdaca xanzadələrə,
Ta ədalətlə olar eyləyə divanımızı.

Suri-ehsanı şəfaqqətlə çala İsrafil,
Lütf edib cümə günü göndərə qurbanımızı.

Çay ilə qəndimizi yollaya Mahmud ağa,
Əsədullah eləyə gərm zimistanımızı.

Barillaha, bu ağazadələri hifz qılıb,
Eylə dilşad olarlən bu Süleymanımızı.

Əsədüllah ilə Mahmud ilə İsrafilə,
Yar qıl, həmdəm elə ayeyi-Qur''anımızı.

İnşaallah eliyər ömr vəfa, bəxtmədəd,
Görər onlar da bizim dərsi-dəbistanımızı.

Qasira, xan ilə xanzadələri eylə dua,
Ta eşitsin hamı bülbül kimi əfqanımızı.

Xani-ehsanını xanın elə, yarəb, abad,
Bu gün abad edə gər külbeyi-ehzanımızı.

## USTA QASIMA

Usta Qasım, ey rəfiği-piri-mən,
Bilmərəm axır nədi tədbiri-mən.

Paralar məndən üzün tutmuş kənar,
Mən bunun sirrini qıldım aşkar.

Onda çox-çox nöqtələr zahir olur,
Cümlə mərdün tələbi zahir olur.

Qasimü Qasir olur təqsirkar,
Dadə yetsin həzrəti-pərvərdigar.

Hər kəsin var bir ənisü həmdəmi,
Yaxşı həmdəm olsa heç olmaz qəmi.

Bir mənə eylə nəzər, ey xoş xisal,
Həmdəmi ətfal, nadanü xurdu sal.

Sərbəsər qalü qilu, hayü hu,
Eylərəm daim olarlan göftiuu.

İndi seyr eylə, mənim gör halımı,
Gör nədir ətfalilən əhvalımı.

Ey xoşa, yoxdur xəyalın niku bəd,
Həmdəmin olmuş sənin, usta Səməd.

Çox səadətdir, rəfiği əhli-hal,
Xassə, bir eylə rəfiği xoşməqal.

Ey rəfiğa, etmiyübsan cüstücü,
Tapmısan bir eylə yari-rastiqu.

Söylə Qasir, ya Əli, səndən mədəd
Göndərə börkü bu gün Əbdüssəməd.

Vədeyi-iqrari bu qədr oldu tul,
Bəlkə olmuş bəndədən mənzuru pul.

Bir təsəvvür qıl, nə müddətdir mədid,
Xud mənə Əbdüssəməd verdi ümid.

Tez cavabın sən bizə eylə bəyan,
Ta yazaq bir özgə günə dasitan.

## QASIMA

Qulaq as bu sözə, ey şairi-fərxəndəcəmal,
Bir sözüm var, onu səndən edirəm yə'ni sual.

Səni vəsf eylədi, çox bəndəyə Lütfüllah bəy,
Necə kim, vəsf olunur məclis ara Rüstəmü Zal.

Dedi: bir şair var Salik, adı Qasımdır,
Gəzəsən, yoxdu cahanı, belə bir nükxisal.

Bu səbəbdəndi sənin sözlərinə müştaqam,
Gələn olsa, mənə bir namə yaz, eylə irsal.

Çün eşitdim, dedilər, şe'rə də vardır həvəsin,
Həvəsim gəldi, sənə bu sözü yazdım icmal.

Yazgilən kəlmeyi-meyxanə ilə bir namə,
Olmuşam aşiqi-divaneyi-Məcnunmisal.

Yox mənim dərdimə bir çarə edən aləmdə,
Firqəti bu sənəmin eylədi bu qəddimi dal.

Gər bu ətrafa eşitsəm düşəcəkdir güzərin,
Pay-piyada edərəm altı ağac istiqbal.

Çünki tə'cillə yazdım sənə bu əfradı,
Özgədən eyləmişəm bunları da kəsbi-kamal.

Belə məsmü' olur, mövsimi fürsət yetişib,
Düşüb əğyarlar içrə edilir cəngü cidal.

Mənə tezliklə vüsul olsa cavabı bu sözün,
Guyiya kim yetişər təşnəyə bir cür'ə zülal.

Arzu eylədi Qasir bu sözü xaliqdən,
Qasıma, qismət ola bizlərə əyyami-vüsal.

## MAHMUDA

Ey isminə müsəmma Mahmud olmuş adı,
Qıl bir nəzər bu nəzmə bir yaxşı macəradı.

Bu sözlərimə yeksər guş eylə diqqət ilə,
Ta kim sənə həqiqət olsun dəlilü hadi.

Xaliq özü Əlini qüdrət deyib özüyçün,
Məxluq onu cahil bilmək necə rəvadı?

Sirrüllah olmağına eylüb peyəmbər iqrar,
Məmduhi-hələtadır məxsusi innəmadı.

Cahil bilən bu şahı bu cəhlidir həqiqət,
Mə'lum olur ki, yoxdur Allaha e'tiqadi.

Şə'ni-Nəbidə gəlmiş lölak aşikara,
Vardır onun Əlilən peyvəstə ittihadi.

İsanı ermənilər xalıq bilir özüyçün,
Batil bilir bu qövlü, əlbəttə, əqli-badi.

İsa özü Əlinin lütfündən oldu mövcud,
Salis olan məvalid ondan görüb muradı.

Cümlə vücudə bais olmuş onun vücudi,
Var şiənin bu qövlə sidqilə e'timadı.

Heydər fəzilətini münkir gör etsə inkar,
Mən qoymaram ölüncə üstümə belə adı.

Molla Hüseynəli çün və'zü nəsihət eylə,
Qoyma ki, gümrah olsun bir belə bisəvadı.

Yoxdur əlində mayə istər dəlilü ayə,
Eynü yədü Xüdayə, çün yoxdur e’tiqadı.

Qərqi-zəlalət olmuş, pənd eylə ol fəqirə,
Çox etməsin Əlilən bu büğzü, bu inadı.

Çün Kə’bəteynəi-eşqim nəqşi məhəbbət atdı,
İnkari şeşdərindən zehnim alıb güşadı.

Ta etməsin digərbar fəzli-Əlini inkar,
Eylər bu fəzlə iqrar, dindirsən ərcəmadi.

Çün yürəfi buyurmuş Quranda mücrümə həqq,
Siması zahir eylər zatındankı fəsadı.

Cahil bilən Əlini Mahmuda münkir olmuş,
Var haqqa iştibahı qəlbi bəsi qəradı.

Nadan bilən Əlini nadanü rusiyəhdür,
Çün bilməmək Əlinin haqqında nasəzadı.

Çox simuzər məhəkdə qəşşi-büruz eylər,
Ol gündə kim havada eylər nida münadi.

Çün külli şeyün halik söylübdü cəm’ə malik,
Qasir olubdur salik, vardır əlində zadi.

## AĞA SƏMƏDƏ

Ağa Səməd, ey cavani-mö'təbər,
Guş elə bir nəzmidi bu müxtəsər.

İstəmərəm kim ola məqsud tul,
Yaxşı deyil bə'zi kəlami-füzul.

Bir özgə mətləb deyil mənzurumuz,
Hənuz vardır biləsən şüurumuz.

İstədim bir nüktə salam yadıva,
Söyləyəsən afərin ustaduva.

Ey üzü pakizə olan, qəlbi saf,
Xatirində var eylədin e'tiraf.

Qasirə tərtib edəsən bir külah,
Pəsənd edə, eyləsə hər kim nigah.

Qərarımız bu oldu, olsun dirab,
Vəzi-əmiri ola Mirzəyə bab.

Qitəsi xoş qütrü ola dilpəsənd,
Nə ola alçaq, nə çox olsun bülənd.

Bir də baxa, baxan deyə, mərhəba,
Layiqi-ləbbadəvü cübbə, əba.

## PÜNHAN HACI RZAYA

Ey dost, nəzər qıl, oxu zövq ilə bu fərdi,
Ta ayineyi-xatiruvun pak ola gərdi.

Napüxtə olur eyləmiyən seyrü səyahət,
Kim görmüyə yay istisi, həm şiddəti-sərdi.

Bir əhli-dili yox edə əhvalimi təftiş,
Ta xatirimin rəf ola qüssəvü dərdi.

Bu vəqtə kimi bilməmişəm mən behəqiqət,
Aləmdə nə növ'ilə olur şiveyi-mərdi.

Bu halətilə qarə mürəkkəb qələmi-sorx,
Yazdı sənə tə'cililə növ kağızi-zərdi.

Ev fikri salıbdır məni təşvişü xəyalə,
Lığü qamış amadə olub çatmadı pərdi.

Bu ərsədə nərradi qəza oldu hərifim,
Qoydu məni şeşlərdə xilaf oynadı nərdi.

Pərdi çatıb ev karı tamam olmasa, Qasir,
Ancaq bu zimistanda görər zəhməti-sərdi.

## MİRZƏ ƏBDÜLƏHƏD NÖVRƏSƏ

Ey bəzmi-iradətdə sözü doğru, özü pak,
Məzmuni-kəlami oxuyub bil, elə idrak.

Fe'li kişinin olmasa qövlinə mütabiq
Əql əhli deyərlər bir elə kimsəyə napak.

Bir ayrısı da var, o da həm surəti-Əzrəq,
Vardır iki çiynində iki mar çü Zöhhak.

Bu dairədə var gözü kor, əgri ağız həm,
Xınzirü-nərü maddə xərü xırs və həm lak.

Bir müftə filanə biri olmuş mütəssərrif,
Olmuş birisi ərməniyə sahibi-əmlak.

Bənzər biri heykəldə bilaşübhə kərazə,
Həm surətü sirətdə biri əntəri-çalak.

Eylüblə hücum üstümə bu qövmi-şəyatin,
Biri ox atır, birisi xəncər, biri fitrak.

Qanımı tökəllər ola fürsətləri bişək,
Nə Şümr, nə Xuli ola bilməz belə səffak.

Məndən ikisi eliyir də'vayi-torpaq,
Gahi biri dəvayi-dirəxt eyliri, gah tak.

Fəzl əhli görüb əhli-zəlalətdən əziyyət,
Güya belə tə''sir eyləyir gərdişi-əflak.

Billəm olacaqlar qəzəbi-Həqqə giriftar,
Nifrin edəcəkdir olara sahibi-lö'lak.

Tiri-qələmilə deşərəm çeşmi-əduni,
Bir zərreyi heç kimsənədən eyləmərəm bak.

Bir həcvlə sallam oların xərməninə od,
Bu narə davam etməz o qədrü xəsü xaşak.

Əzbəs ki olub helmü həya, Qasirə mane,
Bəs fitnəvü şərdən eliyir nəfsini imsak.

Axır nəfəsi mürşüd edər onları pamal,
Həm batini mövla edəcək sinələrin çak.

Dəndani-təmə bəndə çəkib əhli-zamandan,
Gənc üstə oturmuş yeyirəm mar kimi xak.

Bu qədr ki, vardır görürük əhli-vilayət,
Yoxdur biri etsin məni bir dəfə tərəbnak.

Hər kimsə gedib Məkkəyə gəlsə mənə ondan,
Xoşhaləm əgərçi yetə bir çübeyi-misvak.

Tənbaku qurtardıqca gəlir mən bilirəm, leyk,
Hər ayda gərəkdir bizə bir lüleyi-tiryak.

## MİRZƏ İSA SƏRRAFA

Dusta! Dostluq ayinəsi saf olmaqçün,
Və’dəmiz sidqü ya lafü kəzaf olmaqçün.

Bu neçə misranı yazdım, baxıb irad etmə,
Şe’rdə bəndə bu halətdə məaf olmaqçün.

Künci-fəqr içrə qoyub başımi zanüyi qəmə,
Bədənim tiği-xəyalətdə ğilaf olmaqçün.

Lazım oldu sizi məqsudidən etmək hali,
Haləti-xabigəhi və’də xilaf olmaqçün.

Eyləsin lütfi özün etdügün iqrarə görə,
Bəstərü balışü əvzayi-lihaf olmaqçün.

Hər biri olsa müyəssər o qədər vüs’ətdir,
Yarsın artıq əgər qalsa səcaf olmaqçün.

Qasirin məqsədi-əncami üçün etmə qüsur,
Bilmisən kim olub amadə məsaf olmaqçün.

## HACIYA

Ey bizim şəhridə, ey sahibi-dövlət Hacı,
Min kurur pul edə xaliq sənə qismət, Hacı.

Dövlətü malü məalun ola bundan əfzun,
Olasan sahibi-əmlaki-rəiyyət, Hacı.

Gərək öz isminə hər kimsə müsəmma olsun,
Zahirən belə deyib sahibi-hikmət, Hacı.

Bərəkallah, Hacı Ağa, evin olsun abad,
Cəm' edibsən mənə bu şəhridə hörmət, Hacı.

Biləsən mən deyiləm bir para adəmlərdən,
Puldan ötrü eliyəm mən sənə təbət, Hacı.

Bilmərəm hacı-macı, tanımaram buni-oni,
Bü hədü rəsmdi bil məndəki hörmət, Hacı.

Səni də saldım özüm kimi yaman əhvalə,
Eləməz meyl sənə bir kimsənə rəğbət, Hacı.

## BAKIDAN MƏKTUB

Gözüzdən, ey iki dildar, nur qayibdir,
Zebəs yolumda qalıb müntəzir, müqaribdir.

Bu tezliklə mənə qürbət eyləyib tə'sir,
Düşür təxəyyülə könlüm, vüsalə talibdir.

Dilimdən inçimiş olsoz, məni halal eliyün,
Ki, indi zikr eləyin ki, kirdkarə taibdir.

İki ənisü iki munisü vəfadarım,
Sizə dua eləmək mən qəribə vacibdir.

Ələlxüsus, vüsali-Səbihü Hümrayə,
Kamalü mehrü məhəbbətlə şövq qalibdir.

Əziz Nürəli, Nuşafərinü Bilqeysi,
Mənim yerimdə üzün hər kəs öpsə naibdir.

O gün ki, varid olub Badikubəyə Qasir,
Həmişə namə yazar Lənkəranə, katibdir.

Mənim iki büti-gülçöhrə sərv qəddlərim,
Qulaq tutun bu sözə, söhbəti-əcayibdir.

Soruşmuyun necədir halətim fərağızda,
Tutubdur dövrəmi qəm, qüssələr müsahibdir.

Canım yanızda qalıbdır xəyalü vəhm ilə,
Gəzər quru bədənim, bir misalı qalibdir.

Sizi, Güllüni, Səlimi, Səbihi, Hümranı,
Həmişə eyləyirəm arizu, münasibdir.

Salamat eyliyə xaliq Səlimi sizlər ilə,
Mənə salamatlıq ümdeyi-mətalibdir.

Əliəsğərü Leyla ilə Züleyxanın,
Üzün öpün, deməsinlər atası kasıbdir.

Nə bir cavab yazırsuz, nə bir pəyam gəlir,
Müdam müntəzirəm, haləti-qəraibir.

Düşər xəyalıma Hümra qızım, Səbih balam,
Onları görməyə qayətdə meyl rağibdir.

İlahi, səhhət ilə müğziyül-məram gedib,
Görüm əyalimi salim, böyük məratibdir.

## SEYYİD ƏZİM ŞİRVANİYƏ

Əssəlam, ey fələki-izzətə əxtər, Seyyid,
Yetdi namən mənə, ey yarü bəradər, Seyyid.

Tapacaq rütbə fələk etsə kəlamünlə tamas,
Fələki-lütfün ola olsa müqəər, Seyyid.

Yetdi namən mənə bir bəzmdə ol bəzm içrə,
Var idi bir neçə əşxasi-müsəddər, Seyyid.

Müztərib oldu könül namə səvadın görcək,
Deyəsən bəs ki, düşüb damə kəbutər, Seyyid.

Gah öpüb, gah basıb sinəmə, oldum xoşdil,
Qəlbə təskin yetişib, canıma cövhər, Seyyid.

Oxuyub naməyi hüzzarə dedim: güş ediniz,
Gör nə sözlər yazıb ağayi-süxənvər Seyyid.

Söz sənin, xətt Həmidin, nə’ti-tə’rif mənim,
Hamıya oldu bu mə’na mütəsəvvər, Seyyid.

Bu xüsusidə mənə yazmamış idin namə,
Ta tuta xamə çəkəm kağəzə məsdər, Seyyid.

Gər həqiqətdə mənə yazsa idin sən namə,
Həm cavab olmaz idi böylə müvəqqər, Seyyid.

Dörd nəfər şairi-bimisl çıxıb Şirvandan,
Olmuyub onlara bir kimsə bərabər, Seyyid.

Zülfüqarü Fələki, İzzəddinü Xaqani,
Hər biri sahibi-məcmuəvü dəftər, Seyyid.

Ey mənim taci-sərim, qibləgahım, sərdarım,
Nə mənə, bəlkə bu alimlərə sərvər, Seyyid.

Mən babam kimi yeyib buğda behiştdən çıxdım,
Barı sən ol belə şairlərə müzhər, Seyyid.

Necə ki, kağəzi-sabiqdə sənə yazmış idim,
Vəsfi-Bakuni əya Seyyidi-rəhbər, Seyyid.

Belə Baku ki, onun vəsfini etmişdin özün,
Onu vəsf eylədi bu Qasir-müztər, Seyyid.

Bilmədi ortalığa boylə ədavət düşəcək,
Əsəcək mehri-gülüstanına sərsər, Seyyid.

Baku şəhri atamın, ya babamın yurdu deyil
Ki, təəccüblə deyəm cənnətə bənzər, Seyyid.

Leyk insaf məqamında bəsi dayirdir,
Olmaz aləmdə belə xüttəvü bəndər, Seyyid.

Bakıya dövlətü ne'mət cəhətilə vardır,
Nəzəri-mərhəməti-xaliqi-davər, Seyyid.

Yoxsa guşişlə belə dövlətü ne'mət olmaz,
Belə dövlət tapılar dərhdə kəmtər, Seyyid.

E'tiqadın bu deyilmi görəcəkdir məxluq,
Həqqdən hər nə ki, olmuşsa müqəddər, Seyyid.

Bu qədər sə'ylə guşiş eləyir şairlər,
Çörəyin qət eləyib həzrəti-Heydər, Seyyid.

Mənə nə, gər ola Baku hamı gəncü gövhər,
Dola anbarlara buğda yerinə zər, Seyyid.

Sənə nə, şəhri Şamaxı ola gər mə"dəni-zər,
Puləki xüms kəsi minədəhəd[1] bər, Seyyid.

Gör bu əş'arlərim təb'inə küncidə deyil,
Bir beş-altı şahı ordan bizə göndər, Seyyid.

Hər iki kağıza təsrihü kinayət ilə,
Yazmış idin Baki əhlinə hamı xər, Seyyid.

Cümlədən bə'zisini etmiş idin istisna,
Özgə nəhv ilə söz olmuşdu müqərrər, Seyyid.

Caənil-qövm məgər Zeyd deyib nəhvilər?
Caənil-qövm məqər xər deməyibdir, Seyyid?

Necə kim nəhv kitabında deyib nəhvilər,
Çixmaz ol qaidədən xaricə axər, Seyyid.

Cins gərəkdir ola müstəsnayi-minhün cinsi,
Belədir qaidə, sərkari-mütəhhər, Seyyid.

Bakı şairləri bu nüktədən olcaq hali,
Oldu əhvalları bəs mütəğəyyər, Seyyid.

İstədilər yazalar şe'rinə bir özgə cavab,
Vuralar xırmanuva xişmlə azər, Seyyid.

Qoymadım, mən onların əzminə oldum mane,
Behəqi-zövqü səfa, zəmsəmü müş"ər, Seyyid.

Lənkaranə gedib ondan sora bu İsmail,
Ola bir müddət həmsöhbəti-Həcər, Seyyid.

Bu təəccübdü, deyirlər ki, qaçıbdır Qasir,
Xəlq arasında olubdur belə əşhər, Seyyid.

İndi bu vəqtdə hərifin qabağından qaçaram?
Bəs belə olsa mənim başıma küllər, Seyyid.

Şüəradə yox imiş qeyrətü namusü ədəb,
İt kimi bir-birinin əngini çeynər, Seyyid.

Bəndədən sonra Müsəvvir sizə yazmış namə.
Bir də həm Cürmivü, Mirzəyi Səməndər, Seyyid.

İndi gəl börkümüzü əyri qiyub düz danışaq,
Oturaq bəzmi-mürüvvətdə bərabər, Seyyid.

Bu nə sözlərdi yazıbsan mənə, ey biinsaf,
Etmisən xatirimi xeyli mükəddər, Seyyid.

Elədibsən məni sən həcv necə anlamaza,
Oxuyub hər biri bir nəğmeyi-şüştər, Seyyid.

Nə səbəbdən belə rüsvalığa oldun bais?
Necə qıydın vuralar şişəmə qənbər, Seyyid?

Niyə caldın itü qurd ağzına ə’zalarımı,
Niyə qoydun yazıla mətləbi-digər, Seyyid?

Bilmirəm, oldu necə qeyrətinə küncidə?
Əsb meydanına girsin necə əstər, Seyyid?

Bunların cümləsinin mənşəi sənsən əlhəq,
Gərək olsun sənə bu barədə keyfər, Seyyid.

Qasirə nanu nəmək mane olublur, yoxsa,
Səni Cövza kimi eylərdi düpeykər, Seyyid.

Leyk sən seyyidimizsən, necə eylüm səni həcv?
Deyirik biz sənə zürriyyeyi-Heydər, Seyyid.

Sən həqiqətdə əgər ali-peyəmbər olsan,
Məni də fərz elə Səlmanü Əbuzər, Seyyid.

Məgər övlad bəni-ümmətini həcv eylər?
Hansı məzhəbdə bu vardır, mənə göstər, Seyyid?

Xassə, ol kimsə ola ali-Əli mədddhi,
El söylərmış ona bəs şümri-sitəmkar, Seyyid.

Əcəb övladi-xələf oldun, üzün ağ olsun,
Az qalıbdır yıxasan ümməti yeksər, Seyyid!

Dadlı, duzlu səni bir yaxşıca həcv eylər idim,
Qorxdum azürdə ola xatiri-Cə’fər, Seyyid.

Burda, orda deyə əmim atamı həcv eləyib,
Bu da olsun bizə bir töhməti-digər, Seyyid.

Bunu bilməz, atası tazədən olmuş dəllak,
Qırx ağaclıqdan urur adəmə neştər, Seyyid.

Gəh məni bamilər üstündə edə qır verən,
Gəh padvalları eylər mənə bəstər, Seyyid.

Gah yazır, kim, səni tərpətdi mənim həcvim üçün?
Bilməyir həcv ola, yer-göy hamı titrər, Seyyid.

Müxtəsər, hər nə gəlib ağzına, söylübdü mənə,
Hara axir edəcək əmrini məncər, Seyyid.

Bu qalıb, qaşımıza vəsmə, gözə sürmə çəkə,
Götürə börkü, sala başıma mə”cər, Seyyid.

Bir qəbadən ötəri Şümrə edibdür təşbih,
Məni badam tək eləyibdi müqəşşər, Seyyid.

Nuri-didə, bu atan nəzmə çəkən sözlərdir,
Eləyibdir necə gör çərximi çənbər, Seyyid.

Burda vəsf etdiyi məşhur ricalı tanıram,
Edib onlara mübahati-təfaxər, Seyyid.

Biri əlhəq rəcil olmaqına yoxdu bəhəs,
Qalanın cümlə hesab eylə müqəşşər, Seyyid.

Ağadadaş bəy adı, leyk təxəllüs Nalan,
Hər könüllərdə olub mehri-müxəmmər, Seyyid.

Biri onun mehri edib, Qasiri yetmiş payına,
Şəhri-Bakidə çəkib səddi-Sükəndər, Seyyid.

O biri aqilü həm kamilü sahibdildir,
Xəlq ara mərtəbəvü izzəti-bərtər, Seyyid.

Əsədullahı da bilmərrə çıxar ortadan,
Xəsü xaşakə qarışmaz o güli-tər, Seyyid.

Əsədov aclıq ilində sənə olmuşdu dayaq,
Sadiqü Kazimü həm Əsğərü Əkbər, Seyyid.

Belə mə'lum olur aləmə, aşnan Əsədov,
Qıymaz öz canına bir danəyi sə'tər, Seyyid.

Gördüm Aslanını aslana həqiqət bənzər,
Sən görən vəqtdən olub xeyli şinavər, Seyyid.

Qoymadın başını girləndirə bu Qasiri-zar,
Ta ola hiylə ilə bəlkə təvangər, Seyyid.

Qoymadın məktəb açıb şövqilə tədris eliyə,
Ya ola hiylə ilə sahibi-minbər, Seyyid.

Birisindən ala pirahənü zircamə, qəba,
Birisindən ala bir şal, müşəccər, Seyyid.

Qoydun adını zərafət, mənə yazdın həcvi,
Ey olan həcvi-zərafətdə kələntər, Seyyid.

Gah məni mədh edib, eyləmisən gahi həcv,
Qatmısan bir-birinə zəhrilə şəkkər, Seyyid.

Sorğusuz qafilü məğmum necə şairlər,
Gedəcək cənnəti-məvayə səbüktər, Seyyid.

Onların cənnətə tez getməyinə bais olur,
Çün mülağatınız olarla olub əksər, Seyyid.

Ali-peyğəmbər olur ruzi-qiyamətdə şəfi,
Olacaqsan hamıya məlcəü-mə’bər, Seyyid.

Müxtəsəra üryan gələn vaqtə bizə, üstümüzə,
Sən gərəkdir çəkəsən üstünə çadər, Seyyid.

Seyyida, qəlbdə hər kim sənə düşmən olsa,
Düşmən olsun o kəsə saqiyi-kövsər, Seyyid.

Bu nədir, söyləmisən, yaz gilə, həcv eylə məni,
Mən ölüm, həcvini tez yaz, mənə göndər, Seyyid.

Bir məsəl türkidə: az yetmiri o ...verənə
Açmısan bir neçə dükkançeyi-misgər, Seyyid.

Baxsa hər kimsənə çeşmi-gəcilə ustadə,
Dideyi-batini həqdən olub ə’vər, Seyyid.

Gəl verək əl-ələ, nuki-qələmilə eliyək,
Düşmənin gözlərini kur bərabər, Seyyid.

Sənü mən, qeyrə görə əsrdə var şöhrətimiz,
Tapmarıq bir tikə Bəqravü Müzəffər, Seyyid.

Qeyrilər laşəvü cəmdək həvəsilə dolanır,
Mətbəxü məzbələvü məbrəzi iylər, Seyyid.

Bir sümük düşsə əlinə gəmirər, qalıqdır,
Tanıyır bu dəri, bilməz dəri-digər, Seyyid.

Belə fikr eyləmə kim, Qasiri-tədbirgüşa,
Ruzigarı eyləyibdir onu şeşdər, Seyyid....

## QAFİL ŞİRVANİNİ HƏCV

Ey olan, Şirvan ara məşhur Qafil, bihəya,
Həqqi inkar eyliyən mə'lunü cahil, bihəya!

Annadıq müstəğrəqi-bəhri-cəhalətsən yəqin,
Yox sənə heç vəchlə ümmidi-sahil, bihəya!

Hər ləğəb göydən olur nazil, bu möhkəm qövldür,
Gör sənə Qafil ləğəb göydəndi nazil, bihəya!

Qafilü aqil arasında olur bir nöqtə fərq,
Həqq səni bu nöqtə ilə etdi Qafil, bihəya!

Qəflətindən Qasiri-ustadə yazmışdın həcv,
Ya səni bu fe'lə şeytan qıldı mail, bihəya!

Qasirin bir zərbinə tab etmədin insaf ilə,
Yazmış idi biqərəz halizə şamil, bihəya!

Ol cənab Bakiyə yazdız bə'zi hərfi nasəza,
Mə''rifət əhli bilir ol qövli batil, bihəya!

Çün mülaqati-nəcasatilə Kür olmaz nəcis,
Müddəi qövlilə əksilməz fəzail, bihəya!

Yetmiş idi Lənkəranə Qasiri-şirin-süxən,
Lazım olmuşdu ona bə'zi məsail, biyhəya!

Vərnə rybəh həmləsindən şiri-nər etməz fərar,
Ver özün, insaflı ol bu qövlə adil, bihəya!

Hər qədər Cürmi, Səməndərlə, Müsəvvir sağdır,
Qoymarıq dursun sizə Qasir müqabil, bihəya!

Qəflətindən əhli qəflət qafil olmaz mütləqa.
Bixud ol Bixud kimi gah-gah ayıl, bihəya!

Gərçi, Bixud bə'zi söz ustada nisbət söylüyür,
Sən kimi çox hərzəgu olmubdi mail, bihəya!

Çünki Bixuddur, sənin tək mütləqa qafil deyil,
Görsənir onda həyadan bircə hayil, bihəya!

Böylə mə'lum oldu bixudluqda yazmış bu sözü,
Yoxsa olmazmış bu üç-dörd hərfə qail, bihəya!

Bixudun bu bir xətası var ümmidim əfv ola,
Olmuya axırda sən tək əqli zail, bihəya!

Mərhəba, Məzluma bax, elm öyrənib şair çıxıb,
Olmuş imiş bu neçə müddətdə Fazil, bihəya!

Bilmirəm kim eyləyib, irşadını olmuş müfid,
Həcv ilə yazmış neçə pəndü dəlayil, bihəya!

Adını Məzlum qoymuş leyk çox zalim dürür,
Həcv yetər sibqət edib hardan bu kahil, bihəya!

Bakıda Məzlum o qədrvar ki, aləm bilir,
Qalmıyıb sağ onda əzayi-əzafil, bihəya!

"Zərəbə Zeydun" yazıbdır səndə əlfazi-ərəb,
Eylüyübsüz bəhs təsrifi-əvamil, bihəya!

Şirvan cənnəy və ya Bakı cəhənnəmdür, qərəz,
Yoxsa da bir bəhrə bundan, ey siyəh dil, bihəya!

Bakıdan girəm Şamaxı şəhri artıq şəhrdir,
Ya Şamaxıdan böyükraq yerdi, Bayıl, bihəya!

Bir səbəblə Şirvan Bakudan artıqdır, bəli,
Çünki vardır orda bir sən kimi kamil, bihəya!

Həcv yazdın Qasiri-biçarəyə, ey rusiyah,
Bir belə bihudə sözlərdən nə hasil, bihəya!

Yazdığız həcvi məgər göstərməmişdiz Seyyidə,
Böylə olmaz rəsmi-məktubi-rəsail, bihəya!

Seyyidi-vala cənaba yazmamışdıq biz həcv,
Siz bizi vadar qıldız, həcvə sail, bihəya!

Siz kimi əclafilə hər kimsə etsə üfto xiz,
Əhli-mə’na söyləməz ol şəxsə aqil, bihəya!

Güyiya Seyyid Əzimə eybi yazmaq eybidir,
Onda var sadatlığından çox şəmail, bihəya!

Biz nə bürhanla ona övladi-peyğəmbər deyək,
Mürtəzadan onda var hansı xəsail, bihəya!

Ləğvi söylər, xumr içər, ruzə yeyər, qılmaz namaz,
Həqqidən iğmaz edüb, eylər təcahül, bihəya!

Siz məgər, Seyyid bilib görcək edərsiz e’tiqad,
Olsa hər bir kimsənin qurşağı yaşıl, bihəya!

Ali-peyğəmbər xilafi-şərə olmaz mürtəkib,
Xəlqə söylər daim övradi-məsail, bihəya!

Bu onun ali-rəsul olmağına etdi kifaf,
Ümməti vardır, necə siz tək zərail, bihəya!

Cürmünün bu sözlərini Qafila töviz var,
Hissə eylub boynuza eylün həmayil, bihəya!

Ruzi-məhşərdə sizinçün nameyi-ə'məl ola,
Keçməyə boynuza ğüllü-ğəlasil, bihəya!

Qafila, bu nəğməvü bu xarici ahəngilən,
Zümreye ərbab sövtə olma daxil, bihəya!

## ŞİRVANŞAH TƏXƏLLÜSLÜ ŞAİRƏ

Bu gün almış birisi dəstinə bir xamə yazıb,
Götürübdür mənə bica yerə bir namə yazıb.

Mən sizə yazmışdım bu sözü, Şirvanşaha,
Bir kəlamı mənə dəstüzə alıb xamə yazıb.

Nə ki, bir qeyrisi adını qoyub Şirvanşah,
Götürüb bir təbəqə kağıza Şahnamə yazıb.

Sözləri ləng təmamən, hamısı ləğü, cəfəng,
Bilmirəm kimdü bu, hardan gəlib əyyanə yazıb?

Məkkədən tazə peyğəmbər kimi bir dibaçə,
İstəyib Kufəyə yazsın, götürüb Şamə yazıb.

Gözü görmüb, yazıb imla ilə inşani qələt,
Görəsən ya ki yazanda düşüb axşama yazıb.

İqtibas etməyə sizdən bu idi xahişimiz,
Bir neçə puxtə kəlamı bu rəviş xamə yazıb.

Yoxsa bir qeyri gəlib bir neçə əfsanə süxən,
Mürği-zirək tək özün yaxşı salıb damə yazıb.

Belə əfsanə deyən görməmişəm aləmdə,
Məsələn, pirəhən istər yaza, zir-camə yazıb.

Oxuyanda sözü oxşar sözə, amma görünür,
Səhvi var börki çarıq, başmağı əmmamə yazıb.

Bu qədər əqlü şüur ilə lüğati-ərəbi,
İstəyir hərfi əvamı götürə, ramə yazıb.

Xalqı eyzən vələdil-heyd zinazadə bilib,
Özünün şübhəsi var, boş yerə həngamə yazıb.

Üləmalar bu sözü əksinə eylüb tə’bir,
Xassə bir nükteyi bu bəhsidə əllamə yazıb.

Bir qulaq burması, Qasir, sənə vermiş söz ilə,
Yetirib şiveyi-tədibini itmanə yazıb.

## ŞİRVANŞAH TƏXƏLLÜSLÜ ŞAİRƏ

Ey mənə namə yazan şəxs, rəfi-üd-dərəcat,
Payeyi-fəhmuni-nəzmün əcəb eylübdi sübat.

Yazdığın nəzmi-tərəhhati təmamən oxudum,
Bəli, öl, qalma bu dünyada, utan, bir yerə bat!

Bu nə sözdür oxuyan vəqt töküldü ətimiz,
Belə söz kürdü xələc söyləməyübdür, nə də tat.

Mərhəba, şairə bax, söz danışıb şe’r deyib,
Nə yamanziri-zibildi, süpürüb yığ, çölə at.

Biri uzun, biri qısa, biri əyri, biri düz,
Biri yumru, biri enni, biri olmuş iki qat.

Dövni tərkibüvi əş’arüvə təşbih edərəm,
Görürəm elmi-fərasətlə səni mən lütü lat.

Dəxi bundan sora, yazma belə əş’arı mənə,
Yetməyib həddi-nisabə əməlün, vermə zəkat.

Mütləqa, söyləməyib bu sözü Şirvanşah,
Qədhi edir başdan ayağa hamısıləğviyyat.

Niyə bica yerə saldın özünü məhlükiyə,
Dəxi bundan sonra, yoxdur sənə bir rahi-nicat.

Sözlərin xamidü çox, çox mənə biganə gəlir,
Aşina sözlərinə oxşamır əz hiç cəhat.

Niyyətin Kə’bəyə getməkdü və lakin görürəm,
Şahi-rahi itiribsən, qedirsən rahi-Herat.

Belə mə'lumdu, əş'arə varındır həvəsin,
Gəzisən təşnə ki, bəlkə, tapasan abi-Fərat.

Bir deyən yoxdu bu bica danışan kimsələrə,
Kişi, bihudə danışma, yerini yastıla, yat.

Qoymusan adını Şirvan şahi, qəsdin budu kim,
Oxuyan kimsə o əş'arə çevirsin salavat.

İtü qurd ağzına düşmüş necə gör şairlik,
Hər başı daşlıgəlib şair olubdur, həzərat!

Annamaz qafiyəvü səci rədifi bilməz
Ki, nədir şe'rü qəzəldə hərəkatü sükunat.

Bu təəccübdü deyir: bəhri-əruzi bilirəm,
Fəilatun, fəilatun, fəilatun, failat.

Mən ki, Şirvanşahidən istəmişəm şe'rü kəlam,
Özü bir şairi-zirək, sözü şirin kəlamat.

Tutub ovsafi-kəlam bu zaman yeksər,
Onda vardır neçə tə'rifü neçə niki-sifat.

Arifü kamilü şirin süxənü danadır,
Zülməti xətti ara, zahir olub abi-həyat.

Aparıbsan bu nədir şe'ridə Qasir adını,
Hələ gəl sən mənimlən şe'rdə bir payəyə çat.

Qasiri mən tanıram, şairi-şir əfkandır,
Həddini bil, sən onun sürmə bu meydanına at.

Sürə filin, çəkə fərznin əgər göstərə rux,
Pa piyadə eliyər ərsədə bil şahuvi mat.

Ağzına hər nə gəlibdür demisən, biçarə,
Dilinə hər nə gəlibdir demisən, həzyanat.

Görə hər kim o kəlamı, o xəti elə bilür,
Dəvə qarnı deşilibdir, tökülübdür içalat.

Mərd özündən bilu, namərd də yoldaşından,
Tutmayın özgə adın, yaxşı deyil, bu hərəkat.

Bir də gər, Qasir adın şe'rdə etsən zahir,
Çox cərimə çəkəcəksən, olacaqsan vinəvat.

Hər sözün var isə yaz qayibə göndər gəlsin,
Qasirin qiybətini eyləmə, var bunda nükat.

Yenə Şirvanşahın qeyrilə yoxdur karı,
Bu səbəbdəndir, yetişmir ona hərgiz sədəmat.

Yazmısan türki, gəhi farsi, gəhi ərəbi,
Bilməmiş illəti ahadi yazırsan həşərat.

## TAĞIYA

Ey əzizim, ərcüməndim, rasti-fərzəndim, Təqi,
Ey ənisim, munisim, fərzəndi-dilbəndim, Təqi.

Atəşi-hicranın içrə oldu cismim çün risas,
Surəti-əhvalimə eylər təmaşa amu xas.
Məhbəsi-qəmdən məni bu ruzigar etməz xilas,
Etmə bari qət'i-ülfət, baqi olsun ixtisas,
Ey vəfa bağında bir sərvi-bruməndim, Təqi.

Bil səni yaddan çıxartmaz mürşidi-sahibnəfəs,
Yoxdu mənzuri onun səndən səvayi heç kəs,
Yaxşı diqqət qıl əsəldə qalmasın payi-məkəs,
Tərki-əhbab eyləyib dünyaya çox salma həvəs,
Gər qəbul etsən, sənə əzzəl budur pəndim, Təqi.

Sinnü salin azdu, bə'zi kardə mə''zursan,
Zövqin artıqdır, vəli, başdan-ayağa şursan,
Fikri-batil eyləmə, zahirdə məndən dursan,
Sən mənə gər istəsəm hər halidə mənzursan,
Munisim, yarım, rəfiqim, xişü peyvəndim, Təqi.

Naleyi-bülbül yetər hər sübhi-gülşəndən mənə,
Mən özüm billəm nə halətdir yetir məndən mənə,
Sən həmin izhari-ixlas etgilən gendən mənə,
Hər zaman xoş xəbərlər kim yetər səndən mənə,
Binihayət şad olur bu qəlbi-xürsəndim, Təqi.

Bir də düşsəydi əgər vəslün mənimçün ittifaq,
Çəkməziqim bir də hərgiz naləhayi-əlfəraq,
Tiği-hicrün rişteyi-səbrimi qılmış taq-taq,
Canüvə olsun qəsəm Qasirdə çoxdur iştiyaq,
Yox adundan qeyri hərgiz özgə sovkəndim, Təqi.

Bu zaman əndişeyi-batil mənə həmrəng olub,
Şişeyi-qəlbi-zəifim həmnişini-səng olub,
Tovcəni tə’bim dəxi kirdar etmir, ləng olub,
Qafiyə bu vəzndə çox fikr qıldım, təng olub,
Sən bilirsən, yox rəməl bəhrində manəndim, Təqi.

Ruzigari-dün əlindən bəd keçər əyyamimiz,
Zülfi-dilbər tək olub aşüftə sübhü şamımız,
Bəlkə, xaliq lütf qılsun xeyr ola əncamımız,
Kaş vəslünlə oleydi bir də şirin kamımız,
Ey mənim noğlum, nabatım, şəkkərim, qəndim, Təqi.

## TAGIYA

Genə fərzəndi-əzizim, Təğiyi-şəhzadə,
Təbim olmuş bu rəviş nüktələrə amada.

İştiyaqin mənə bir növ ilə olmuş qalib,
Nə olur həddi müşəxxəs, nə gəlir edadə.

Gər sənə varisə, ixlasi iradətdə qüsur,
Var mənim mehri-məhəbbət sənə fövqüladə.

Neçə müddətdi demirsən necədir Qasiri-pir,
Budu qəsdin ki, gələm mərhələyi-iradə.

Yetişib guşimə kim, vəqti təqazasilə,
Tərk edib Bəsrəni köç eləmisən Bağdadə.

Bizə Seyyid Hüseyn ağa bu zaman qoysa məhəl,
Görəsən hansı zamanı salacaqdır yadə?

Biz ilən, munisü, həmsöhbətü həmməşrəb idi,
Niyə həqqi-nəməki, bəs verib indi badə?

Girmisən daireyi Seyyid Hüseyn ağayə,
Biz də bir vaxt varıdıq məhrəm ol məvadə.

## MOLLA ƏHMƏD FAİZƏ

Faiza! Bizdən nə cürmü, nə xilaf olmuş sizə
Kim cavabi-namə yazmaqlıq maaf olmuş sizə?

Yavərim, alicənabım, qibləgahım, sərvərim,
Yaz görək, bizdən nə təqsirü günah olmuş sizə.

Biz duagulər bozorgü xord, ünasü ya zükur,
Niyyəti-ixlasımız sidqilə saf olmuş sizə.

Namələr yazdım peyapey, heç birindən yox cavab,
Kim nə illətdən məzaci-inhiraf olmuş sizə?

Ya edibsən ixtiyari-inziva Simurğ var,
Badikybə qələsi bir kuhi-Qaf olmuş sizə.

Hər qədər qıldım təfəhhüs nə xəbər var, nə soraq,
Hansı məscid guşəsində e’tikaf olmuş sizə?

Cümleyi-müxlislərüzdən biz də məhsub olmuşuq,
Nə səbəb var bizlərə əzmi-məsaf olmuş sizə?

Bəzmi-ixlasü iradətdə bizük əvvəl mürid,
Bu cəhətlərdən həmişə e’tiraf olmuş sizə.

Mehrigüstər, dostpərvərlikdə bəs mö’tadsüz,
Xulqi-xoş, övsafi-dilkəş, ittisaf olmuş sizə.

Cins ara şəmşiri-hicrün qət edüb hər üzvümi,
Tiği-mehrün çəkmə çün cismim ğilaf olmuş sizə.

Biz sənə etdik vəfa Misrində Yusifdən qiyas,
Elə bildük əsl qiymət bir kəlaf olmuş sizə.

Barı bundan sonra hər bir əmrdə müxtarisən,
Annadıq hər xidməti etsək kəzaf olmuş sizə.

Yazgilən, mə'lum qıl, göstərgilən isbat elə,
Hər yaman əxbar bizdən telqiraf olmuş sizə.

Hansı xidmətdür bizi əncamına etdün ricu?
Fe'limiz batil, sözümüz kizbü laf olmuş sizə.

Rişteyi-hübbünlə Qasir tarü pudi-cismini,
Ruzü şəb müstəhkəm eylüb şe'rbaf olmuş sizə.

## MOLLA ABBASA

Molla Abbas, əgər yox sənilə ülfətimiz,
Leyk vardır, sizi görməklik üçün niyyətimiz.

Bilirəm sən də məni görməyə varsan müştaq,
Heyf kim, yoxdu bizim sən bəyənən söhbətimiz.

Bəs ki, ovsafını təqrir eyləyib Əbdürrəhim,
Bu səbəbdən bizim artıbdı sizə rəğbətimiz.

Dedi var təbi' filanın, oxudu əş'ardan,
Şükr elə xaliqə kim, vardı əcəb sən'ətimiz.

Bə'zi yerdə şüəra gərçi olubdur məğmum,
Şivəyi-inni min əşşər olub hikmətimiz.

Gah Məhzun təxəllüs olusan, gah Abbas,
Görcək əbyatını bərəks olur işrətimiz.

Latəsənni ki, Nəbi qoludu illa salis,
Qoygilən ayrı təxəllüs sənə var minnətimiz.

Həm rədifi düz elə, qafiyəni söyləmə kəc,
Şairtək söz deməyə vardı bizim cür'ətimiz.

Lənkəranı eləyibsən özünə sən məskən,
Mülki-sərhəddünə vardı bizim üzlətimiz.

Nə rəfiğ, nə müsahib, nə ənisü nə cəlis,
Ömr bica yerə sərf oldu, hanı dövlətimiz?

Nə əcəbdür ola bir yerdə münəccim çaqqal,
İnşaallah, günü-gündən ücalır şövkətimiz.

Yol açıq, ərzdə vüs’ət, dizimzdə qüvvət,
Var getməgliyə qudrət, yoxmuş himmətimiz.

Əbəvi xıdmətinə bizdən eylə ərz salam,
Olur, əlbət ki, ola vəsli onun ne”mətimiz.

Vasifin xülqi əgər zimmeyi-movsufə düşər,
Qasirəm, bircə qədər tənbəkidir ücrətimiz.

## MOLLA FƏTTAHA

Molla Fəttah, ey matan molla,
Mollalar içrə şarlatan molla.

Gah olan şeyx, gah mərsiyəxan,
Gah qamış, gah odun satan molla.

Kəsb edirdün, nə xoş zamanlar idi,
Palçığa-ləhməyə batan molla.

Eylə kəsb eyləsəydün, indi sənə,
Yox idi pulda bir çatan molla.

İndi hər sənətə vurursan əl,
Bir həya eylə, bir utan, molla.

Mollaların adını pəst etdin,
Başladın özgə dastan molla.

Mollaya bə’zi iş deyil layiq,
Olma hərcayi çün natan molla.

Şeyx tarmanə olmuş idi mürid,
Çərçə əhli-Ərbatan molla.

Sən də cəhd et, mürid yığ başıva,
Onlara söylə dastan, molla.

Səni cəm’ içrə xəlq görsə deyir,
Qoşulub ördəyə qutan, molla.

Yemisən bəs ki, sıf, çəpaqü çəki,
Qalmış adın balıq utan, molla.

Yay zamanında yun libası geyən,
Qış zamanı geyən kətan, molla.

Sənə nifrin edir pulun yemisən,
Güdə Seyyid qalıb lütan, molla.

Öz əlilə cəhənnəmin içinə,
Özünü gurpadan atan molla.

Eşidən vəqtə molla Fəttah adın,
Ağlaşır əhli-Xarxatan molla.

Sənə bu sözləri yazıb Qasir,
Molla Fəttah, ey matan molla.

## NƏCƏFƏ

Ərzimə eylə nəzər, ey niku mərdi-rastbin,
Ey cavanmərdü səxi, xoşe'tiqadü pakdin.

Ol zaman kim, Lənkəran mülkünə etmişdin səfər,
Şamil olmuş halüvə taəti-rəbbül-aləmin.

Bir neçə əşxaslan oldun müsahib, həm rəfiq,
Bə'zi nəfsi xərmani lütfindən oldu, xuşəçin.

Xələtü pulilə qıldln mən fəqiri-sərəfraz,
Kim duagü sənəbu Şeyx Zeynəlabdin.

İsmi-pakündür Nəcəf, qurban ismi-paküvə,
Çün Nəcəfdir, mədfəni-paki-Əmirəlmöminin.

Çün bilmirəm hər qəsdlə xoşnud qıldın sən məni,
Eyləsin xaliq səni peyğəmbər ilə həmnişin.

Var bizə bir mürşidi-şair, özü sahibnəfəs,
Nəfsinə səd mərhəba, təb'inə yüz min afərin.

Gər özü Qasirdi, amma yox kəlamında qüsur,
Nəzmlən inşa edibdü bir kəlami-nazənin.

Hər vücudi dəhridə şayəstəyi mədh olmayıb,
Eylə mədhi kim, ola hər lütfi bir dürri-səmin.

Dəhridə hər kimsə gər bir nəfsi əhya eyliyə,
Ruzi-məhşərdə olur girdarı bir həblülmətin.

Daima rövşən olur qəlbi bəsani afitab,
Olsa hərbir şəxs üçün zahir əgər rahi-yəqin.

Qəlbi-pak istər ki, onda nəqş ola təsviri-həqq,
Lütfü şe'rində ola zahir dəmi ruhül-Əmin.

Hər dəniyi-süflə olmaz dövlətilə nikinam,
Hər xəsisü təngi çeşm olmaz, səadətlə qərin.

Şəmməyi-əxlaqi övsafdan etdi şeyx gər,
Yazdı Qasir, nüktə vallahi xeyrürraziqin.

## MİRZƏ MƏŞHƏDİ ƏLİ ƏKBƏRƏ

Əya, əziz niku xülq xoşxisal, ey dust,
Ləbibü aqilü hüşyarü əhli-hal, ey dust.

Nə vaxtdır, neçə müddətdir iştiyaq ilə,
Edərdim arizuyi-ne"məti vüsal, ey dust.

Necə əziz ki, bəh-bəh adı Əli Əkbər,
Bu əsrdə ona yox türfə bir misal, ey dust.

Təbibü arifü-fərxündarəyü niksiyər,
Həmi də xisləti xoş, rə'yi nikhal, ey dust.

Zərifü şuxü qəzəlxanü dilbəri-xoştəb,
Bu dəştidə gəhi səyyadü, gəh qəzal, ey dust.

Yetib vicudimə hicrində inqilabi-məzac,
Təbiətimdə dəxi yoxdur e'tidal, ey dust.

O günləri ki, vüsalınla var idim mə'nus,
Yox idi məndə qəmü qüssəvü məlal, ey dust.

Qəribə tərk elədin bu rəfiqü əhbabı,
Nə tərk eyləmisən, bəlkə payimal, ey dust.

Zəif edibdi fəraqın məni bu qayətdə,
Görən müayinə söylər mənə hilal, ey dust.

Əgər nəzər eləsən dideyi-məhəbbətlə,
Edər bu namə sənə kəşfi-şərhi-hal, ey dust.

Və gər bu növ iman ilə qanımı tökəsən,
Ana südü kimi olsun sənə halal, ey dust.

Təvəqqüf eyləmisən çün bu qədr Bakuda,
Yəqin müraciətinə yoxdur ehtimal, ey dust.

Əcəb aralığa bir sədd çəkmiş İskəndər,
Qərəz nə Rüstəm onu pəst edər, nə Zal, ey dust.

Yetişdi Molla Həsən, ol müridi-xoşməşrəb,
Hekayət eylədi səndən, necə məqal, ey dust.

Açıb yəmin sənin kimi dost haqqında,
Nə xoş olu ki, mənimçün aça şimal, ey dust.

Nə hüsndür Həsəni-xoşlıqa edib ehsan,
Tökübdür dürc-dəhəndən bəsi ləal, ey dust.

Səni o halət ilə kim görüb, olu şakir,
Deyər ki, həqq verib dusta Calal, ey dust.

Bu pir mürşid üçün mayeyi-təşəkkür olub,
Cavablar mən edən vəqtidə sual, ey dust.

Olubdu qövli-Həsən çün mühərrikitəb'im,
Fəda o dosta ki, var sahibi-kəmal, ey dust.

Edibdi natiqeyi-təbi-gövhər əfşanlıq,
Açıb təzərvü kimi beylə pərrü bal, ey dust.

Belə müşəxxəs olur kim, səni müqəyyəd edib,
O sərzəmində bir cilveyi-cəmal, ey dust.

Tapıbsan orda məgər həmcəlisü sahibi-zövq?
Bizi fəramuş edib, etmisən xıyal, ey dust.

Dəxi nə nüktə yazım, dəxi e'tibarım yox,
Xüsusən ömrə yetər günbəgün zaval, ey dust.

Olubdu Qasiri-dilxəstə natəvanü əlil,
Nə növ ilən edə dəviyyi-xəttü-xal, ey dust.

## KNYAZA

Knyaza oxu bu sözü, ey dost, müsəlsəl,
Ondan olacaq mən bilirəm, müşkilimiz həll.

Çünki nücəbada olu peyvəstə səxavət,
Heyhat, hər ağacda ola xasiyyəti-səndəl.

Bu sözləri bihudə hesab eyləməyün siz,
Məzmununu Knyaza deyib etmə müəttəl.

Yüz danə balıq xahiş edib Qasiri-şair,
Qoymun düşə ortalığa bica yerə əngəl.

Hər kimsə mənim mətləbimə versə əgər yel,
Ağzı əgilər, boynu sınar, qıçı olar şəl.

Bir şəmi'lə əhbab məni eyləsə razı,
Xoşdur ki, əgər yandura bir qeyrisi məş'əl.

Bu tezliklə balığı göndərgilə gəlsün,
Mürşüd eyləyüb boynuza vəlmahı müdəlləl.

Bir belə sözü gərçi Nəzərbəyova yazsam,
Billəm kim, edər balıq işini mənə əshəl.

Mürdab ona, knyaza Kələdəhnədü məxsus,
Qoymun balığın vəqti ötə, iş qala möhmək.

Tez gəlməsə balıq, çıxaram cəngə sizlə,
Qasir durub amadə, qılınc əldə mükəmməl.

Hər həftə sizə şe'r yazıb göndərirəm mən,
Qoymun mənim, əlbəttə, dəmağım ola müxtəl.

Fürsət yoxdu yazmağa, söz müxtəsər oldu,
Bundan sora yazsam, yazaram şərhi müfəssəl.

Bayram yetişir, tazə libas istər uşaqlar,
Hər biri verir ayineyi-qəlbinə seyqəl.

Birsi papaq istər, biri başmaq, biri çuxa,
Biri baharı, birisi arxalıqi məxməl.

Eylüb məni aşüftə bu günlərdə xəyalat,
Bir kəlmə ki, əhvalım olubdur mütəqəlqəl.

Bu halətilə şe’r demək xeyli çətindir,
Nə zövq ola əşa’rə, nə yazmağa yarar əl.

Tezliklə balıq gəlsə, dəmağım ola şəngül,
Qəm-qüssəm olur şadlığa cümlə mübəddəl.

## MİR İBRAHİM BƏYƏ(N)

Mir İbrahim bəy dustiniku məhzəri-mən,
Eşitmişəm ki, sizin vardı qələmgahi.

Lətifü naziku şirinü həm tərü tazə,
Olub lətafətdən böyrü üstə rəm gahi.

Ki, vardı çün bizim həmsayəlikdə bir bagı,
Əkiblər, orada necə-təzə həm gahi.

Eni on iki sajındü, uzunu əlli sajın,
..............................................................

Təhavül eyləmişik çox lətifi nazikdir,
Odur bunun kimi bu Lənkəranda kəm gahı.

Bəyin evundə dünən bə'zi söhbət eylərdik,
Olurdu digər aralıqda dəm bədmə gahı.

O qonşu gahısını mən də eylədim tə'rif,
Dedim zəmanədə yox belə möhtərəm gahı.

Üzümə baxdı mənim tünd Məşədi Nəccar,
Dedi: Qadam yemisən yəqin hələm gahı.

O gahılar ki, yeyibsiz ələf-üləfdü, balam,
Mir İbrahim bəyi gör istəyiz bu dəm gahı.

Rəfiqimiz belə bir bostan gahı əkib,
Edib hər tini bir gülşəni-irəm gahı.

Qəribə nəzmilə gahılara verib tərtib,
Qoyubdu bir-birinin üstə qədəm gahı.

Birisi çətr çəkib başı üstə çadır tək,
Biri havaya çəkib başçün ələm gahı.

## MƏHƏMMƏDƏLİ BƏY MƏCRÜHƏ

Ey qüssəvü qəmdən ürəyi xali, əzizim,
Xalq içrə olan mərtəbəsi ali, əzizim.

Yüz dərd yaxamdan yapışıb, hər biri bir dağ,
Agah deyilsən eyləyibdir məni tapdaq.
Oldur biri dustağ olub sahibi-şəllaq,
Olmadı eşidən bizə asari-çürük sağ,
Mə'lum olunur var yenə əşkalı, əzizim.

Şuşidə idim namə-pəyamın mənə gəldi,
Ol əmrə dedim mən də cavabı sənə gəldi,
Seyr eyləmədin qoymadı şövqün yenə, gəldi,
Dam içrə düşüb mürği-xəyalın dənə, gəldi,
Sındırmayasan barı pərü bali, əzizim.

Fəryad fələkdən çəkən əfqan qocalıqdan,
Zalım, niyə etdin yenə tüğyan qocalıqdan,
Can xof elədi incidi canan qocalıqdan,
Vurdun elə kim zəxm gəlir qan qocalıqdan,
Dil mürğünə duyğun kimi çəngali, əzizim.

Mən də deyə billəm bir elə söz sənə canım,
Amma demək olmaz o sözə döz, sənə canım,
Qoyma ciyər üstə deyirəm göz, sənə canım,
Allah verib əql, belə göz sənə canım,
Həm görmək üçün bilməyə ə”malı, əzizim.

Gəl mürğü xanə ilə minnət, səni-Allah,
Bəlkə verə bir lütf ilə rüxsət, səni-Allah,
Qaldıqca gəlir əlliyə töhmət, səni-Allah,
Bəsdir bu qədər çəkdiyi zəhmət, səni-Allah,
Bəlkə yatırıq biz bu rəviş lali, əzizim.

Bilməm bu nəçün kor kələ tək birdən atıldı,
Silkindən ötüb firqeyi-bədzata qatıldı,
Elat da varı kimi baş-başa çatıldı,
Meydana girib sövi-kəsafətdə satıldl,
Bildin necə usta idi dəllalı, əzizim.

Eyb eyləmə gördün kişinin halını mübhəm,
Tutmuşdu ishal ol tutulan gün onu möhkəm,
Tez-tez yügürürdü qayanın altına hərdəm,
Söylərdi Cavada məni əldən salıb ənsəm,
Sən gör nə kələkdir ola gör halı, əzizim.

Molla kişidir xidmətə amadəsi yoxdur,
Təsbeyi itib möhrilə səccadəsi yoxdur,
Sağər tühi dəstində qalıb badəsi yoxdur,
Təbində sovuqluq hanı ruxsadəsi yoxdur,
Qasir neləsin çal ilə dükkalı, əzizim.

## MƏHƏMMƏDƏLİ BƏY MƏCRUHƏ

Sənə, ey pədərim, bu iki sözü,
At başı göndərdim Ağa Muraddan,
Neçə gündür, xidmətinə gəlmirəm,
Bəlkə, çıxarmısan bizləri yaddan.

Könlümdə çox vəhşət, çox əza olub,
Mənə zəmanədən yüz cəfa olub,
Tazə Kərbəlayi bivəfa olub,
Doğrusu, düşmüşəm mən, e'tiqaddan.

Yenə sənə deyim, qoy bari dərdi,
Sənsən zəmanənin mərdanə mərdi,
Hərçəndi çəkirəm bəxtimə nərdi,
Möhreyi-taleyim çıxmaz kasadan.

Gedir Gülüstana xəyali-ruhun,
Görəsən necə oldu məskəni Nuhun,
Derlər var Qasirə lütfi Məcruhun,
Həqiqət, dilşadam bu quru addan.

## AĞA MƏHƏMMƏDƏ

Guş eylə, ey rəfiqi-xoruzbazı Qasirin,
Ey mumiyayi-xatiri-nasazı Qasirin.

Ağa Məhəmməda! Bu müşəxxəsdü bəndəyə,
Səndən olubdu hörmətü e'zazı Qasirin,

Səndən savayı hər yana baxdım görunməyir,
Həmrəngü həm əqidəvü həmrazı, Qasirin.

Düşmüş iraqü şuri dəxi pərdədən kənar,
Tarü kəmançavü neyü həm sazı, Qasirin.

Başdan gedib şüuru dəxi eyləyib nəva,
Dər həm olub müxalifü şəhnazı, Qasirin.

Gahi ərəb-əcəm kimi qəsdi-hicaz edər,
Gah fikr edər, səyahəti-Şirazı, Qasirin.

İtmamə yetdi ömür açıb qol-qanadını,
Aya, nə canibə ola pərvazı, Qasirin.

Hər nə yetirsə kim, sənə xəllaqi-qeybdən,
Olsun həmişə çoxu sənin, azı Qasirin.

Olmuş çu çilvəgah cəmali Məhəmmədi,
Bu qəlb pak ayinə pərdazi Qasirin.

Əfsus kim, qəbavü əba başa gəlmədi,
Ta kim ola dəlilü sərəfrazı Qasirin.

Ərbabi-mə'rifət bu sözə eylər e'tiraf,
Lazımdı, bu zaman çəkilə nazı Qasirin.

Əlbəttə, aşina dilini aşina bilir,
Avaz sahibin tanır avazı Qasirin.

Əyyam edibdü gülşəni-ömrim payimal,
Bir çarə yox xəzanə dönüb yazı Qasirin.

Bilməz kişi bu sözləri sahibdil olmasa,
Naəhlə hərgiz olmuyub ibrazi Qasirin.

Bəs natəvan olubdu, qalıbdı şikaridən,
Etməz kəfaf tö'meyi-şəhbazi Qasirin.

Cümlə qüvva zəif bədən natəvan olub,
Dəxi düşübdür baltasının pazı Qasirin.

Yox pulu malü dövləti, mülkü ziraəti,
Guş et, bu mətləbə ola ağazi, Qasirin.

Ancaq varidü bircə danə ları xoruzu,
Bundan səvayı yoxdu pəsəndazı Qasirin.

Molla Həsən də çox bəyənibdür həqiqəti,
Söylər ki, var nəhəngi-cədəlbazi Qasirin.

Həm daş pipikdü, saqqalı yox, dimdiyi uzun,
Guya ki, var bədəndə iki qazı Qasirin.

Başdan kiçikdü, sinəsi gen, qaşları yoğun,
Guya ki, var dükançeyi-xəzzazi Qasirin.

Mənlən savaşdı, saxlama ac, çox arıqdı bu,
Yoxdur məgər ki, gəndümü xəbbazı Qasirin?

Arpa olub bir abbasi, altı şahi çörək,
Ya rəbbi, qoyma, zahir ola razi, Qasirin.

Bir gaz vurubdu gör necə həqqi-Səlimidə,
Dərviş tək əgər tuta gazi Qasirin.

## NƏ YAZIM

Bilmirəm mən sənə, ey sahibi himmət, nə yazım?
Eyləyim bir neçə əhvalıva diqqət, nə yazım?

Bilüsən var sənə ixlas dəryalaricən,
Xalq arasında tapıbdır belə şöhrət, nə yazım?

Zikrdən etməmişəm heç fəramuş səni,
Tanımışdım səni mən əhli-mürüvvət, nə yazım?

Vermişəm gah-gəhi mən sənə bə’zi zəhmət,
Əvəzində yetəcəkdir sənə rahət, nə yazım?

Etmişəm mən sənə peyvəstə məhəbbətlə nəzər,
Görmüşəm səndə var asari-fütüvvət, nə yazım?

Həqq bilir, olmamışam zərrəyi-bədgüy sənə,
Xah zahirdə və ya kim ola qeybət, nə yazım?

Ya vəfa etmisən öz əhdüvə, ya etməmisən,
Gər gəlüb başa və ya gəlməyüb ol vəxt nə yazım?

Ya həqiqət səni mən tanımış idim bir şəxs,
Ya həqiqət yoxumuş, məndə fərasət, nə yazım?

Hər nə söz bəndədən olmuş sizə sadir, əlhəqq,
Sizilən etməmişəm heç zərafət, nə yazım?

Ərdəbildən mənə hər gündə gəlir bir kağız,
Yetişür xatirimə xeyli küdurət, nə yazım?

Gözləyir yol, mənə xərclik gələcək Mirzə Səlim,
Etdi ağayi-Məhəmməd ona hörmət, nə yazım?

Bir siyahı özü yazmışdı cənabi-Ali,
Eyləmişdi nə qədər lütfü şəfəqqət, nə yazım?

Zikr etmişdi neçə şəxsin adın kağızda,
Hamısı müxlisi-can sahibi-dövlət, nə yazım?

Bir qəribə ola gər ata-babası məchul,
Əllisi pul verir, on beşi xəl'ət, nə yazım?

Xan siyahını bu qəsdilə sənə vermiş idi,
Edəsən ta onu cəm' etməyə sibqət, nə yazım?

Bilmirəm kim, nə səbəbdən elədi fürsəti-fövt,
Heç düşməzdi ələ bir belə fürsət, nə yazım?

Belə bimehriliyin çox mənə tə'sir eyləyib,
Bilmirəm ki, yetəcəkdir kimə töhmət, nə yazım?

Görəsən, biz kimin haqqına xilaf eyləmişik?
Etməyirlər bizə bir kimsə həmiyyət, nə yazım?

Nə mənə vardu, nə oğluma bir yarü müin,
Ey bizim bəxtimizin içinə lə'nət, nə yazım?

Məsələn kim, ola bir xarici, ya bir dərviş,
Hamı pul verməyə eylər ona rəğbət, nə yazım?

Eyliyəydin bizi bu dəfə də bir xəbr hisab,
Necə qıldın ki, Səlimi çəkə üsrət, nə yazım?

Neyləmişdik sənə biz, bircə bunu bilseydim,
Eyləyərdim özümü xeyli məzəmmət, nə yazım?

Əlqərəz, mərhəmətü hümmətün olsun ali,
Tutmasın heç giribanivi nikbət, nə yazım?

Xassə təntəneyi-daireyi-sərkarə,
Lütfi-haqdan yetə hər anda rif'ət, nə yazım?

Belə mə'lumdu bu şəhridə pul verməklik,
Qeyriyə vacib olubdur, bizə sünnət, nə yazım?

Belə fərz eylə ki, mən əhli-təvazöLəku deyiləm,
Bəs, Səlimin işinə kim çəkə surət, nə yazım?

Başlayıb fiqh üsulu, qalıb orda möhtac,
Nə kitabı, nə də var almağa qudrət, nə yazım?

Bir para yerdə həqiqətdə ölüm xöşraqdur,
Tayü tuşdan ki, kişi çəkə xəcalət, nə yazım?

Görəsən, doğrusu, bu işdə müqəssir kimdir?
Görsə hər kim səni, Qasir, edə hörmət, nə yazım?

## ACİZƏ[N]

Aciza! Könlüm olub didarə ram, istər səni,
Dincələ buyi-vüsalınla məşam, istər səni.
Görməyə çeşmim camalın bir məqam, istər səni,
Tövf etməkçün dili-beytül-həram, istər səni,
Dustun hər bəzmlərdə niknam, istər səni.

Gülşəni-təb'in əcəb güllər açıb, gülzardır,
Bülbüli-eşqin fəğan eylər, nə xoş göftardır,
Bu məhəbbətnamədən vəslin bizə izhardır,
Aşinalar bittəmamən şaiqi-didardır,
Söhbətin zikrilə hər xasilə am, istər səni.

Aşinalıq rəsmin etdin aşikara bizlərə,
Dustiliq tərhin yazıb qıldln hüveyda bizlərə,
Didəmiz binalanıb yetkəc bu bina bizlərə,
Namədə kim nəzmlə etmişdin inşa bizlərə,
Nəzmini gördükdə hər əhli-nizam, istər səni.

**...................................................................**
**...................................................................**
**...................................................................**
Dosta, qəlbim tapıb qəmdən mətal istər səni,
Xatirim əzbəs olub əfsürdəhal, istər səni.

Xeyli müddətdir nə qasid var, nə kağız, nə pəyam,
Üstümə eylüb, əzizim, dərdü möhnət izdiham.
Hər zaman bu nəhvləndür gərdişi-çərxin müdam,
Xar olub əhli-hünər nadanı eylüb niknam,
Tərk edub müstəqbəlü maziyü-hal, istər səni.

Bağlayıb sənlən bəsi-mehrü məhəbbət xatirim,
Eyləməz hərgiz ölüncə tərki-ülfət xatirim,

Tapmış əbnayi-zamanda bəs küdurət xatirim,
Şövqi-vəslindən olub manəndi-cənnət xatirim,
Olma çox piçidəyi fikrü xəyal, istər səni.

Yar olub bu əsrdə əğyarlarlən yarımız,
Yar olur əğyarilər gər əldə olsa varınız,
Heyf yoxdur müştəri kasad olub bazarımız,
Dərs demək ətfalə, kağız yazmaq olmuş karımız,
Onda da yüzdən beş-üç sahibkəmal, istər səni.

Yazdın kağız vüsul oldu alıb etdim nigah,
Bisəbəb zəhmət qəbul eylub olubsan üzrxah,
Surəti-əhvalidə hər mətləbin olmuş güvah,
Surəti-əhvaluna bəs riqqət etdim ah-ah,
Hər zaman bu dəhridə sahib calal, istər səni.

## PAPAQÇI SƏMƏDƏ

Ey mənə börk eyləyən peşkəş,
Peşkəşin başa yetişmib yəqin,
Belə müşəxxəs olunub bizlərə,
Bəs dərisi aşə yetişmib yəqin.

Heç görmədik sözünün tə’sirini,
Söylə görək nədəndi tə’xirini,
Çəkdirirdim o börkün təsvirini,
Dideyi-nəqqaşə yetişmüb yəqin.

Sən görmüsən qulluqda isbatımı?
Peşkəşimi, yanında sovqatımı,
Sifarişlən istəyibsən atımı,
Bilirsən fərraşə yetişmib yəqin.

Fərz-sözüm vardır bundan ziyadə,
Şahu-ruxum fil tək qılıb aradə,
Atı alıb, qoyma məni piyadə,
Bəs ayağın daşa yetişmib yəqin.

Mən görmüşəm afitabü mahimi,
Tərk etmişəm naləvü həm ahimi,
Başı açıq qoymusan İbrahimi,
Bəs bu börk qardaşa yetişmib yəqin.

Xatirimə yetişməzdi börk işi,
Sən özün etdin bizə fərmaişi,
Bir kişiyə söz deyəndə bir kişi,
Onun sözü başa yetişmib yəqin.

## EYNƏK

Şükrilə yad edərəm xaliqi-mə'budimizi,
Göstəriblər bizə rahi-zərərü sudimizi.

Kargahi kərəmü lütfidə ustadi-əzəl,
Nə əcayib toxuyub tarmizi, pudmizi.

Günə-günə bizə eylübdü əta ne'mətlər,
Yaxşı xilqətlə vücud eylədi mövcudimizi.

Xassə bu fəslü bu saətdə əhibbalərilə,
Eyliyibdir bu gecə gərm dəmü dudimizi.

Şəbi-duşinə olub söhbəti-əsbabi tərəb,
Bu gecə saz eyləyib çəngü dəfü rudimizi.

Əgər ol mətləbi-mə'hudimiz izhar olsa,
Tez gərək lütf edəsiz eynəki-moydimizi.

Olsa məqsud əgər bu gecə sizdən hasil,
Həqq hasil edəcək mətləbü məqsudimizi.

İnşallah ki, çıxan vəqt qəmər əqrəbdən,
Lütfi-haqdan görürəm taleyi-məs'udimizi.

Eynəgi lütf eylə, ta şişeyi-büllüri onun,
Taki saf eyliyə təb'i-gilaludimizi.

Nur ver mərduməki didəmə bir şişə ilən,
Qoyma bu Qasiri qalsın dəxi əndişə ilən.

Gözümün fikrini tez elə, gözün qurbanı,
Yetişir mahi-mübarək, oxusun Qur'anı.

Bilusən burda mənim kimsəyə yoxdur nəzərim,
Nə filanı bilirəm, nə tanıram bəhmani.

Bir para əti acı, qeybəti şirinlər var,
Etmərəm mədh əgər versə mənə milyani.

Şüəra silsiləsi bir para insanı sevər,
Nə ki hər divü nərrə, xərü heyvani.

Bu sözün cümlə kəmal əhli bilir mə'nasın,
Xəbər alsan deyərəm bəndə sənə pünhani.

Heyf bu fəsli-bahara ki, keçər xiffətilən,
Nə gülüstana gedən var, nə gəzən bustani.

Ey xoş ol kimsə yeyib, bəxşiş edib dünyada
Ki, bilir cümlə yoxu var olacaqdır fani.

Şe'r yazmaqda gözüm tirə olub eynəksiz,
Eynəgi yolla yazım ta sənə bir dastani.

Xeyli lazımdır dəxi salmagilən tə'xirə,
Yolla bu dəm səni mirzə filanın cani.

Dərdi hal etməgə hər canibə bir seyr etdim,
Yenə səndən tapılır dərdimizin dərmani.

Bir para fikri, xəyali qəmi-bihudə məni,
Edib aludə, əcəb qoymayır asudə məni.

## ŞƏRHİ-HAL

Ey mənim həmdəmi-xoruzbazım,
Ey rəfiqü şəfiqü həmrazım.

Adı ağa Məhəmməd Nasir,
Özü irşad kərdeyi-Qasir.

Aşinayi-Məhəmməd Əliyü Həsən,
Mən sənə dost mehriban, mənə sən.

Bir gün aldım əlimə xamə yazam,
Sənə bir özgə növ’ namə yazam.

Qəlbdə eylədim sən ilə cədəl,
İki-üç nizə oldu rəddü-bədəl.

Əl apardıq kəmanü şəmşirə,
Xəncərü gürzü nizəvü tirə.

Eylədim dövr girdi-meydanı,
Başa çəkdi hərif qalxanı.

Zahir oldu hərifdən zinhar,
Qərəz, ol dəmdə etdim istiğfar.

Yenə diki-məhəbbət eylədi cuş,
Dedim, ey dust, vergilən mənə guş.

Axıra düşdü mətləbin başi,
Heç görürsüz bu çərxi-oğraşı?

Gəh edər bir zaman fərazi-nəşib,
Olu möhtac nanəcibə nəcib.

Gahi bir özgə günə eylər dur,
Ola bilməz, hərif şirlə sur.

Basdırar gah şiri-rubahə,
Gahi rubahi döndərər şahə.

İstəsə çərx edər şəğalı pələng,
Eyləyər şiri bir dəqiqədə ləng.

Fili bir ləhzədə qılar xərguş,
Bəlkə, bəbri bəyani eylər muş.

Gahi bir dudimani qarət edər,
Bir xərabi gəhi imarət edər.

Gahi bir yoxsulu edər Hacı,
Şəkkəri istəsə edər acı.

Əlqərəz, bu süpehri-şö'bədə gər,
Çox əzizi edibdi xuni-ciyər.

Gah atıb kə'bəteyn bir şeşü pənc,
Gah edir bir fəqiri sahibi-gənc.

Ömrü Zeydə verib həzarü həzar,
Qasiri eyləyibdi məktəbdar.

## GƏLİB, EY DİL…

Gəlib, ey dil, mənə bir yaxşı namə,
Nə namə, nameyi-mişkin şəmamə.

Gəl, ey müstofiyi-təb'i-Səlimim,
Həmiyyət eylə, baxma izdihamə.

Mürüvvət vəqtidir sultani-eşqim,
Amandır, şurə gəl, ey nuki-xamə.

Cəmali-səfhəni eylə müzəyyən,
Mürəkkəb qıl məhəbbətdən kəlamə.

Cəvabində onun yaz bir cavabi,
Bu kim, məqbul olcun xasü amə.

Mənə, ey eyləyən bu nəzmi-inşa,
Salan əş'arü əbyatı nizamə.

Əcəb vəsf etmisən sərvi-səhini,
Salıbsan könlümün mürğünü damə.

Sənə mən aşiq oldum qayibanə,
Söylə meylin həlalə, ya həramə?

Ola səd mərhəba, səd afərinlər,
Mənə göndərdiyin niku pəyamə.

Həqiqət, səndə var buyi-məhəbbət,
Səvadindən vüsul oldu məşamə.

Məni-biçarəni qıldın sərəfraz,
Bilibsən, aşiqəm ol xoşxuramə.

Görəndə qaşların şəmşiri-bürran,
Xəcalətdən dönər mahi-siyamə.

O qara gözlərini görsə nərgis,
Olur bimar ta ruzi-qiyamə.

Edəndə göftgu bulbul olur lal,
Güləndə həm əsər eylər hümamə.

Bu mahə canfəşanlıq barəsində,
Məni naəhlilər eylər məlamə.

Vüsalində gecəm hüsninə şamil,
Fərağında günüm bir tirə şamə.

Necə dönmək olur böylə sənəmdən,
Cəmalında onun vardır əlamə.

Nümayan oldu bir parə sözündən,
Cənabüz bəs düşübsüz fikri-xamə.

Mən ancaq bil, xiridarəm, o mahə,
Deyil lazım, gələ gər qeyrə ramə.

Yenə həm yazmısız bir parə eyham,
Dəgər, əlhəqq, bu qəmgin dalü lamə.

Yazıbsız bir də qazi məhbəsini,
Nəzər qıl, indi hərfi-ixtimamə.

Məgər qazi, xəlifə, molla, arif
Gəlirlər məclisi-şurbi-müdamə?

Nə mollayam, nə qazi, nə xəlifə,
Budur kim, vardu meylim lə'li-famə.

Əgər qazi, xəlifə, molla olsam,
Qoyaram başıma mən də əmmamə.

Nəsiyətsiz, mənə vermə nəsihət,
Su dəryaya dolar, sonra ğumamə.

Bu şəhrin görmüşük ariflərini,
Adın arif qoyub, durmaz qiyamə.

Nədir qəsdin, bəyənmirsən məani,
Budur fikrin, yetişsin iş təmamə.

Müğanda əjdahalar var qəribə,
Şamaxini çəkər bir dəmdə kamə.

Çoban ləfzində olsa eybü diqqət,
Onu ən"am göndərməzlər ənamə.

Çobanlıqda əgər olsaydı bir eyb,
Neçün Musa yetişdi ehtişamə.

Anasını çıxarıb qıllam oğlun,
Qisası əks qıldım intiqamə.

O sözlər kim, deyibsən, eyni-həqdir,
Vəli geydirmisən bir özgə camə.

Könül, ixlasını müstəhkəm eylə,
Mənim qaibdə tazə aşinamə.

Qərəz, pabənd olub biçarə Qasir,
Əli ismi bilə ləfzi-qülamə.

## BİZƏ QƏLMƏKLİGİZ, EY DOST...

Bizə gəlməkligüz, ey dost, yəqin olsa əgər.
Gərək olsun bizə bir gün irəlicən bu xəbər.

Biz də ta seyrü səfa rəsmin edək amadə,
Məclisə eyliyək arayişü zibü zivər.

Sədri-məclisdə səmavər edə fəryadü xuruş,
Həm kəbab atəşi-suzanə tökə xuni-cigər.

Dik ara Zöhrə kimi ləhm edə rəqqaslığı,
Süfrədən dişrə çıxa nanki, çün qürsi-qəmər.

Dəsttyi-sünbülə tək guşədə hər dəstə piyaz,
Üzümün xuşəsi bir iqdi-sürəyyayə dəgər.

Süfrənün rişi-süfidi təni səd parə pənir,
Ola həm dairədə xərbuzə həmçün şəkkər.

Bir Mir Əlnaqi ola, bir də Mir İbrahim bəy,
Sənü mən, bircə də Həzrətqulu, bir də Dilbər.

Vardu bir usta o tayda mənə vermişdi nəvid,
Lığı biçməkligə şah arxına eylübdü səfər.

Xoş düşər məclisi, əğyardən olsa xali,
Mən bilən gəlsüz əgər bəsdi bu beş-altı nəfər.

Leyk bilmək bunu da gəlməgüzün var şərti,
Guş qıl, eyləyüm izhar mən, ey niksiyər.

Evi tikdirmişəm amma ki, dərü səqfi qalıb,
Tərk edüb fikrü ğəmü qüssə məni şamü səhər.

Bir tərəfdən yetişir fəsli-zimistanu xərif,
Ev tamam olmasa əhvalımız olmuş bədtər.

Lilləhülhəmd bu işlərdə özüz mahirsüz,
Aşinalar işinə dustlar əncam çəkər.

İnşəallah ki, gələn vəqtdə pürkar gəlün,
Götürun iskənəvü rəndəvü müşarü təbər.

Müxtəsər, bu iş üçün hər nə ki, olsa lazım,
Götürün kar, dərü səqfi edün zirü zəbər.

Gəlməgə olsa xəyaluz bu qərarilə gəlin,
Dustlar, kim sizi-Allah, sizi-Peyğəmbər.

İkivüz usta, qalanlar da mədədçi, lakin,
Qeyri işlərdə sizə Qasir ola xidmətkar.

Düsta! Müntəzirəm nəzmilə ya nəsrilə,
Bu sözün tez mənə, əlbəttə cavabın göndər.

Bu söz itmamə yetən vəqtdə qasid gəldi,
Nəzər etdim yüzünə, halını gördüm xoştər.

Bəğəlindən çıxarub verdi mənə bir namə,
Guyiya mülki-cahan yetdi mənimçün yeksər.

Namə məzmununa diqqətlə çü oldum vaqif,
Qalmadı ayineyi-qəlbim ara heç kədər.

## YAZMIŞAM, EY CAN...

Yazmışam, ey can, nəzər qıl mənə,
Mən sənə qurban, nəzər qıl mənə.

Yetdi bizə, yə’ni sözün, qardaşım,
Mahi-münəvvərdi yüzün, qardaşım.
Cavabını yaz, özün, qardaşım,
Yazmışam hər an nəzər qıl mənə.

Gətdi Səməd bəy bizə ol naməni,
Tutduq o dəmdə ələ biz naməni.
Ətirlə ləbriz edirik daməni,
Qıl yüzə əfşan, nəzər qıl mənə.

Şükür Həqqə, təbi’niz mövzun olub,
Halətiniz yə’ni digərkün olub.
Sən də gəlib mən kimi Məcnun olub,
Olma pərişan, nəzər qıl mənə.

Sən gülə, mən qönçəyə pabəstəyəm,
Beləsindəndi ki, dilxəstəyəm.
Gah pərakəndə, gahi dəstəyəm,
Guş elə, bir an nəzər qıl mənə.

Vardı bizim gülşən-ara sadələr,
Sərv kimi qaməti-azadələr.
Əldə surahi və meyü badələr,
Cümlə qəzəlxan nəzər qıl mənə.

Bitib gülüstanın ara lalələr,
Üstünə şehdən tökülüb jalələr.
Daireyi-çərxə salıb nalələr,
Ləhceyi-mürğan, nəzər qıl mənə.

## O SÖZLƏR Kİ, GÖNDƏR...

O sözlər ki göndərmisiz Qasirə,
Rəxnə salıb ərbəi-ənasirə.
Çirkin tutdun məstanənin adını,
Mən Qasirin kəsdin e'tiqadını.

Həcv eylədin o şüxi-tərsavəşi,
Vurdun mənim peykərimə atəşi.
Bu barədə yoxdur mənim günahım,
Sözləriniz olubdur üzrxahım.

Bu sözlərin vardur həqiqət yeri,
Məndə yoxdur heç məzəmmət yeri.
Hər kəs görsə bu sözü təsdiq edər,
Böyük qedən yoldan kiçik də gedər.

Sən bu yolun əzəl oldun saliki,
Bir yadə sal külli-şeyin haliki.
Gətir yada həşri ol əfsürdəsən,
Olmagilə bir də dilazurdəsən.

## ƏNDƏLİBƏ CAVAB (F)*

Ey Əndəlib, bir məqamda yetişmişdir mənə namən
Ki, qaranlıq gecə idi, yoxa çıxdı tez gətirən.

Ancaq bildim ki, bəxt gülmüş, səadətə çatmış könül,
Gözlərim bu məktubunu görən kimi, oldu rovşən.

Nizaminin "Xəmsə"sini istəmişsən, heyf yoxdur
Ki, göndərim hüzuruna, oxuyasan həvəslə sən.

Ürək açan şe'rlərin çox xoşuma gəldi mənim,
Oxuduqca şura gəlib şairinə dedim əhsən.

Çox istədim xoşhal edim səni incə şe'rlərlə,
Bəlkə könül bülbülünün nəğməsilə dolsun çəmən.

Lakin tə'bim ilhamının qarşısında nizamsızdır,
İşim təb'i boğmaq üçün olmuş mənə div, Əhriman.

Əziz dostun qarşısında təəssüflə deyir Qasir:
Bu cavabda bir mö'cüzə yaratmağa acizəm mən.

* - Məmmədağa Sultanov tərəfindən Fars dilindən tərcümə edilmiş əsərlər - (F) – işarəsi ilə bildirilir

## TƏYYİBÜ TAHİRƏ[(N)]

Qıl nəzər, ey Təyyibi-Tahir kişi,
Əbdi-Həbib, ibni Məzahir kişi.
Mən Qasirin dərdü-ahü-zarına,
Bundan sonra sataşma dildarına.

Bəlkə, yaxandən çəkələr əl sənin,
Ta ki, ola müşkil işin həll sənin.
Orda da gər ləc düşə aralara,
Ordan köçüb düşgilən qəralara.

Filankəsin yurduni abad elə,
Dinc əgləşib xatirini şad elə.
Eyləgilən mə’buduna ibadət,
Bəlkə, bir zəman olasan fərağət.

Orda sizi aparmasınlar yola,
Kötüklü yurdunun cani sağ ola.
Ordan köçüb düş Kötükliyurduna,
At tüfəngi şəğalinə, qurduna.

Gər orda da mürad hasil olmasa,
Peymanələr badə ilə dolmasa,
Bir namə yaz, göndərgilən sən bizə,
Gəlin ordan, köçək gedək Təbrizə.

İşimizin aqibəti xeyr ola,
Naməmizin bu söhbəti xeyr ola.
İnsafa gəl, ey pədəri mehriban,
Söylə görək, bizdən nə gördün yaman?

Yazdun mənə nameyi-dilsuzi sən,
Qəm-güssəni qıldln bənə ruzi sən.

Belə əlfazi mənə yazmaqliğin,
Xeyli bu güncayım işdur, ey pəsər.

Belə namərbut ibarətdəndir,
Xassü amanın bilmisən fərqin məgər.
Get onu molla filankəsdən soruş,
Tazə damadındur, ey nuri bəsər.

Ta sənə tə'lim qılsın birbəbir,
Hər kimin bil rütbəsini ol mö'təbər.
Mən ki sənin müxlisi dirininəm,
Aşıqlıqda Fərhadi-Şirininəm.

Sözlərimə tutmagilən diqqəti,
Belə xoşdur şairlərin söhbəti.
Səbəb vardır Səmədü yüzbaşıya.
Söz yazmadım olar kimi naşıya.

Çünkü olar halı pərişan dtgil,
Münasib söhbəti ürfan dtgil.
Baratalı hərifidir onların,
Həqqə baxsan, zərifidir onların.

Onlara tay-tuşdi miraxur Qasım,
Şahsevəndə üryan olan lor Qasım.
Bir də vardır onların iki payı,
Şamaxıda Xürtü və molla dayı.

Onlar əgər əgridən yüz söz deyər,
Bunlar yenə desə də düz söz deyər.
Yaxşı annadım onların halını,
Qulağımdan kəsdim qətli-qalını.

Meyxanəçi məşhur olub namımız,
Onlara var özgə sərəncamımız.

Cavabınız gəlsə, yoxumdur ğəmim,
Vardır təzə bir istəkli həmdəmim.

Bu qissəni degilən yüzbaşıya,
Yüzbaşılıq təriqində naşiya.
Bir gün ova gedərdik neçə cavan,
Bulud qalxdı dağları tutdu duman.

Bərq çaldı, hava oldu tirə-tar,
Karvan əbrə verildi ğatar.
Gürşad olub yağış tökdi dəmbədəm,
Qaçmaqlığa mən əzəl qoydum qədəm.

Olmadı bir kimsə yetişsin dada,
Otuz yol azından düşdüm gürşada.
Xatirimə gətirdim yüzbaşını,
Nə yüz başı, acığlan yüzbaşını.

Ey məni hər namə ara pistəyən,
Məndən savay yoxdur səni istəyən.
Tamam oldu bu mətləbim vəssalam,
Bu mətləblə eylədim xətmi-kəlam...

## YENƏ GÖFTARƏ GƏLİBDİR(N)...

Yenə göftarə gəlibdir bu dili-divanə,
Bir neçə fərd yazıb xani əzimüş-şanə.

İntizari-qədəmi-xani bəsi çəkdim, mən,
Gəlmədi və’dəyi-mə’luma yetib payanə.

O qədər cahi-cəlalü həşəmü ləşkər ilə,
Mülkü sərhəddə gəlib düşmüşidi oltanə.

Elə xanı ki, Şükürdür adı Sübhanallah,
Görcək anı nə qədər şükr elədim sübhanə.

Xülqi xoş, ləfzi şəkərbar, pəsəndidə xisal,
Əhsənül-vəch niku surətü həm mərdanə.

Batini zahiri tək eybidən olmuş ari,
Dişi mirvariyə bənzər, dodağı mərcanə.

Rəhməti-Həqq vücudində onun kamildir,
Oxşayır qaməti tubaya, yüzü rizvanə.

Nə bu tə’rifi deməklikdə təmənnamız var,
Gördüyümü deyər olsam düşərəm böhtanə.

Sifəti-xanda yüzdən birini yazmamışam,
Nə bu bəhsidisə könlüm tələb eylər, danə,

Bu qədər bilgilə xana ki, müşəvvəş haləm,
Görsə kafir məni bu dəmdə, gələr imanə.

Yox atım, payi-piyada bədənim çox rəncur,
Yetişə bilməyirəm söhbəti hər cananə.

Kərbəlayi Fərəcüllah özü halidir,
Ondan əhvalımı sorsan söləməz əfsanə.

Ruzi pəncşənbə məni etdi əyadət, gördü
Ki, vücudumu salıb miri-bəla zindanə.

.............................................................
............................................................

Bir neçə kəlmə sənin nitqi-ləbindən danışıb,
Ruhi-tazə deyəsən gəldi, bu getmiş canə.

Guyia dideyi-Yə'qubə verib buyi-şəfa,
Gətiribdir deyəsən Yusifini Kən'anə.

Əldə yüz rə'şə ikən tutdu qələm sürət ilən,
Dildə yüz ləknət ilən təb' gəlib əfğanə.

Neçə ərzim var onu yazmaq olubdur vacib,
Rəsmdir bəndə öz ərzini demək sultanə.

Mən ilə eylədiyi əhdü vəfa baqidir,
Ya gərək nəqs yetib etdiyiniz peymanə.

Zeynalabdinin evində belə təqrir etdiz,
Gəlsə şəhzadə əgər bu tərəfə şahanə.

Bizə ondan alasuz pul ola bir xərclik,
Bəlkə İsmayıl özünü yetirə qurbanə.

Bəndə fikri bu idi gər yetə ol pul əlinə,
Gedərəm hind-mətain gətirəm Şirvanə.

Əlqərəz, gəldi o şahzadə Ziyaüddövlə,
Bir neçə əsb yedək, yeddi şütur barxanə.

O rəhimlik adını etdi özündən məslub,
Bu Cəvad icmini əcvəd eyləyib mərdanə.

Neçə sərbaz, necə fərraş, neçə miraxur,
Neçə fərsud tüfəngdar, neçə topxanə.

Doğrusu gəlmiş idi bir iti ülgücilə,
Qırxdı çox başları, həm canı boyatdıqanə.

Ələfi-mərdumi-sərhəddi tamam etdi tələf,
Qoymadı rəhgüzər anı qala bir cavanə.

Saldı novruzu bir ay axıra, yümni-qədəmi,
Xalq möhtac qalıbdır bir içim ayranə.

Axırı əl aparıb silsileyi-Məcruhə,
Tutdu bir iş ki, onun zülmü yetib dövranə.

Şah bilib sayəsinə qaçmışidi Allahdan,
Demə burda düşəcəkmiş habelə xüsranə.

Nəzər et, izzətinə padişahı-İranın,
Bircə bax, qeyrəti-fərzəndi-şahi-Şirvanə.

Bildi Məcruh olub zülm, o da zülm elədi,
Lə’nəti-Həqq yetə böylə Əbi-Süfyana.

Bir qəsidə bir-iki qitə tədarük etdim,
Sən güman eylə apardım zirəni Kirmanə.

Oxudu, baxdı, bəyəndi, elədi çox tə’rif,
Bir tümən pul sələ etdi o məni-nalanə.

O da yuz vasitə ilən neçə gündən sonra,
O bizim dərdimizi də yetirib dərmanə.

Bir qəsidə ona yüz vəsflə etdim inşa,
Kərəmin bildi hamı, necə salım pünhanə.

Qalmışam pay-piyada, səbəbi ondandır,
Onu bir mərd salır dərdimizi dərmanə.

Əlqərəz, müxtəsəri yazdım o keyfiyyətdən,
Mərəzi-mühriqeyi-təbi' salıb nöqsanə.

Şövqiməndəm, yetişəm feyzi-hüzuri-xanə,
Göstərəm dərdi-dili-halımı ol Loğmanə.

Bülbüli-dəşti-Muğan, Qasiri-şirinsüxənəm,
Şəkəri-şe'rimi göndərgilə Hindistanə.

Ora tutiləri bilsinlər bu təmi şəkərin,
Hamı əngüşti təhəyyür tutalar dəndanə.

Cümlə xanzadələrin sıxdı, çıxartdı suyunu,
Belə tohini bəşər tutmiyib heç insanə.

Ona şahzadə deyərlər, buna da xanzadə,
Səni-Allah, buna bax, eylə nəzər həm anə.

Görgilən hansısının qeyrəti çox, hünəri çox,
Görgilən hansının oxşar nəfəsi qəlyanə.

Xan öz asilərinə etdi necə lütfü kərəm,
Şah yağilərini basdı necə zindanə...

## EY KÖNÜL, GƏL ŞURƏ...

Ey könül, gəl şurə gər nitqində nöqsan olmasa,
Gərçi bülbül eyləməz şivən gülüstan olmasa.

Sən həmin şuridəvü sərməstü şövqi-yarsan,
Gəlməsin əfğanə gər nitqin dürəfşan olmasa.

İndi gəl göftarə təbi cövhərindən, qıl niyaz,
Bir xiridar bilər vəznini niran olmasa.

Xülqini etsin vücudi-həlmilən müstəhzərim,
Bu cavahir gər onun şə'ninə şayan olmasa.

Qənd yerinə ləfzi şəkkərbarı iste"mal olur,
Xan içrə söhbəti bəsdir nəməkdan olmasa.

İsmidir ağa Dadaş bəy hüsnü xülq ilə ona,
Mən mələk söylərdim, tərkibi insan olmasa.

Nik surət, saf dil dərviş xislət annanır,
Əhli-dil olmaz ona mail bu ünvan olmasa.

Bir səmərsiz nəxl, ya bir züisiz qəndildir,
Hər vücud ki, anda cudu bərrü ehsan olmasa.

Hər pərişanhal şəxsin halətin bilməz məgər,
Hər o kəs bu çərxidən hali pərişan olmasa.

Nöktəki, bitdi xəyali-Qasiri təhrir edib,
Xeyli müşgüldür əgər hər müşgül asan olmasa.

Məqz üçün yetməz xələl, olmaz müşəvvəş heç damağ,
İllər ilə talibi-nəsrinü reyhan olmasa.

Göz tamam ömründə hərgiz nuridən tapmaz qüsur,
Naziri-bağü gülü gülzarü bostan olmasa.

Xabi-rahət eyləmək mümkündü xakistər əra,
Bəstərü həm balışi-pərqu, yorğan olmasa.

Nəfs üçün nöqsan yetişməz, təb’ üçün əfsürdəlik,
Şəxs üçün mə’’şuqəvü dildarü canan olmasa.

Leyk bu ənbani-xali yə’ni bətni piç-piç,
Eyləməz səbrü təhəmmül löğmeyi-nan olmasa.

Gah tərəqqi, gah tənəzzül nəfs üçün bundan bulur,
Şahdan olmaz gəda əksik bu viran olmasa.

İnqilabi-çərxidən bir kimsə görmüb güşimal,
İxtişaşi-dəhridən hər kim hərasan olmasa.

Pəs yəqin biçarələr halına müstəhzər deyil,
Olmaz agah müddəti onlarla yeksan olmasa.

Əhli-mə’ni zahir olmaz, firqeyi-cühhalidən,
Xirqə içrə guşeyi-məxfidə pünhan olmasa.

Vaqif olmaz hər kamal əhli rümuzi-şe’rdən,
Təbi ziba, ləfzi-şirinü qəzəlxan olmasa.

Kim tanır aləmdə hər üşşaqi-Məcnun tinəti,
Onda zövqü naləvü fəryadü əfğan olmasa.

Ey dila, ağa Dadaş bəy Lütfi kafidir sənə,
Çəkmə qəm gər qeyr ətfali-dəbistan olmasa.

Eydi sultanı gəlir yüz günə istiğna ilən,
Bəd keçər bir şəxsə ki, istiqbala sahman olmasa.

Qəm yemə, ey dil, xəyali batil etmə, səbr qıl,
Kar sahmanə yetişməz, ta pərişan olmasa.

Başımız üstündə bəsdir olsa ancaq sayəsi,
Bak yox gər kisədə dürrilə mərcan olmasa.

Badkubə şəhri içrə tutmaram hərgiz məqam,
Burda ol sərhəlqeyi bir bəzmi-ürfan olmasa.

Hər cəvahir qiymətin bilməz məgər cövhərfüruş,
Annamaz söz qədrini hər kim süxəndan olmasa.

Bundan artıq eyləmək təhriri bimə’na olur,
Əlqərəz, kim səbr edər, əslində insan olmasa.

Qasira, əhdü vəfadə olmaz İbrahim bəy,
Hər vəfa əhlinə İsmayıl qurban olmasa.

## XƏYALƏTİ-AŞİQANƏ

Eylərik mənzil haçan bəs mənzili-cananı biz.
Dərd əlindən qurtaraq şayəd üzülmüş canı biz.

Bəhsi-fərqi-kuyi canan rövzeyi-Rizvan qılan,
Guya canandan mühəqqər bilmişik rizvanı biz.

Aşiqə! canansız, rizvan cəhənnəmdir, yəqin,
Dərd onundur canda, kimdən istəyək dərmanı biz.

Can mərizi-eşqi-canandır, şəfa vəslindədir,
Firqətilə tapmışıq bu dərdi-bipayanı biz.

Ayrılıb canan gedib, candan sınıb dil şişəsi,
Nisfi-canan nisfi-can yanındadır giryanı biz.

Dali-qəddim dal edibdür, həm dəri-məqsudi dərd,
Damı ol gənc üstədür, peyvəstə sərgərdanı biz.

Natəvandır can, bu cür müşkülü çəkməklikdə çox,
Həllinə lazım gəlir gəzmək rəhi-imkanı biz.

Zülfü ismi birlə bəxtim renginə həmrəng olub,
Lami-dil olmuş güli, bəs çəkək əfğanı biz.

Mövci-bəhri-eşq, tüğyan eylədi Məcruh get,
Nuhə yalvar eyliyək başdan belə tufanı biz.

Gör necə güllər çəkildi getdi gülşən səmtinə,
Bumilərdən bəklədik, qaldıq neçün viranı biz?

Qeyrətim çox qalmamış, üzrüm budur kirdaridən,
Pir edib dövran bizi, pir etmədik dövranı biz.

Qasira, Bağdad ilə Şirazı gəl viran qılaq,
Vəsf edək, abad ola məhbubeyi-Şirvanı biz.

## ÖZÜ DƏRVİŞDÜ XANZADƏ...

Özü dərvişdu xanzadə dəgil silsiləsiz,
Şairin şe’rini, əlbəttə ki, qoymaz siləsiz.

Var ümidim ki, bu göftarü bu xülqü bu süluk,
Qasirə, bir sileyi-mərhəmət etsin giləsiz.

Belə billəm silə göftarü deyil bimövqe,
Xərmən üstə verilir sailə buğda giləsiz.

Xah ləbbadə ola, xah əba, xah qəba,
Pəs münasibdü bulardan biri vazeh, biləsiz.

Özqə vəchilə gərək düşməyə dildən-ağıza,
Düşəsüz əhsənü əxlaq ilə dildən-dilə siz.

Bimüəyyən ola kim başa gələ tabistan,
Olmayıbdır, gecə əyyami-zimistan hələsiz.

Verməsə mumü əsəl, hörmətə minməz zənbur,
Kirmidə mərtəbə olmaz, əgər olsa, piləsiz.

Şairin hər cürə əşa’rilə əbyatı olur,
Necə kim bə’zi ona axiri olmaz siləsiz.

Bir-bir ətmək sözü bir gündə gətirdük başa,
Qorxuram ki, bir işi qət’ edəsüz bir ilə siz.

## ƏYYÜHƏNNAS, BAXIN YAZDIĞIM...

Əyyühənnas, baxın yazdığım əşarlərə,
Götürün səbt eləyin dəftəri tumarlərə.

Göndərin bu sözü Rusiya məmaliklərinə,
Rindü-zahidlərinə qeyrlə zaliklərinə,
Alimü cahilinə müflisü maliklərinə,
Müxtəsər böylə yolun eşqdə saliklərinə,
Sala bu qissəni hər küçəvü bazarlərə.

Bir güni gəldi Hacıxanluya çox cahü cəlal,
Mütrübü aşiqü sazəndəvü niku cəmal,
Bir də bir Əbdüləli adlı yüzi mah misal.
Gözləri xeyli qara, qaşları manəndi-hilal,
Düşdü Yusif kimi bu Misrdə bazarlarə**...**

Necə Əbdüləli vəsfində olur nitqim lal,
Eylərdi danışan vəqtidə tutiləri lal,
Özünün beş uşağı vardı danəndə kəmal,
Gərdəni üzrə düzülmüşdü neçə haşimi xal,
Məskən etmişdi onu türreyi-tərrarlərə.

Alnı ay, qaşları yay, kipriyi ox, çeşmi-siyəh,
Girdə yüz, püstə burun, lalə yanaq arizi məh,
Tutidil saf-sədəf höqqə dəhan, ahu nigəh,
Xoş əda, nik səda, sib zənəx, layiqi-bəh,
Ləbinin ləli-şəfa şərbəti biçarələrə.

Bu işin pərdələmək olmayır avazəsini,
Bundan ötrü eşidib cümlə xəlayiq səsini,
Göstəribdir özü aləmdə bu ayinəsini,
Gör necə sahibi-himmətdi ki, öz xanəsini,
Xabgah etmişdi gürzəvü şəhmarlərə.

Gəlmiş idi onulan bir zənəki sahibi-rəng,
Zəfəranrəng, qovur gözlü vəli xeyli qəşəng.
Xurmayı saçlı, qaşı taq idi, manəndi-firəng,
Qoymaz idi duta ayinəsinin üstünü zənğ,
Bu səbəbdən düşə xoş çeşmi xəridarlərə.

Guş edin, bundan əcayib dəxi xislətləri var,
Bir para fazilü ədna ilə söhbətləri var,
Xas çox xanilə bəyzadəyə şəfqətləri var,
Əməlin əks eləyib gör necə büd'ətləri var,
Sövküyürdü təpəsin girdiyi-divarlərə.

Yazmışıq biz də birin məmləkəti-İranə,
Orda təsdiq edübən göndərələr Turanə,
Çinü Maçin yetişə Hindü Firəngistanə,
Hər vilayəti gəzə, ta ki gələ Şirvanə.
Hamısı qol qoyalar yə''ni bu göftarlərə.

Qərəz, açmışdı Hacıxanluda qəssabxanə,
Böyrəgü quyruğü ət dönmüş idi ümmanə,
Qüvvəsi yox ala, yetdi füqəralar canə,
Kim görüb yağlı ətin batmanı beş tümənə,
Müftə hərçənd verirdi hünəri varlarə.

Söylədilər bu nə, ey ayinərux, şeydaxu,
Kafirin teşnəsinə lazimədir vermək su,
Getdi əldən füqəra əhli, nə insafdi bu,
Olur aya onu peyvənd eləmək sınsa səbu,
Niyə nahəq olusan silk günəhkarlərə**...**

Açıb ağzını bu saillər üçün verdi cavab,
Çəkilin burdan, olun dur, siz ey xanəxərab,
Bu nə cür'ətdi, mənim eyliyəsüz hərfimə tab,
Baxıram,yoxdu ki, bir müştəri olsun mənə bab,
Satıram mən ətimi xeyrsiz avarələrə.

Xalq icma eləyib verdi cavabını onun,
Nırxı əksiltdi, çəkib şişə kəbabını onun,
Verdilər axırı bu tövr hesabını onun,
Aldılar əldən əcəb zurulə xabını onun,
Çünki tuş oldu necə zırpivu pətyarlərə.

## BALAXANIM

Yazım sənə bu naməni, dilbərim,
Oxu məzmununu qan, Balaxanım!
Dili şirin, dodaqları şəkkərim,
Natəvan cismimə, can, Balaxanım!

Səni verdi mənə nişanə huri,
Dedi camalının yoxdu qüsuri.
Gözlərin qəlbimin olub mənzurı,
Düzüb kipriklərin san, Balaxanım!

Eşitdim söhbətin Molla Əlinin,
Danışdığın dəli oğlu dəlinin.
Nə rəvadır qoca kişi gəlinin,
Tapsın vüsalından kam, Balaxanım!

Nə layiqdir məni əldən atasan,
Qoca hirək kişiləri tutasan.
Gəlsən mənə, səni qoymam yatasan,
Xoruzlar çəkincən ban, Balaxanım!

Məndə vardır neçə cürə söhbətlər,
Aparmağa cürə-cürə ləzzətlər.
Yə'qin eylə, arif olan övrətlər,
Düşməz məsləhətdən yan, Balaxanım!

Sən tərlan cinsisən, dönüb sar olma,
Tay-tuşlar içində gəl sən xar olma.
Məni qoyub özgələrə yar olma,
Düşər ortalığa qan, Balaxanım!

Qasirin artıbdır möhnətü qəmi,
Səndən yarasının vardır məlhəmi.

Hər gədazadənin olma həmdəmi,
Tanı mərtəbəni, qan, Balaxanım!

## GƏLMƏDİ

Ağa Seyid, ora gələndən bəri,
Səndən bizə heç bir əhval gəlmədi.
Xanədani-pakindən bizim üçün,
Nə cavab yetişdi, sual, gəlmədi.

Həqiqət, çox varam sizdən müntəzir,
Xəyalım səhranı, çölləri gəzir.
Firqətə yox tabım, nə ürək dözür,
Qulağıma bir qeylü qal, gəlmədi.

Ey sənə ixlasım həddidən məzid,
Sən getcək dərdimiz olubdur məzid.
Gedəndə vermişdin mənə bir nəvid,
Nədən edək biz ehtimal, gəlmədi.

Olsun mənim canım cəddinə qurban,
Sənə kazib demək çox olur üsyan.
Nec oldu dediyin şişeyi-qəlyan?
Arpa yetişmədi, motal gəlmədi.

Bundan sonra bildik əyrini düzü,
Əlbəttə, çıxacaq rəqibin gözü.
Çünki hamı eşidibdir bu sözü,
Nə dəymiş gəlmədi, nə kal gəlmədi.

Qoyma bizə tə'nə edə bu millət,
Qeyrətə gəl, eyləgilən həmiyyət.
Arpanı, motalı eylə mərhəmət,
Deməsinlər sizdən nəval, gəlmədi.

## NİGARIM

Müjganımı qıldlm əlimə xamə, nigarım,
Göz yaşilə yazdım sənə bir namə, nigarım.

Hər dəm salıram yadıma ol çeşmi-xumarı,
Şad eyləyirəm bu dili-məhcurimi barı,
Hicrində sənin anlayıram leylü naharı,
Qoymaz yetişə vəslinə bu bikəsü zarı,
Lə'nət gələ bu gərdişi-əyyamə, nigarım.

Daim məni-biçarəyə həmdəmdi xəyalın,
Peyvəstə qılır çeşmimi rövşən ruxi-alın,
Vəsfin nə deyim sən kimi bir mahi-cəmalın,
Könlüm quşunu hiylə ilə daneyi-xalın,
Zülfünlə çəkib, bənd eləyib damə, nigarım.

Bir şanə çək ol türreyi-tərrarına, dilbər,
Aşiqlərinin eylə dimağini müəttər,
Kimdir sanə, cana, ola dünyada bərabər,
Billahi, həqiqətdi bu söz, ey ləbi şəkkər,
Döndərdi fərağın günümü şamə, nigarım.

Səd heyf, üzüldü əlimiz sən kimi məhdən,
Salma bizi-sərgəştəni, əlbəttə, nigəhdən,
Qoyma düşə ol türreyi-şəbrəngini təhdən,
Mənsiz, sənəma, pariçeyi-sürxü siyəhdən,
Geymə dəxi pirahənü zircamə, nigarım.

Ey gözləri nərgis, ləbi şirin, özü ustad,
Bu Qasiri hicrin eyləyib əsrdə Fərhad,
Bülbül kimi çox eyləyirəm naləvü fəryad,
Axırda maşayixligi qıldım özümə ad,
Təzvirilə qoydum başa əmmamə, nigarım.

## CÜM'Ə GÜNÜ

Ürəfa söhbətə amadə olur cüm'ə günü,
Sübə dək xatiri-beqşadə olur, cüm'ə günü.

Düşmənü dustü biganəvü həmxiş hamı,
Rindi-meyxarə və ya zümreyi-dərviş hamı,
Aqilü kamilü əfradi-bədəndiş hamı,
Sahibi-şövkətü biçarəvü dilriş hamı,
Hərə bir növ' ilə üftadə olur, cüm'ə günü.

Hər o kəs arifi-həqdir, bu gün asudə olur,
Talibi-cifə olan cifəyə aludə olur,
Bu günün mənfəəti olsa da bihudə olur,
Kiminin meyli bu gün çəngü neyü rudə olur,
Kiminin məşğələsi badə olur, cüm'ə günü.

Dostlar! Ömrə vəfa yoxdu dəmi-fürsətdir,
Məhz heyvandü hər kim əməli-qəflətdir,
Olsa bir güşeyi-bağ, eylə bilün cənnətdir,
Bə'zilər şayiqi-mey, raqibi-həmsöhbətdir,
Bə'zilər talibi-səccadə olur, cüm'ə günü.

Bə'zi xatirdən olur rəf' bu gün məkrü məlal,
Bu gün heç bir işə verməz əlin ərbabi-kəmal,
Bə'zi bu gündə tapar cah, tapar bə'zi zəval,
Əməli-xeyr edər ol nütfə əgər olsa həlal,
Bə'zilər məhz həramzadə olur, cüm'ə günü.

Bə'zi bu gündə gedüb söhbəti-dilbərdə olur,
Qumri tək mənzili-sərvilə sənubərdə olur.
Bə'zinin fikri həmi similə, həm zərdə olur,
Kimi dükkanda, kimi məscidü-minbərdə olur.
Bə'zilər xidməti-tərsadə olur, cüm'ə günü.

Bə’zilər söhbət üçün söhbəti-cananə gedər,
Xahişi-nəfsilə bu gün hərə bir yanə gedər,
Bə’zi rahi-həqə, bə’zi rəhi-şeytanə gedər,
Mailü seyrü səfa, bağü gülüstanə gedər,
Bə’zi bir guşədə istadə olur, cüm’ə günü.

Bilmədim dəhridə asayişü rahət nec olur,
Şəxs asudə gəzər, küncü fərağət nec olur,
Ya ki, ənduhü qəmü qüssəvü möhnət nec olur,
Rəncü təşvişü məşəqqət nədü, zəhmət nec olur,
Şüğlümüz olsa da ərradə olur, cüm’ə günü.

Hər tərəfdən gözümə gülşən ara bu görünür,
Gülbünü-sərvi səhi bülbülü-teyhu görünür,
Sərbəsər laləvü nəsrin güli-xudru görünür,
Nəzəri Qasirə şəbnəm necə lö-lö görünür,
Xaki-gülşən hamı bicadə olur, cüm’ə günü.

## BAX BU ƏŞARİMƏ...

Bax bu əşarimə ey taci-sərim, qibləgahim,
Qeyri-səndən, biləsən yoxdur ümidü pənahim,

Gəldi novruz, bahar oldu, gedüb fəsli-xərif,
Edəcək badi-səba cismi-nəbatati zərif,
Sərvə qumru olacaq, bülbülə gül bərgi hərif,
Siz gətirdiz bu yerə xassə ki, təşrifi-şərif,
Çox yaman keçmiş idi ruzü şəbim, salü məhim.

Nə bilən varidi bu dərdi-dili-zarimizi,
Müddəi pozmuş idi rövnəqi-bazarimizi,
Nə də təhsin eləyən var idi əş’arimizi,
Yox idi bir eşidən söhbətü göftarimizi.
Şükrlillah ki, gəlüb arifi-sahib güləhim.

Məni Abbas kimi sahibi-e’zaz edəcək,
Xalq arasında qılıb lütfi-sərəfraz edəcək,
Zərrəpərvərliyə xurşid tək ağaz edəcək,
Qeyrilərdən bizi əlbəttə ki, mümtaz edəcək,
Olacaq mahi-münəvvər kimi bəxti-siyəhim.

Əfv qıl üzrimi, ey sahibi-idrakü şüur,
Yüz tutub bəzmi-Süleymana gəlüb aciz mur,
Görə bu bəzmi-visali, ola hicran gözü kur,
Səhv olub eyləmişəm şiveyi-xidmətdə qüsur,
Bu səbəbdən bilürəm çoxdi həqiqət günəhim.

Qərəz, etməkdə sizi dərdi-dilimdən hali,
İstərəm hasil ola xatirimün amali,
Edəsən könlümizi qüssəvü qəmdən xali.
Mən nə nəhv ilə edim sərf belə e’lali,
Lənkəran dəşti ara vardu bir ahu nigəhim.

Belə ahu nigəhim tutdi, şikar etdi məni,
İki min möhnətü ənduhə düçar etdi məni,
Şəbi-hicrani onun tirəvü tar etdi məni,
Şövqi-vəsli yenə bisəbrü qərar etdi məni,
Leyk yox getməgə ol canibə bir zadi-rəhim.

Gəlmədi Mehdi hidayət edə biz rusiyəhi,
Verə lütfilə bu səyyadə o ahu nigəhi,
Mehdisən, cən də hidayət elə, ver zadi-rəhi,
Demə Qasirdü mənim mülki-qəmim padişəhi,
Əşki-çeşmimdi xəzinəm, qəmü möhnət süpəhim.

## HACI QƏLƏMDAN

Bu şəhrdə var, bircə nəfər Hacı Qələmdan,
Amma ki, sözü təlx, əti acı, Qələmdan.

Bundan irəli yazıq idi bikəsü fağir,
İş görməkdən olmuş idi dalisi ağır.
Bir adı Qələmdandırü həm bir adı sağır,
İndi baxır adamlara qıyqacı, Qələmdan.

Apardı səni Həccə, səna eylə o şəxsə,
Bacardıqca əhdü vəfa eylə o şəxsə.
Ömrün nə qədər vardı, dua eylə o şəxsə,
Hüdhüd kimi qoydu başına tacı, Qələmdan.

Əvvəl cin idi Həccə gedib oldu firiştə,
Salmış bu səfərdə əlinə xeyli səriştə.
Müftə nə qədər olsa yeyər aşü-əriştə,
Evində yeməz xaşilü, umaci, Qələmdan.

İndi ayağı çəkməli, dəstində çətirdir,
Bir parə sözü anlamağa xeyli qətirdir.
Gah yediyi yuxadu, çox vəqtdə fətirdir,
Ocağa qoya çölməyi, ya sacı, Qələmdan.

Bir vəqt dal üstündə yatıb, gah üz üstə,
Bir müddət məst eliyib xəlqi bez üstə.
Məsciddə ayaq üstə olur, evdə diz üstə,
Mehmanxanada əyləşü həllacı, Qələmdan.

Aya, görəsən hiç xəbərdardır işindən?
Baxsan yaşına annanı tarixi dişindən.
Bir vəqt geyərdi papışı qışda meşindən,
İndi ki, bəyənməz gönü, tumacı, Qələmdan.

Bir vəqt olub xəlq, ara acizü xəstə,
Bir vəqt yeyər girdəkanü, fındıqü, püstə.
İndi belə söyləllə yığıb başına dəstə,
Xəlq ilə salıb ortalığa qacı, Qələmdan.

Gah çay satar, gah satar qəhvəvü cüllab,
Gah xadim olur, gah edə sənəti-qüllab.
Bir vəqtə kimi oldu lotu, naibi-tüllab.
Biçarələrin acizü möhtacı, Qələmdan.

Yadına düşər, künc bucaqlarda yatardın,
Burda-orda torpağa-palçığa batardın.
Çöllərdə qurardın cələ quşları tutardın,
İndi bazarın olmusan dilmacı, Qələmdan.

Var səndə neçə xasiyyətü-fe’l, nişanə,
Saldın nə əcayib onu sən beylə nəhanə.
Xəlq qoysa gedərsən səni həmmami-zənanə,
Tainki, desinlər sənə can bacı Qələmdan.

Peyvəstə yeyər şəlqəmü, həm turpü çuğundur,
Birisi dedi kim hacı, çox boynu yoğundup.
Yersiz danışıb, güldürübən xəlqi uğundur,
Hər gündə alıb səndə kəmər xaçi Qələmdan.

Tüllaba rəis xadimi bu məscidü minbər,
Bak etməgilən, bil özünü mərdümə rəhbər,
Bir az keşər etgilə dəvayi-peyəmbər,
Seyr eyləgilən bir gecə meraci, Qələmdan.

Əşaridə Pünhan təxəllüs düşüb adım,
Bu sözləri yazmaqa deyil qeyri muradım.
Guya eliyiblər məni də məscidə xadim,
Şən’ində olub əbdəhü ərraci, Qələmdan.

## AĞADADAŞA

Yetdi bahar fəsli, saqi, gətir şərabi,
Ey mətbəxi yetir sən tərtiblən kəbabi.

Gəl şura, ey müğənni, tut pərdeyi-əraqi,
Ey mütrübi-xoş əlham vur çəngilə rübabi.

Mey nəş’əsilə hərdəm gərm eylə bəzmi-eyşi,
Gəh məstü hyşyar et, hər ləhzə şeyxü şabi.

Əshabi-iştiyaqə bir müjdə verdi hatif,
Bir piri-natəvana biz eyliyək xitabi.

Şirvanşəha, eşitdim bir türfə dastani,
Olmuş sənə bu günlər nə yaxşı fəthi-babi.

Fərzəndi-ərcüməndin məhbəsdən olmuş azad,
Qəlbin olubdur xürrəm, yox qeyr iztirabi.

Söz yazmağa, əzizim, qalmub dəxi bəhanən,
Rəf’ eyləyübdü xaliq qəlbimdəki hicabi.

Gər olsa ayrı üzrün yox e’tibari, həgiz,
Bilməm nədən edərsən bu qədr ictinabi.

Bir tul dastanə, yox qüvvəti-kitabət,
Yaz laməhalə göndər bir müxtəsər cavabi.

Bəs bu nə gunə sözdür belə deyil xəlayiq,
Şirvanşəhi yazıbdır Firdovsi tək kitabi.

Aya, nə bais olmuş gəlmir cavabi-naməm,
Belə olur müşəxxəs məndən edər hesabi.

Bəndə səni ziyarət etmək olubdu vacib,
Bu niyyətə həqiqət var könlümin şitabi.

Lakin həmin bu mə'ni olmuş nəzərdə məlhuz,
Ta kəlməsə cavabım yetməz sənə savabi.

Ərbabi-mərifətdən olmaz xilaf sadir,
Dünya üçün məzəmmət üqba üçün itabi.

Püşk ilə oynayanlar bilməzlə buyi-mişki,
Bustan iynəyənlər neylər gülü gülabi.

Gər gəlməsə cavabım var ehtimalı guya,
Axırda zahir olsun bir özgə inqilabi.

Yaz Qaibün cavabın, əlbəttə, şahzadə,
Yainki tərk eylə bu ləbbi, bu lübabi.

## ZARAFAT(F)

Kişiyə yaraşmaz şit zarafatlar,
Hər bir söz ox kimi qəlbə sancılar.

Harda ki, zarafat işə düşərsə,
Ədəb əhli dərdə olacaq duçar.

“Zarafat qayçı tək doğrar hörməti”,
Peyqəmbər demişdir bunu aşikar.

Ürəyi şüşədir kamal əhlinin,
Çirkin söz, daş kimi onu parçalar.

Hər kəsin ağzından pis söz çıxarsa,
O ya bir sərxoşdur, ya da ki, xumar.

Zarafat əhlinə deməzlər şəndir,
Deyərlər nə yüngül xasiyyəti var.

Həyası olmaz bil boşboğazların,
Olmaz belələrdə vəfa, e’tibar.

Deyirlər bir çirkin söz ilə Yunis,
Tutdu bir nəhəngin qarnında qərar.

Çox zəhlə tökəndir cəfəng zarafat,
Qaç belə şəxsdən canını qurtar!

Qasir, sən hər sözü ədəblə söylə,
Sən olma bu yolda ədəbdən kənar.

## BİRƏ

Ey həramzadeyi-bədfel, üzü qarə birə,
Bədkəhər, xuni-siyəh, zülmilə xunxarə, birə.

Mar ilə əqrəbi dəf eyləməyə vardır əlac,
Hərçi tədbir edirəm, yöxdu sizə çarə, birə.

Gün qürub eyləcəyin, cuşə gəlir mur sifət
Ki, dönür hər biriniz əqrəbü şahmarə, birə.

Yatağa gircək edirsüz yaman üstümə hücum,
Tərpənəndə girisüz lifeyi-şalvarə, birə.

De görüm, mənlə nədir bir belə şəxsi-qərəzün,
Nə edibdir sizə bu Qasiri-biçarə, birə.

İstəyirsiz ki, verim mən sizə bir şəxsi nişan
Ki, qəvi heykəl ola zırpıyi-pətyarə, birə.

Nə qədər niş vurasuz, ona kar etməyəcək.
Elə bil balta dəyir meşədə rəzdarə, birə.

Molla Fəttahı tapın, Camuşaban kəndi ara,
Neçə müddətdi salıb özünü anbara, birə.

## QATIQÇI

Şairdi gəlir təbinə söz, başına həm şur,
Peyvəstə kamal əhli tutub şairi mənzur.
İnsafidi tutmaq məni bu haldə məzur,
Guya ki, vurub rişəmə bir tişə qatıqçı.

Atdım oxumu hər zada gördüm, daşa dəydi,
Bilməm nədir illət ayağa, gəh başa dəydi.
Özgə ox atanda görürəm kim quşa dəydi,
Yox fərq verən haləti-dərvişə, qatıqçı.

Yarəbb, nə adamdır, bu aya necə millət,
Aya nə səbəbdən elüyübdür belə cür’ət.
Layıqdı yalançı adama olsa məzəmmət,
Eylüyübdü yalan söyləməgi pişə qatıqçı.

Aya görəsən etmədi xanın sözünə guş,
Yainki qurumsaq dediyin etdi, fəramuş.
Ya mayə tapulmubdu sınıb, ya da ki, kavuş,
Ya rəng qoyubdur sibilü rişə, qatıqçı.

Bir torba qatıq, heyf ona olsun yarı qaymaq,
Bir aya kimi Qasirin eylər damağın çağ.
Qatıq gətirən üzünü heç eyləməsin ağ,
Daim baxasan gah pəsə, gah pişə, qatıqçı.

Axır olacaqdır səni bir gün qola sallam,
Adəm kimi gəlsən, kişi kimi yola sallam.
Yoxsa qovaram bil, səni koldan-kola sallam,
Ölən günəcən yerin olar meşə, qatıqçı.

## QAMIŞ

Neçə müddətdi qamış söhbətimiz ləngə düşüb,
İstərəm şe'r yazaq, qafiyəmiz təngə düşüb.

Molla Fəttahi tanır hər kimi dindirsən əgər,
Neçə illərdi lotu hər ili bir rəngə düşüb.

Min manat bir neçə ildir güdə Seyyiddən alıb,
Göstərib Şeyx özün hiylə ilə şəngə düşüb.

Molla Fəttah məni aldatdı qamışdan ötrü,
İki-üç ildir onunla işimiz cəngə düşüb.

Altı ay tacir olub, bir-iki ay mərsiyəxan,
Sərpilib qol-qanadı işləri bir həngə düşüb.

İstiyən vəqtdə Seyyid pulunu molladan,
Deyəsən çərs çəkib, tiryək atıb, bəngə düşüb.

## ƏRƏ VERDİ

Hacı filan öz qızını şövhərə verdi,
Yəni ki, bizim türki dilicən ərə verdi.

Yaxşı-yamanın eyləməyib heç təfəhhüs,
Əlhəqq, o bişarəni simü zərə verdi.

Öz nökərinə versə idi gər bu ayaqdan,
Heç kimsə deməzdi ki, qızı nökərə verdi.

Söylür tanıyanlar hamı əfsus o qızdan,
Ahu bərəni bir yekə nərrə xərə verdi.

Söylüblə qızı ver itə, amma iti aldat,
Bu səhv eləyib, qoydu iti əntərə verdi.

## SƏN ÖLƏSƏN

Xeyli məşhur olubdur, bu zaman**,** sən öləsən,
Söylüyür bir-birinə pirü-cavan, sən öləsən.

Yoxumuş qeyri zad and içməgə, aya görəsən
Ki, olub bir belə dillərdə rəvan sən öləsən.

Xasü am içrə qəribə mütəarəf olmuş,
İnanır söyləsə hər kimsə yalan, sən öləsən.

Farsiyan yek digərira to bemiri qofqənd,
Mişəvəd tərcüməəş baz həman, sən öləsən.

Bilmirəm mən bu necə sən öləsəndir, ya rəbb
Ki, olub təkbiyəgahi-əhli-cəhan, sən öləsən.

Üləmavü ürəfadən də görünmüş güya,
Gahi zahir, gahi söyləllə, nəhan, sən öləsən.

Tərk olub indi bizim əsrdə hər qism qəsəm,
Eylüyüb xəlqə hamı çərbi-zəban, sən öləsən.

Nə ki, Azərbaycan, bəlkə, İraq əhli, hamı,
Dəb olub bunda çinin, onda çinan, sən öləsən.

Tarı peyğəmbərə xəlqin o qədər bavəri yox
Ki, düşüb ortalığa xeyli yaman, sən öləsən.

Kə’’bədən bəs deyəsən, qəndil üzübdür, ey dil,
Desə bir-birinə hər kimsə yalan, sən öləsən.

Anlasa gər bir-birinə yalan yerə deyib,
Düşər ortalığa nahaq yerə qan, sən öləsən.

Gündə min dəfə yalan andı içər Qur'ana,
Xəlqə Qur'anidən artıqdır güman,sən öləsən.

Şəxs əgər şəxsi bilib doğru sözünə inanır,
Lazım olmaz demək il vəchə filan, sən öləsən.

Bəs yəqin heç kəsin heç kəs inanmaz sözünə,
Söylüyüb bir-birinə yaxşı-yaman, sən öləsən.

And içib bir parə nökər ağasının başına,
Söylüyüb bə'zisi birdəb-birə xan, sən öləsən.

## GƏRƏK

Dusta! Hər şəxs üçün aləmdə bir sənət gərək,
Ol səbəbdən hər kimə ruzi ola qismət gərək.

Bə'zilər bəzzaz, minasaz, bə'zi pinəduz,
Bə'zilər şair olur çün mayeyi-hikmət gərək.

Bir qəba, bir cübbə, bir şalvar artıq zad degil,
Mərdi-alitəb', şəxsi-sahibi-himmət gərək.

Vardı bə'zi kimsələrdə pulü mulü mülkü mal,
Bəxşişü ehsanü bəzlü cud üçün cür'ət gərək.

Yazmaq ilə əsl mətləbdən xəbərdar olmasan,
Həm dililə etməgə təqrir bir xəlvət gərək.

Mən sənə ərz eylədim olmaz filandan fayidə,
Sən dedin hər nəf' üçün adəm çəkə zəhmət gərək.

Mahi-ruzə həm şəbi-ehyayi-dovvom vəqt təng,
Yaz dedin, yazdım və lakin vəqt üçün vüs'ət gərək.

Mən bunu biniyyətü biqəsd yazdım, vəchi var,
Eyləmək hər bir əməldə niyyəti-qürbət gərək.

Əhli-mə'ni mücrimi-filfövr simadan tanır,
Əhli-zahir bilməgə bu mətləbi diqqət gərək.

Mən də bir şair o məmduhimdü, siz də vasitə,
Böylə şəxsə eyləmək hər ləhzə yüz lə'nət gərək.

## VÜSUL OLDU MƏNƏ...

Vüsul oldu mənə bir töhfə kim, mərdanə göndərdin,
Mənimçün guyiya bir xəl'əti-şahanə göndərdin.

Götürcək mehr ünvanından oldu gözlərim bina,
Nə xoşbəxtəm ki, Yusif kömləgin Kən'anə göndərdin.

Əcəb piçidəçin eyləmişidin zülfü-tərsa tək,
Kəlisayi-məhəbbətdən məni Sən'anə göndərdin.

Məni pabənd qıldın bir ədəd şəlvar bəndilə,
Xəyali-digər etmə, məclisi-ürfanə göndərdin.

Onun hər tarinə can riştəsini bənd qılmışdın,
Nə aləmdir ki, canan məhvəşini canə göndərdin.

Nə müddətdir pərişandır, qərəz bu bəndi-şəlvari,
Ərusi-təbimin zülfinə sən bir şanə göndərdin.

Məni-məxmur üçün, ey eyləyən bu nüktəni inşa,
Nə bildin, talibəm, ondan mənə peymanə göndərdin.

Budur ərzim sənə, ey mehribanım, xalq bilsinlər,
Yazıb bir namə hər dəm Qasiri-nalana göndərdin.

## EŞİTMİŞƏM QALADA...

Eşitmişəm qalada bir cəng olub,
Bilməmişəm doğrusu nə həng olub.

Ancaq mənə belə yetişdi xəbər,
Az qalıb qala ola zirü zəbər.

Söylədilər bir cürə rəvayəti,
Mən də yazdım bu gunə hekayəti.

Anlamadım, doğrudu, ya yalandı,
Ancaq için, görək necə palandı.

Eşitdiyim sözlərdən nəql eylədim,
Qulaq asın yaxşı-yaman söylədim.

Artaşin oğlu Abramın bir rəngi var,
Çəkməçi Girkoriylə onun cəngi var.

Çəpər çəkib veribdir işi qarıya,
Şeytan birdən gəlib, girib araya.

Başlayırlar bir-birilən davaya,
Başlarına deyəsən gəlib hava.

Bir-birinə veriblər min-min söyüş,
Onun dalısı gələcəkdir döyüş.

Abram söyür Girkoru tutub dava,
Girkor deyib danışma yava-yava.

Xalq gəlib haya, verib fışqırıq,
Ara qarışıbdı, qopub qışqiriq.

Hər ikisi pəhlivantək qapışıb,
Bir-birinin yaxasından yapışıb.

Abram özün bir-dəm salıbdır zora,
Bir badalaq bənd edib Girkora.

Acıqlanıb Girkor birdən tollayıb,
Abramı baş üstə yerə zollayıb.

Girkor tutub əlinə iynə-bizin,
İstəyir ki, deşə Abramın gözün.

İstəyir Abram dura bir az gəzə,
Naqafildən Girkorun belin əzə.

Yumruqlaşıb oldular əlbəyaxa,
Rayçılar qalıbdır baxa-baxa.

Qah deyiblər barışdıraq,
Ya təzədən aranı qarışdıraq.

Bir neçə adam onları danlayıb,
Onların ki qəbahətin anlayıb.

Biçarələr əlləşməkdən, yorulub,
Bəs deyəsən ki, danadır burulub.

Anlamaq olmur bu necə fənd imiş,
Hər ikisi əmanətə bənd imiş.

Saqlasit olub o saat sarışdılar,
Bir-birilə zahirən barışdılar.

Abram o saət əl çəkib kişidən,
Peşiman oldu tutduğu işindən.

Bir-birinin üz-gözünü etdi maç,
Dost oluban hər ikisi çəkdi xaç.

Abram dedi Girkora, ya vinovat,
Posle eto budim ne şalit brat.

Ya proşu ot vas izvinenie,
Teper budet ümniye dyadya.

Yazıq Girkor bu sözü doğru qanıb,
Abram ağanın sözünə inanıb.

Abram deyib indi çəpər çəkginən,
Hər nə ürəyin istəyir əkginən.

Gəlmişidi bir neçə adam haya,
Əllərinə götürmüşdülər paya.

Hər bir dəstə özün verib bir yana,
Dava qızışsa girələr meydana.

Gördülər ki, Abram gəlibdir yola,
Dağıldılar hər biri sağa, sola.

Girəvə düşdü Girkorun əlinə,
Durub o dəmdə yapışıb belinə.

Əyri qazıb torpağı, gah qıyqacı,
Abram ona baxırmış acı-acı.

Yavaş-yavaş əyləşib çəpər çəkə,
Abram deyib ahəstə züvə məkə.

Usta Girkor eşitməyib onun sözün,
Tikmişdi çəpərə ancaq gözün.

Abram bir ləmə çıxardı cibbindən,
Vurub onun qulağının dibindən.

Dünya Girkorun gözünə tar olub,
O birisi qulagı da kar olub.

Söz eşitməz qulaqları fağırın,
Yavaşcadan ovşamaçı çağırdı.

Hər kəs istər ki, Girkoru çağıra,
Qərəz gərək öküz kimi bağıra.

O erməni çəkməçi, mən müsəlman,
Yaxşı adam yaxşıdır, yaman-yaman.

Çox ürəyim yanır mənim Girkora,
Hər kəs onu incidə bundan sora.

Görsün onu mən nə cürə bəzərəm,
Qələmilə bel-buxunun əzərəm.

Qələm mənə tüfəngi şəmşirdir,
Cəng günü tapancavü tirdir.

Usta Girkor bir çəkməçi kişi,
Xalqa çəkmə tikmək onun işi.

Bir də əgər tərk eliyə peşəsin,
Yə’qin bilsin qazacağam rişəsin.

Ona nə lazımdı ki, qəssab ola,
Gecə-gündüz yatmayıb bixab ola.

Milçəyi qovsun ətə tiksin gözün,
Qafil olub əlinə soxsun bizin.

## YETİŞİB YENƏ XATİRİMƏ...

Yetişib yenə xatırıməbir kəlam,
Zikr olacaq onda hədisi-Qulam.

Çün o məni həmişə dilşad edər,
Töhfəyi-dilxahım ilə yad edər.

Həm mənə ixlasını eylüb məzid,
Məhz iradətlə olubdur mürid.

Belə müşəxxəs edərəm zövqi var,
Nəzmilə əşa’rə bəsi şövqi var.

Heyf ki, dərk eyləməyibdir savad,
Kəsb eyliyə tuşeyi-zadi-məad.

Olubdur bibəhrə belə tuşədən,
Şükr çıxıb ortalığa guşədən.

Bir quru işdən yekə şöhrət tapıb,
Əhli-hünər yanında izzət tapıb.

İsminə söylərlər əgərçi Qulam,
Təbi’də amma görünür xoşkəlam.

Başında mə’lum olunur nyri var,
Mən biləni nəzərdə mənzuri var.

Gah-gahi laf vurur eşqdən,
Daim olur vird belə məşqdən.

Bilsə nədir, rah günahü səvab,
Bir para işlərdən edər, ictinab.

Gər taniya vəchi-həlalü həram,
Hökmünə şər''in eləyər ehtiram.

Qoysa əgər eşq yoluna qədəm,
Faydası artıq olur dəmbədəm.

Eşqi salamat ola görməz ziyan,
Tul ola bu nüktəni etsəm bəyan.

Müxtəsəri-qəlbi olur cayi-eşq,
Zahir olur başında sevdayi-eşq.

Aşiqü mə'şuq sözün yad edər,
Bülbül tək zümzümə bünyad edər.

Gah danışır, Leyliyü Məcnundan,
Bir para üşşaqi-cigər-xundan.

Ləhzeyi-Şirinilə Fərhaddan,
Deyib fəramuş eyləməz yaddan.

Gah deyir Vamiqü Əzra sözün,
Söhbəri gül, bülbüli-şeyda sözün.

Xatiri mənzilliyə məhbub olur,
Həm özü aşiqliyə mənsub olur.

Eşq onu bir riştə ilə bənd edər,
Bir bütü gülçöhrəyə pabəd edər.

Mədrəkeyi səbri olur tarimar,
Eşq onu qoymaz tuta hərgiz qərar.

Gah danışır zülfi binaguşidən,
Gah gedər taqətü həm huşidən.

Qasiri-biçarə, bəsi fikr edib,
Şəmmeyi-eşqin sifətin zikr edib.

Eşqə hər ol kimsə ola mübtəla,
Kim çəkəcək möhnətü dərdü bəla.

Eşqdə vardır iki günə təriq,
Qayil olubdur bu sözə hər fəriq.

Biri həqiqətdü birisi məcaz,
Bundan onu əql verib imtiyaz.

Rast həqiqət yolunun saliki,
Görməyib ol rahdə bir haliki.

Getsə əgər şəxs təriqi-məcaz,
Hərdəm oxur şur yerinə hicaz.

Yaxşı güləndamlara tuş olur,
Bir para dilbərlə həmağuş olur.

Tapanda mə’şuquna həmdəstlik,
Tapar onu həmişə sərməstlik.

İstər ola pir və ya ki cavan,
Aşiq olan kimsə olur natəvan.

Cəhd edən hər kimsə həqiqət tapar,
Məcazdən axırı töhmət tapar.

Eşqə hər ol kimsənə qoydu qədəm,
Axır onun oldu vücudi ədəm.

Şahları eşq edibdür qulam,
Gah qulam olubdu sahibməqam.

İstəsə bir şəxs özünü şah edər,
Xaliqə bir bəndeyi-dərgah edər.

Şəxs özün istəsə eylər vəzir,
Xəlqi-cahan içrə olar binəzir.

Əqlüvi sən də başuva cəm’ qıl,
Şö’lənüma ol, özünü şəm’ qıl.

Cəhd elə ta ki, olasan niknam,
Xəlq desinlər sənə ağa Qulam.

Həqqi tutüb nəzərdə mərd olgilən,
Nadiri-fərzaneyi-mərd olgilən.

Əhli-zaman işlərini seyr elə,
Eyləmə pis iş,əməli-xeyr elə.

Xəlq çoxu əyri gedər düz yolu,
Var kişilik aləminin yüz yolu.

## QIŞ ÇIXDI, BAHAR OLMAĞA...

Qış çıxdı, bahar olmağa az qaldı, gəlir yaz,
Bürci-həmələ girməyə xürşid qalıb az.

Yerdən göyərir səbzə, açır şaxi-şükufə,
Bülbül gəlir əfğana, oxur şur ilə şəhnaz.

Bu fəsldə bəs şövqə gəlib tayiri-ruhim,
İstər bu ki, cismim qəfəsindən edə pərvaz.

Göftarə gəlib zövqilə həm tutiyi-təbim,
Eylüb necə gər bir şəkər əfşanlığa ağaz.

Çoxlar nəzərə gəldi belə vəqtidə, amma,
Bu cümlədən etdim Ağa Məhəmmədi mümtaz.

Çünki bu müşəxxəsdi ki, sən naz çəkəncən,
Bais budur ancaq sənə mən eyləyirəm naz.

Mərdanəvü rindanəvü loti-lotiyanə,
Yüz danə balıqla məni gəl eylə sərəfraz.

Yox çayda balıq ta eyliyə xalqa kifayət,
Gər olsa da, almaqlığa yox kisədə bir qaz.

Kərbəlayi Məhəmməd Hüseyni etgilə agah,
Olmuşdu üşaqlıqda mənə munisü həmraz.

Bu işdə verün əl-ələ, bir himmət edün siz,
Yüz balıqla, bəlkə, kefi siz edəsiz saz.

Yüz çox nəzərə gəlsə, verin əllisini siz,
Həm əllisini mərhəmətü lütf edə Knyaz.

Bu il eləyin siz məni Knyaza düagu,
Siz də olacaqsız bu düada ona ənbaz.

İranda qovurma ilə ətlə keçinir iş,
Talışda balıqsız xörəyin ləzzəti olmaz.

İstər ki, müsəmma ola dolmavü badımcan,
Kükü ola, yainki fisincanü şeşəndaz.

Bildirki kimi qıl bizə bir dəf'ə də ehsan,
Ehsan qapısın bağlama, qoy daim ola baz.

Min kəllə sınıbdır bu Kələdəhnədə yüz baş,
Həm erməni, rus və həmşəhriyü sərbaz.

Var indi yazanda bu sözü bir neçə adəm,
Hacı Əliyü Əhmədü Yusifbəyü-Şahbaz.

Bildi hamısından ki, balıq istəyirəm mən,
Dedim yazıram bu sözü yaran, dedilər yaz.

Bu qaidədir nəql deyər xalqa bu dərviş,
Bir yerdə qoyar nəqlini, axırda vurar qaz.

Aləmdə olur hər keçəlin talei, amma,
Səd heyf, mənim olmadı başım keçəlü daz.

Nə şeyx, nə molla, nə müridəm, nə müəzzin,
Nə sahibi-əmlak, nə tüccar, nə bəzzaz.

Nə zərgərü xəyyatü külahduz, nə kəffaş,
Nə misgərü qəssab, nə baqqal, nə xəbbaz.

Hər kim sənə təhsili-məişət eləməkdə,
Öz sənətinin mənfəətin hey edər ibraz.

Bu əsrdə şairlik olubdur mənə sənət,
Bu sənətdən mən tapıram hörmətü e’zaz.

Bir şah şuca olsa həqiqət bu zamanda,
Zahir olu hər guşədə bir Hafizi-Şiraz.

## AH, SƏD AH, HEZAR AH...

Ah, səd ah, hezar ah, rəfiqa, səd ah,
Oldu bica yerə ömrüm bu cahan içrə təbah.

Ləzzəti-eyşi-zəmanə mənə ənduh olmuş,
Hər günüm türreyi-dilbər kimidir şami-siyah.

Təşnədil mən gəzərəm çölləri, kor olmuş göz,
Niyə görmür, görəsən, tutmuş imiş dəhri miyah.

Şərhi-qəm çoxdu sənə, qoy hələ bu dərdi yazım,
Elə dərdi kim ona var necə tə'dili-kuvah.

Bu zimistan olub nəş'eyi-məstan kimi səxt,
Yapışır başmaq ayağa, nə olur başa külah.

Bitədarük kişinin hali yaman gunə keçir,
Bir belə fəsldə dərviş ola, ya da ola şah.

Biz də hər qism tədarük eləmişdik hazır,
O zamanlarda Nəsir xanla oldum həmrah.

Qayıdan vəqtdə gördüm ələf olmuşdu tələf,
İndi yoxdur atıma verməyə bir çəngeyi-gah.

Hərçi fikr eyləyirəm mətləbim olmur hasil,
Yox həqiqətdə samandan ötəri cayi-pənah.

Bircə bu barədə zənnim sizi idrak etdi,
Bu səbəbdən yazıb etdim səni işdən agah.

Açmaram xalqa bəyan, eyliyə bilməm əlimi,
Versələr istəmərəm gərmənə bir tayə giyah.

Necə məfluq olana mənfəət eylər mə’cun.
Samanın hər təkəsi əsbə verir qüvveyi-bah.

Üç balası ilə yaraşır eyləyim amadə,
Könlümün məqsədinə tapmayacaq hərgiz rah.

Qasıma söyləgilən qismətin etsin mə’lum,
İçməsin heç qəsəm verməməyə vardı günah.

Bir məsəl var, quyu özü gərək sulu ola,
Özgə su tökmək ilən olmaz əgərçi sulu çah.

Nə qədər ot verəsiz, mən bilirəm ki, yeyəcək,
Yenə novruzə kimi atlarımız, ya gəhi-gah.

Gər hava olsa müxalif ola, istəbli-həsar,
Çü dügahilə yetib, gah nəva ilə segah.

Var saman sizdə güman oldu yaman istəməyə,
Olsa guya olacaq Qasir üçün rütbeyi-cah.

## UYMA EY DİL, QƏFLƏTƏ BİRDƏN...

Uyma ey dil, qəflətə birdən ayıl sən xabidən,
Hər zaman ibrət götür kirdari-şeyxü şabidən,

Tapmamış əhli-zəmanədən bir həqiqi aşina,
Xatirim azurdə olmuş zümreyi-əhbabidən.

Vacibati tərk edib bil-mərrə əhli-ruzigar,
Əl götürmüş əksəri əşxas istehbabidən.

Aşinəvü dostluq rəsmindən ancaq ismi var.
Həm sədaqət zahir olmaz, zümreyi əsbabidən.

Yox həqiqətdə zənnü fərzəndidən bir faidə,
Qeyrü fikrü, dərdü möhlət, qüssəvü xünabidən.

Müqtəzayi-əsridəndir, ya xilafi-təb’idən,
Görmərəm olsun müvəffəq bir nəfər tüllabidən.

Hər biri bir nəhv ilə təhsilə ömrü sərf edir,
Olmuyubdur bir nəfər müxbir bir an heç babidən.

Tifli məktəb, əbcədü adabü olurmuş,
Hər biri tarixi-mö’cəm, həm oxur əbvabidən.

Hər kəsi bir adəmi, eylir həvayi-nəfslən,
Bir nəfər yox eyliyə təhqiq ülul əlbabidən.

Bil, bizimbu şəhridə hərgiz ülül-əbsar yox,
Filhəqiqət xəlqə müstəhzər edə abadidən.

Qış günündə bixəbərdir haləti dərvişdən,
Hər kəsin var xirqəsi ancaq xəzü Səncabidən.

Hardasan eylə zühur, ey sahibi-əsrü zaman,
Qoyma, Qasir qərq ola qurtarqilən girdabidən.

## İSTƏMƏZ ALƏMDƏ ŞAİR...

İstəməz aləmdə şair söyləsin əşa’ri-çəp,
Necə kim, ustad kəc hərgiz qayırmaz karı-çəp.

Dövreyi-əyyami qıldım seyr bir pərgari tək,
Rast olmaz dairə olsa əgər pərkar-çəp.

Hər tərəfdən həlqeyi-zülfün edərlər qəsdi-can,
Doğru sözmüş, niş vuranda həmlə eylər mari-çəp.

Hər o kəslər kim məhəbbət aləmindən dəm vurar,
Mədhi movladə gərəkdir, olmasın göftar-çəp.

Oldu bu mövla müməyyiz milləti-islam üçün,
Vərnə tərk olmazdı mütləq xalqdan zinnar-çəp.

Rast olmazdı əsasi-şəri’-peyğəmbər əgər,
Olmasaydı Züfüqari-Heydəri-kərrari-çəp.

Olmasa bir dəftər içrə zikri-mədhi-mürtəza,
Döğrusu əl kəc, gələm əyri olur, tumari-çəp.

Həqqi batil sandı cəhlilə biri gördü iki,
Rəsmi əhdas eylədi bir əvəri-idbari-çəp.

Vəqtidir gəlsin gərək viranə etsin sahibi,
Hər əsası kim, ola eylüb onu me’mari-çəp.

Cəhd eylə, Qasira, aləmdə bir düz yar, tap,
Heç təfavüt yoxdu əğyarilə olsa yari-çəp.

## DÜŞƏR HƏR DƏMDƏ...

Düşər hər dəmdə piçü tabə könlüm.
Xəyalinlə olur həmxabə könlüm.

Olur zülfün kimi halım pərişan,
Çəkirsənmi de səndə ahü əfğan.

Olursanmı fərağımda cigərxun,
Bulursanmı gözündən əşki-gülgün.

Düşəndə çeşminə çeşmi-xuramım,
Xüsusən iki lə’li-abidarım.

Tuturmu xatirin qəmdən küdurət,
Çəkirsənmi mənim tək dərdü möhnət.

Necə yalqız tutur səbrü qərarın,
Qara mənsiz keçirmi ruzigarın?

Tamaşa etgilən səhraya cana,
Gələ həm nərgisi-şəhlaya, cana.

Sölə, mən tək yetibsən sən də, cana,
Dönübmü hicrdən qəddin kəmanə?

Qılıb əşkim sarı rəngisi lalə,
Fəraqın döndərib cismimi nalə.

## GƏR KAMANDARİ-FƏLƏK...

Gər kəmandari-fələk üstümə yağdırdı xədəng,
Haşalillah ki, bu mə'nada olam hövsələ təng.

Könül istər mənə bu tir peyapey dəysin,
Zəxmdən bak eləməz kim, bu müşəxxəsdi pələng.

Guşəvü tuşə ilə himmətim olmuş qane,
Vurmuşam daməni-mövlayə təvəlla ilə cəng.

Gər ki, pərkar sifət etdi məni sərkərdan,
Çərxi-dun bir ayağım dairədə olmuş ləng.

Gecə-gündüz budu virdim məni hifz et, ya rəbb,
Nəfsi-əmmarə ilə əqli-səlim eylər cəng.

Girmişəm daireyi-hüsni-vəliyyüllahə,
Dəyməsin şişeyi-ömrümə həvadisdən səng.

Gah-bigah verib mədh ilə seyğal Qasir,
Hər zaman ki, tutar ayineyi-təbi'ni zəng.

Girməsin kimsə mənim cəngimə şairlərdən,
Bu məsəl türkidə: yüz qarğaya bir səngi-səpəng.

## KÜÇƏ İÇRƏ MƏNİ...

Küçə içrə mənə bir şux bu gün qıldı nigəh,
Eylə bildim ki, düşüb yer üzünə göydən məh.

Zülfünü tökmüş idi, arizinə qılmış təh,
Deyəsən bəs tökülüb gün üzünə əbri-siyəh.

Qaməti sərv kimi rast, libası kutəh,
Gözünün nərgisinin üstünə çəkmişdi süpəh.

Söylədim kim, nədir adı bu cavanin nagəh,
Dedilər ismi-Xudadad,rəhi saliki-rəh.

Yazıram vəsfini görsə deyə hər kim bəh-bəh,
Qasira, eşq zamanında nə dərviş, nə şəh.

## KÖÇ

Çıx kənarə, ey könül mülki-bədəndən, eylə köç,
Yarü həmdəm olmamış azadə səndən, eylə köç.

Çarə yox bu dərd üçün aləmdə, ey biçarə dil,
Vəqtkən bir çarə tap ayrıl bu təndən, eylə köç.

Çün yetib vəqti-səfər tə’xirə yoxdur ehtimal,
Qət’i-ümmid ol dəxi didarə məndən, eylə köç.

Çək təmə’ mülkdən bir ayrı mülkə zinhar,
Heç kəsilə eyləmə göftar gendən, eylə köç.

Çöhreyi-gülzarə mayıl olma misli-əndəlib,
Düşmə çəngali-üqaba bu çəməndən, eylə köç.

## ŞƏRHİ-HAL VƏ BƏYANİ-VAQEƏ

Gətir, saqiya, badeyi-pürsürur,
Tapa zövqi-təbim şərabi-təhur.

Başım gərm ola badeyi-nabidən,
Oyansın bu yatmış könül xabidən.

O meydən içən kimsə hüşyar ola,
Həmişə bu aləmdə bidar ola.

Ki, heç olmasa ondan məxmurluq,
Ola qəlbdə rəf'i-rəncyrluq.

Verə nəxleyi-eşqə nəşvu hüma,
Deyəm, mərhəba, mərhəba, saqiya.

Ziyadə edə qəlbimin şövqini,
Vəli artıra təb'imin zövqünü.

Alam dəstimə xameyi-xoşməqal,
Yazam fəsli-dibaçədə şərhi-hal.

Gəl ey təb, bir ləhzə göftar qıl,
Bu keyfiyyəti-niki izhar qıl.

Mənə var idi əsrdə bir rəfiq,
Vəfapərvərü mehribanü şəfiq.

Edib bir gecə bəzmimi güisitan,
Ədəblə olub bəndəyə mizban.

O məhfəl ara var idi bir əziz,
Onu intixab etmiş əhli təmiz.

Süxəndənü xoştəb, şirinməqal,
Xirədmənde-danayi sahibkəmal.

Fəqirü niku xülqü pak e'tiqad,
Yüsəmma Əli Əkbərü namurad.

Özü zakiri-halətü Kərbəla,
Təxəllüsdə Aciz bulub xəlq ara.

Həman bəzmdə bəd'i-sərfi-təam,
Süxən riştəsinə düzüldü kəlam.

Mənə eylədi ol cüxənvər xitab,
Xitabi sərasər ze rahi-itab.

Ki, ey şairi-Qasir ağa əqlü huş
Ki, nar olmasa eyləməz dik cuş.

Məgər səndə yox atəşi-eşqi-yar,
Belə nəqli-təbin olub kəm əyar.

Az eylə xəyalati-nəfsə həvəs,
Səmərsiz olub şaxeyi-xarü xəs.

Usan, bəsdi, bülbül tək əfsanədən,
Gedib yad tut eşqi-pərvanədən.

Bulunmuş bular dəhrdə eşqbaz,
Bunu əql ondan verir meynaz.

Vücudin eylər nar içrə fəna.
Görünməz ona nurdən masəva.

Çü bülbül çəkər nalə fəsli-bahar,
Yana narə pərvanə biixtiyar.

O gülzarə bu nar ara qərqdir,
Həmin nükteyi-eşqdən fərqdir.

Nə hasil bu bihudə əfğandən
Ki, siz olmayıb kimsə bu xakidən.

Az ol dəhrdə talibi-əmrü Zeyd,
Olardan nə bəhrə cüz əz məkrü keyd.

Vəli salik ol, bir yola rənc tap,
Çalış zövqlən, aqibət gənc tap.

Rəyazət çək, et cismini natəvan,
Yetiş bir bəharə, yox orda xəzan.

Əlin çək təraməti-əğyardən,
Dəxi söyləmə ayrı göftardən.

Qələm çək bu batil olan dəftərə,
Götür mədh yaz ali-peyğəmbərə.

Ki, oldur bizə rəhbəri-nəş'əteyn,
Xüsusən cənabi-İmam Hüseyn.

Danış mətləbi-rindeyi-nasdən,
Əli Əkbərü Qasım Abbasdən.

Müsibət əsasına bünyad qıl,
Məhəbbət binasını abad qıl.

Açıb təb'i-gəncini eylə nisar,
Sədəfdən çıxar lö'-löyi şahvar.

Təqarüblə ver bəhri-nəzmə nizam,
Kitabı bu bəhrilə eylə təmam.

Təmam eylədi Aciz ol vəz'ü pənd,
Məzacımda artıq düşüb sudmənd.

Edib sözləri xatirimə əsər,
Könül bağına əsdi badi-səhər.

O halətdə təhrirə qıldım şüru,
Xudavəndə etdim xüzüvü xüşu.

Ki., ey kirdkari-cahan, afərin,
Xudavəndi-ərşü səmavü zəmin.

Bu dəm Qasirin eylə təb'in rəvan,
Bu sövdadə vermə ona bir ziyan.

Onun qəlbi-məstini hüşyar qıl,
Məhəbbət şərabıilə sərşar qıl.

Dolub lütfi-həqdən könül içrə nur,
Bu sözlər xəyalindən etdi zühur.

Dedim: Aciza, olmasın qissə tul,
Fəulun, fəulun, fəulun, fəyl.

Bu bəhrilə bir mətləb etdim əda,
Baxıb söylədi: Qasira, mərhəba.

## UYMA EY DİL, QƏFLƏTƏ...

Uyma ey dil, qəflətə, az xürdü xab etmək gərək,
Mə'siyətdən faidə yoxdur, səvab etmək gərək.

Zə'fdən cümlə vəqalər-süst cismim natəvan.
Əşki-həsrətlən bədən mülkün xərab etmək gərək.

Sərf qıldın cifeyi-dünyaya nəqdi-ömrüvi,
Bilmədim bu fitnələrdən ictinab etmək gərək.

Karivan bir-bir gedər biz dalda qaldıq, ey könül,
Bir mətaun vara əyləşmə, şitab etmək gərək.

## MƏN BU DÜNYAYİ-FƏNADA...

Mən bu dünyayi-fənada bir əmirə nökərəm,
Mənbəi helmü fütuvvət, mənşəi-cudü kərəm.

Biz ona molla ümumən, ol bizə mollayi-xass,
Bu səbəbdən hər iki aləmdə olduq möhtərəm.

Birisi əlqabi-xassında əmirülmöminin,
Mədfəni-pakında əfvaci-mə’layik dərxidəm

Pişivayi-ünsücan mövlayi-cümlə kainat,
Müqtədai-küllü aləm, bürdü barü möhtəşəm.

Mərhəbalar bir belə mövlayə olsun dəmbədəm,
Mədfəni darissəlamü mövlidi olsun hərəm.

Ərşü kürsi ol vicudi pakdən tapdı, vicud,
Olmasaydı gər Əli, olmazdı löhü həm qələm.

## YENƏ BİR DUSTİ-HƏQİQİ...

Yenə bir dusti-həqiqi məni salmış yadə,
Olub ixlasü iradətlə əcəb üftadə.

Xoşdil eylüb məni bir töhfeyi-canpərvərlən,
Afərin bir belə şagirdə, belə ustadə,

Bə’zilər kimi degil balığu amma cahil,
Ədəbü əqlidə paludə, nəzərdə sadə.

Sinni əsğərdü, vəli ismi Əli Əkbərdir,
Əhli-xidmət, mütəvazödi, bəsi üftadə.

Pulu mal ilə deyil şiveyi-insaniyyət,
Mə’rifət, doğrusu moquf idu iste’dadə.

## QƏLƏMDANI TƏ'RİF[F]

Cümlə nəzər əhlində bu türfə qələmdandır,
Mə'nasına diqqət ver, bir güllü gülüstandır.

Huri bəbəyindəndir sevri qələmin nuru,
Həm liqqəsi cananın zülfü kimi qətrandır.

Biz axtarırıq daim elmü hünərü sən'ət,
Elmü hünəri sevməz ol kimsə ki, nadandır.

Qasir necə şairdir, elm əhli bilər şəksiz,
Əfsus ki, bu aləmdə hamı bizə düşmandir.

## BİR GECƏ DARIXDIM[(F)]...

Bir gecə darıxdım yar həsrətindən,
Elə bil zülfində həbsə düşdüm mən.

Gecə xəyalını basdım bağrıma,
Nazı məlhəm qoydu ürək ağrıma.

Xumar gözlərini öpdüm xəlvəti,
Pəmbə dodağından içdim şərbəti.

Nazından gah dərdə düşdü ürəyim,
Göz yaşım qərq etdi canımı mənim.

Ruhumu oxşadı gül tək yanağı,
Önündə əyildi Bədəxşan dağı.

Qara gözlərinə vurulmuşam mən,
Bir ürək asılmış hər bir telindən.

Dodağı dirilik suyudur yəqin,
Məzəsi nabatdan, şəkərdən şirin.

Tuti söhbətindən çəkər xəcalət,
Onun hər sözündə var min məlahət...

Onda ceyran kimi bir gözəllik var,
Etmişdir Qasiri hüsnilə şikar.

## MƏNİM CÖVRÜ CƏFAYİ-ÇƏRXDƏN...

Mənim cövrü cəfayi-çərxdən qəlbim mükəddərdir,
Könül aşüftə, xatirü-pərişan, hali-digərdir.

Vücudi-zahirimdə min bəla, yüz ğəm hüveydadır,
Həvəsi-batinimdə yüz aləm min dərdi-müzmərdir.

Qalıbdır ziri-bari qüssələrdə bəxtiyi-bəxtim,
Biyabandur, mənzil pürxətər, rəhzən müqəddərdir.

Zibəs rəncidə olmuş xatirim bu çərxi-kəcrudən,
Tənimdə hər tüküm öz cismimə bir nuki-xəncərdir.

Həqiqət, eyş zövqü şövqindən könlüm olub xali,
Xəyalim gərdişi-əyyamdan bibalü bipərdir.

Olub pəjmürdə gül, gülşən xəzan olmuş həvadisdən
Ki, gəlməz şurə təbim əndəlibi bəs ki, müztərdir.

Başımdan məhvəşlər vəslinün sevdasi dur olmuş,
Nə də könlümə yadi-dilbərani-mahi-peykərdir.

Hərifim ruzigari-dun nərdim dərd, nəqşim kəm,
Drığa, yox küşad ümmidi, yaran heyni-şeşdərdir.

Bu nəhvi dərdlərdən ömrü sərf etmək xəyalətdə,
Deyil mümkün olunca eyş ona kim dərdi-məsdərdir.

Bəli, bir mərdi-azadə olur məxsus şairlik,
Müridü salikü dərvişü həm rindü qələndərdir.

Əgər rind olsa rindanə yazar tə’rifi-mövlani,
Və gər dərviş ola, mə’lum olur məddahi-Heydərdir.

O Heydər ki, onun mədhini söylüb Xaliqi-Əkbər,
Ənisi-Mustafa şiri-xuda saqiyi-kövsərdir.

Qüsurin çoxdu Qasir nəzmdə kamil təəmmül qıl,
Zəfayayi-xəfadə sakit ol, ol guşə xoştərdir.

## KİŞİLƏR

Ey mənim dostlarım, mən kimi əbləh kişilər,
Fikrü amalı uzun, niyyəti kütəh kişilər.

Bilmirəm kim, nəyə aludə olubsuz bu qədər,
Salmayırsız məni bir yadıza məh-məh kişilər.

Neçə müddətdü degülsüz mənim əhvalımdam,
Bilmirəm heç nədir illəti agah kişilər.

Qeyri günlərdə olur məşğələvüz cümə günü,
Məni də bari salın yadıza gəh-gəh kişilər.

Bilirəm, yaxşı yeyib, yaxşı içürsüz mənsiz,
Verüsüz saqqalıza, buğlarıza təh kişilər.

Çəkmisüz özüzü bir küncə düşübsüz gəncə,
Gah rəiyyət olusuz, gah şahənşəh kişilər.

Bəli, İsa ilə dördüncü fələkdə gəzüsüz,
Heyf bağlandı mənimçün dəri-dərgəh kişilər.

Varimiş bir neçə əshabi-vəfa kirdaruz,
Hər güzərgəhdə qazublar sizə bir çəh kişilər.

Həmlə eylər sizə, gahi mənə sübhanəllah,
Necə kim həmlə edər zeyğəmə rubəh kişilər.

Sizə bu nüktəni kərrat deyübdür Qasir,
Olmayın tülkurəviş adəmə həmrəh kişilər.

## ANLAMADIM

Mən bu dünyada nə fikrü nə xəyal anlamadım,
Eylədim seyr, nə töhmət, nə məlal anlamadım.
Bə’zi ətrafi dolandım, məhü sal, anlamadım
Ki, nədir mərifətü əqlü kamal, anlamadım.

Çoxları ziynətü zibi özünə pişə qılıb,
Qapısın vəz’i-digər, pəncərəsin şişə qılıb.
Nə qədər fikri-dəqiq eyliyib əndişə qılıb
Ki, nədir mənfəəti cahü cəlal anlamadım.

Bə’zilər Məkkəyə getcək adını hacı qoyar,
Kibridən bir neçə kəs börkünü qıyqacı qoyar.
Məclis içrə qıçını əyləşib həllacı qoyar,
Götürüb boynuna min vizrü vəbal anlamadım.

Şəxs özü çox çalışıbdır özü ne’mət qazanıb,
Tərki-vacib eyləyib istəsə minnət qazanıb.
Xəlq iman ilə, din sərf edib, dövlət qazanıb,
Mən əbəs dalda qalıb, dövlətü mal anlamadım.

## PAPİROS

Vardır insanə neçə düşmən, biri həm papiros,
Belə düşməndir olub insana həmdəm papiros.

Papirosa meyl edəndən tapmasan bir sinə saf,
Dər həm elübdür məzaci, təbə salmış ixtilaf.
Bir də mən hər kim çəkir eylər xilaf ən dər xilaf,
Qəlbi insani edər dərd ilə müdğəm papiros.

Söyləsə hər kimsə ondan nəf'i var eylər, qələt,
Nəf' onda sürfə, bə'zi rənc, illətdir, fəqət.
Mən özüm iqrar edib bu  qövlə qoydum dəsti-xətt,
Artırar insana dərdü möhnətü qəm papiros.

Lovmü tərkibin edib bə'ziləri manəndi-yüz,
Bu zamanda diqqüsill ondan təmam eylər büruz.
Ömrü zaye, vahi bimənа edəndir sinəsuz,
Əlli ildir görmədim bir nəf'i ondan ta hənuz.
Ancaq eylər haləti-insani dərhəm papiros.

Çəksə hər kəs papirosu qəlbi eylər iztirab,
Rəngini tirə, vücudin süst, ərzatın xərab.
Ey əzizan, eyliyün siz papirosdan ictinab,
Bəzilərçün öskürəkdən mümkün olmaz xurdü xab.
Etmiyüb heç kimsənin qəlbini xürrəm papiros.

Bə'zi arvadlar papiros çəkməyə eylüb həvəs,
Ərləri onlar ilə nə nov olmuş həmnəfəs.
Sinələr xır-xır xırıldar, həm gəlir bir parə səs,
Mərhəba yaxşı verir xatunaqəm-xəm papiros.

Vay o gündən qurtara tənbəkü, cibdə qara pul,
Olmaya bir ayrı yerdən heç şey hərgiz vüsul.

Kimdən əmma eyləmək onda gərək etsin qəbul,
Qorxusundan pul istəməz hərgiz anasından oğul,
Ta edər hər sirrini özünə məhrəm papiros.

## ODUN

Çıxdı yay, oldu payız, qış yetişir ləşkər ilən,
Himəsiz kimsə durub, mən kimi əşki-tərilən.

Odunu olmasa hər kimsənənin qış fəsli,
Ağlaşar tifli, çıxar yumruğa arvad ərilən.

Bə’zi illər meşədən sel gətirirdi himə,
Daraşıb yığmağa mərdum pəsərü doxtər ilən.

İndi şükrlillah nə sel vardı, nə vardü himə,
Keçirir bə’zi adamlar qışı çubi-tərilən.

Vay, mən Qasiri-İsmailin əhvalına vay
Ki, odunsuz çıxarır başa qışı Hacər ilən.

Zeydü Əmrilə özümə baxub ollam asi,
Çıxaram cəngə xudavənd ilə, peyğəmbər ilən.

Kişi məktəbdar olunca bu vilayətlərdə,
Yeydir ondan dolana gavü xərü əstər ilən.

Bir neçə şəxs ilə ülfət eləməkdən yeydir,
Gedib ülfət eləmək Artun ilə Kaspar ilən.

Bizim əbnayi-zəmanə eləməz hiç tə’sir,
Zülfüqarın götürüb, gəlsə Əli Qənbərilən.

Lənkəranda neçə ildir edirəm nəşvü nüma,
Burda mən anlamadım doğrusu, xeyri şərilən.

Tə’n hər hizu dənidən, mənə xoştərdir bu,
Edələr cismimi yüz parə əgər xəncər ilən.

Qışda qiyamətki əgər qopsa müşəxxəsdir bu
Ki, odunsuzlar özün narə salır kafər ilən.

Az qalıb bir para arvad qoya başına papaq,
Dolana bir para nakəs kişilər mə’cər ilən.

Bəs dəgüb zövrəqi-iqbalimə əmvaci-zaman,
Çəkmişəm sahilə öz nəfsimi min ləngər ilən.

İndidən xəlq odun fikri edir, amma kim,
Olub əngüşt bərabər mənə xaküstər ilən.

Gər samavar kömürü olsa mühəyya, göndər,
Eşşək Alaverdi, sıpa Mehdi, qoduq Cəfər ilən.

## LİMU

Ey bizim dəstənin həmsöhbəti, limu götürən,
Bağ ara cümə günü xəlvəti limu götürəm.
Eylədin sən necə bu cür'əti, limu götürən,
Etmədin heç mənə bir hürməti, limu götürən.

Bilmədin, neynək, apardın, yenə göndərsəydin,
Ya məgər eyb gəlirdi sənə, göndərsəydin.
Qoyub üstünə birin də mənə göndərəydin,
Eyləsəydin mənə bu xidməti, limu götürən.

Çün o limunu mənə bağda Şahbaz verib,
Göstəribdir o neçə qəmzəvü yüz naz verib.
Dostlar içrə belə töhfəni o az verib,
Xeyli artıbdır onun qiyməti, limu götürən.

Lotu limunu yeyib paylayıb, Hatəm görünüb,
Müftə maldır gözünə pareyi-şəlğəm görünüb.
Belə limuni yeyən əhli-cəhənnəm görünüb,
Bilirəm görməyəcək cənnəti, limu götürən.

Ey mənim munisimü həmdəmü yarım, limu,
Qıymadım mən səni çaqqu ilə yarım, limu.
Laməhalə mənə göndərmədi yarım limu,
Nə ədavət eləyib fürsəti, limu götürən.

Heyf o limuya ki, bir ay mənə eylərdi kifaf,
Billəm, üç gündə təmam etmisən, ey biinsaf.
Heç limu ola bilməzdi o limu kimi saf,
Qaldı sinəmdə onun həsrəti, limu götürən.

Bu oğurluq işidir, ya da ki, ərk eyləmisən,
Hər birisidir qərəz, bu işi bərk eyləmisən.

Müxtəsər, hər nə isə, vacibi tərk eyləmisən,
Unudubsan necə gör sünnəti, limu götürən.

Hünərin var isə izhar elə, adın nə isə,
Yandıran ey məni bağındaCavadın, nə isə.
Gər bu limunu götürməkdə muradın nə isə,
Saldın ortalığa bu firqəti, limu götürən.

Dərdi-limu eyləyib rəngimi limu kimi zərd,
İçirəm çayı yavan, çulğalayıbdır məni dərd,
Qeyzdən xamə alıb dəstimə yazdım neçə zərd,
Xeyli artıqdır onun qiyməti, limu götürən.

Qasirin fikri deyildi bu rədiş namə yaza,
Bircə limudan ötür bir belə həngamə yaza.
Var idi qəsdi onun məclisə “Şahnamə” yaza,
Olmadı heyf onun qisməti, limu götürən.

## BAHALIQ

Saldı, heyhat, cahan mülkünə şöhrət bahalıq,
Bir para xalqa verir xeyli əziyyət bahalıq.

Bavücudi bu ki, hər qəllə firavan görünür,
Un, dügü ilə dolub, anbarü dükkan görünür.
Degü müşkül bu işin çarəsi asan görünür,
Salıb ortalığa təlx indiki dəhşət bahalıq.

Dövlət əhli özünə cəm qılıb rahi-məaş,
Tökülüb kasibi-biçarələrin başına daş.
Gər çörək tapsa nahar vəqti yeyər axşama aş,
Füqəraya günü-gündən verü zillət bahalıq.

Nazil olubdu hələ əvvəli-mətləbdü bəla,
Vay o gündən ki, bəla yer yüzünə nazil ola.
Göstərə üz bu zaman əhli üçün qəhtü-qəla,
Pənah Allaha, əgər eyləsə şiddət bahalıq.

Sübhdən şama kimi eyləsə hər kəs hərəkət,
Nə qədər kim qazana olmayacaqdır bərəkət,
Bu bahalıq salan əşxas gedərlər dərəkə,
Olacaqdır hamı müstövcibi-lə’nət bahalıq.

Gündə min yük dügü və un gəlü payi-qapana,
Həzərati dügüçilər salu qapan-qapana.
Bir deyən yox, cülovun çəkgilə atın çapana,
Qoymayın böylə bol ildə qala büdrət bahalıq.

Bilməyir çox qocalar kim, nədir adabi-namaz,
Tanıyır cümlə cavanlar nədü tənbur ilə saz.

Çoxu aludeyi-üsyançi pusti-pəyaz,
Tapılır çox belə əyyamda nikbət bahalıq.

Neçəsi badəxoru tiryəkiyü bəngi olub,
Neçəsi mütrübü tənburzənü çəngi olub.
Qəl'ənin əhlilərinin çoxu həmrəngi olub,
Xalq arasına salıbdır belə millət bahalıq.

Dövlət əhli, girəvə vəqtidi, dövlət qazanır,
Molla biçarə zəkat istəsə töhmət qazanır.
Hərə bir molla tutur, xassə rüşvət qazanır,
Kasıbın başına saldı daşı xəlvət bahalıq.

Bu təəccübdü ki, bir dəstə gəlibdir əmələ,
Hacı filan, filan nəstə gəlübdür əmələ,
Xeyli ahəstəvü ahəstə gəlibdür əmələ,
Nə bu il, çoxdan edüb hamısı niyyət bahalıq.

Ərdəbildə necə əmvatı edibdr əhya,
Adı tək qurbanıyam Mirzə Ələkbər ağaya
Ki, olub əhli-sualın hamısı əhli-dua,
Öylə tə''sir eləməz onlara nisbət bahalıq.

## BAHALIQDAN

Yaran tutub afaqi hamı qəm bahalıqdan,
Əndühü qəm olmuş mənə həmdəm bahalıqdan.

Hifz eyliyə xaliq bizi bundan betərindən,
Yalvarmıya naməhrəmə məhrəm bahalıqdan.

Bir elə cavanmərd hanı sahibi-dövlət,
Qoysun füqəra zəxminə mərhəm bahalıqdan.

Çox kimsəyəar oldu, gedib qeyrəti əldən,
Çox kimsə olub xeyli mükərrəm bahalıqdan.

Yarəb, nə bəladır bu dutub xalqı sərasər,
Yox eyləmiyən şikvə bir adəm bahalıqdan.

Hər kimsənənin vardır əgər dövlətü malı,
Olmuş oların xatiri xürrəm bahalıqdan.

Bir təkyəyə etmiş neçə əşxas təkiyyə,
Olmub oların haləti dirhəm bahalıqdan.

Bu əsridə, yarəb, hanı Mə’n ibn Süleyman,
Bəzl eyliyə manəndeyi-Hatəm bahalıqdan.

Yarəb, sən özün görmə rəva nakəsü dunə,
Tainki ola gərdənimiz xəm bahalıqdan.

Yalvartma bizi bir para namərdu ləimə,
Vermə bizə sən dərdü qəm, ölləm bahalıqdan.

Qıymaz verə bir loğma zəifü füqəraya,
Eylər qızılı köksinə müdqəm bahalıqdan.

Əhli füqəranın baxıb əhvalına ağlar,
Bəlkə, baş açıb İsayi-Məryəm bahalıqdan.

Bir ildir ki, tədricilə bu payəyə yetmiş,
Allah bilə, artıqdır müqəddəm bahalıqdan.

Bilməm nə zaman karə gəlir dövlətü ne’mət,
Biçarə olub bir para adəm bahalıqdan.

Amma elərəm bir para adama tamaşa,
Tapmış hərə öz nəfsinə bir cəm bahalıqdan.

Qənd müftə, dügü, yağ və qoyun, çay havayi,
Göstərmiş özün hər biri Rüstəm bahalıqdan.

Anbarı dolu buğda, sənduqu dolu pul,
Olmuş pula həmsöhbətü həmdəm bahalıqdan.

Bircə məni-biçarəyə əlhəqq deyə billəm,
Xoş keçmədi bu mahi-məhərrəm bahalıqdan.

## PUL

Yarəb, nə şurdur ki, tutubdur cahanı pul,
Vurmuş biri-birinə zəminü zamanı pul.

Çox tacir oğlu taciri həmmal eyləyib
Vermiş qapan dibində dalına palanı pul.

Həm Badkubə şəhrini abad eyləyib,
Bir növilən ki, şərhə yetişməz bəyani-pul.

Bir kərpicin qızıl eyləyibdir, birin gümüş,
Şəddad qəsrinə eyləyib ani sani pul.

Məşhuri-ruzigar edibdir Nəqiofi,
Mə'rufi-əsr Hacı Hacıağanı pul.

Gəh bir zaman pəşşəni manəndi-fil edər,
Gəh bir qarışqa tək eyliyur əjdahanı pul.

Hər yerdə mümsük olsa onu axtarıb tapar,
Eylər onun cibində, evində məkanı pul.

Ol vəqtdən ki, velkəcəri eyləyib biruz,
Abad edibdi dayireyi-Lənkəranı pul.

Bir cövhəri verib Bakıya nefti-cövhəri,
Baqqalları hesab eləməz milyanı pul.

Çox aşikar eyblərə pərdələr çəkib,
Zahir edibdi bir para sirri-nihanı pul.

Eylub kəman kimi nə qədər sərv qaməti,
Döndərdi sərvə bir para qəddi-kəmani pul.

Yer işlərin təmam eyləyibdir yavaş-yavaş,
İstər ki, asimana qoya nərdivanı pul.

Pəndir tapmayanlar əhlinə şalvar geydirər,
İndi ayağa geydiri cəkkiz tumanı pul.

Gahi uşaqlıq eybini bilmərrə məhv edib,
Ortalığa çəkibdi filanü filanı pul.

İranda bir gəda beççəni xan eyləyir,
Gahi edər rəiyyətə möhtac xanı pul.

## QARA PUL

Həllali-müşkülati-cahan oldu qarə pul,
Eylər iki dəqiqədə min dərdə çarə pul.

Hər gülsitani istəsən bir dəm edər xərab,
Ya bir xərabi döndəri bağü bahara pul.

Gah nar əhlin istəsə nur əhli eyləyər,
Gah nur əhlin salı bir dəmdə narə pul.

Hər cildə, hər libasa girə vardır izzəti,
Olmaz qərib, qoysa qədəm hər diyara pul.

Artıqdır hökmü qeysərü Xaqani-Çinidən,
Cəzbi-qülub edər eləsə gər işarə pul.

Məkkə yolunda xərc olunur, gah Mədinədə,
Gahi şərabə sərf olunur, gah qumara pul.

Bilməm nə qüvvədir, bu nə tə'siridir pulda,
Aləmdə istəsən gəlü hər növ' karə pul.

Bir eybi vardu, çox mütəkəbbürdü bə'zi tək,
Daim özün çəkər füqarədən kənarə pul.

Dünyada nikü bəd yetişir xalqa puldan
Gah əngəbinə, gah dönər zəhrimarə pul.

Salmış xəlayiq içrə bəsi şurü qülqülə,
Durmuş özü o halətə, eylər nəzarə pul.

Bir parə əqdinaməvü qəbzə basar peçat,
Şəltükzarü-kasibi eylər icarə pul.

Bə’zilərə fərahim edər fərşü rəxtxab,
Bə’zilərə qərar verib pusti-parə pul.

Bə’zilərin bu əsrdə Qarunə döndərib,
Əshabi-kəhf tək neçəsin saldıtarə pul.

Gah Lənkəranda Hacı Nəsirə nəsib olub,
Zeydə verib həsir salıbdır həsarə pul.

Hacı filan ağaya çoxdur məhəbbəti,
Salmış onun məhəbbətini aşikarə pul.

Yarəb, səbəb nədir ki, bu növi hərisdir,
Hər yerdə olsa, adəmi-bie’tibarə pul.

Gah Bakıdə Nəğıyova vermiş kürurlən,
Əngüştnüma edib onu xürdü kübarə pul.

Gah Hacı Hacıağanı milyançu eyləyib,
Əhli-cahan ara gətirib iftixarə pul.

Bə’zi ləimü nakəsə vermiş bəs iqtidar,
Eylübdü bu zəmanədа sahib idarə pul.

Baxsa bəsirətilə görər mərdi-huşiyar,
Damın qurubdu, danə səpib hər güzarə pul.

Üz döndərəndə əsbi çıxardar qərarıdan,
Üz göstərəndə qatırı bağlar qatara pul.

Gəh beççəyi-rəiyyəti eylübdü kəndxuda,
Gəh göndərib bəy oğlunu hər gün biyarə pul.

Bir para şəxs öləndə qoyar yerdə bikəfən,
Gəh kisə-kisə xərc olunur bir məzara pul.

Gəh bir hasardar yeri zirü zəbər edər,
Gəh bir xərabə yerdə tikər bir minarə pul.

Çox tazə kərbəlayiləri tacir eyləyib,
Mərcanü kəhrəba ilə cəngi-sitarə pul.

Mollavü şeyxü seyyidü tüllabi seya edər,
Gahi üqab kimi çıxanda şikarə pul.

Gah şahı filbənd qılar, qah vəziri mat,
Rux göstərib, piyadəni eylər süvarə pul.

Mətlüb olub cahanda cəm'i-nüfus üçün,
Cüz ənbiya, əimmeyi-həştü çahara pul.

Hər işdən ötrü istədiyin istəsə edər,
Gər eyləsən o babidə min istixarə pul.

Yox Qasir ilə heç bu bipərin ülfəti,
Şama əgər tapılsa, tapılmaz nahara pul.

## ƏSKİNAS

Ey büti-rə'nayi-zaman, əskinas,
Şahidi-zibayi-cahan, əskinas.
Cismilərə ruhi-rəvan, əskinas,
Vəzni-səbük, qədri-giran, əskinas,
Rahəti-dil, behcəti-can, əskinas,
Qasiri-binamü nişan, əskinas.
Vəsfi edər şərhü bəyan, əskinas.

Sən kimi bir gülrüxü dilbər hanı?
Şuxü gül, əndamü-səmənbər hanı?
Hüsnü tüba, sinəsi mərmər hanı?
Hüsnünə dünyada bərabər hanı?
Sən kimi şirin hanı, şəkkər hanı?
Səndə olan zinətü zivər hanı?
Arifü hüşyarü qələndər hanı?
Ey yüzü gül, qönçə dəhan, əskinas.

Gah acı tox, gah toxu ac elər,
Fəqir oduna sinəsin amac elər.
Arifi nakəslərə möhtac elər.
Müflisə sərmayə verib hac elər,
Çox hamının mülkünü tarac elər.
Çox papağı kəllədə qıyqac elər,
Bir para yırtıq külahi tac elər.
Sud verir, gah ziyan, əskinas.

Xalü xəttin vəsfi bəsi tuldur,
Hər vərəqi lö'ləyi-şəngüldür,
Hacı Hacı ağa ona quldur,
Hər nə danışsa, sözü məqbuldur,
Vəslini istər çoxu məsluldur,
Bir silə versin ona mövsuldur,
Cümlə olur təb'i-rəvan, əskinas.

Bir nəfərə lütfilə etsə xitab,
Əlli tərəfdən eşidər min cavab,
Dəhrə salıbdır nə əcəb inqilab,
Yaxşı deyib bir-birinə şeyxü şab.
Şişə çəkib çoxları eylər kəbab,
Kaş olaydi diri Hacı Turab,
Görəydi eylər nə fəğan əskinas.

Gah yüzün surx, gahi ağdır,
Gah bədəni cift, gahi tağdir,
Xalü xəti şöhreyi afaqdır,
Hər kimə varsa, damağı çağdır,
Xülasə mə'şuqi-hər üşşaqidır,
Hacı Nəsir vəslinə müştaqidır,
Bir də filan oğlu, filan əskinas.

Bir para bədxülqi xoş əhval edər,
İstəsə bir dövləti pamal edər,
Bülbüli-şirinsüxəni lal edər,
Yolçuları maliki-əmval edər,
Taciri bir ləhzədə həmmal edər,
İstəsə hər karı bəhərhal edər,
Gah çinin, gah çinan, əskinas.

Nərmi bədən şuxu güləndam,
Sürxü rüxü səbzi-siyah famsən,
Məkri-zaman, fitneyi-əyyamsən,
Əhli-cahan içrə niku namsən,
Hökmü-rəvan, sahibi-ehkamsən,
Cümlə könüllər quşuna damsən,
Bizlərə yox, özgələrə ramsən,
Gahi nəriman, gahi samanisən,
Mərhəmi-hər dərdi-nihan, əskinas.

Bir deyiləm talib olan mən sənə,
Acmamışam güşeyi-damən sənə,
Talib olur mərdilə hər zən sənə,
Yoxdu bizim əsrdə düşmən sənə,
Baxanda gözlər olu rövşən sənə,
Mail olubdur gülü gülşən sənə,
Lalərüxü qönçədəhan əskinas,
Ey büti zibayi cahan əskinas.

Bir-birinə vurdun ata-qardaşı,
Çox adamın başına saldın daşı,
Təb'idəni, süflələrin yoldaşı,
Nəqiyova sən eylədin gözü qaşı,
İndi olub Bakıda tacirbaşı,
Bizlərə də yavan yedirtdin aşı,
Səndən olub usta başi hər naşı,
İndi tutar tirü kəman, əskinas.

Əhdində varsan necə badi-səba,
Bir sənəmi cilvəgəri-dilrüba,
Xasiyyətü cövhərinə mərhəba,
Eyləmisən çoxları zərri qəba,
Ağa Əliəkbəri etdin iba,
Bir gecədə yorğanı oldu əba,
Bir gecə şalvarı tuman, əskinas.

## ŞƏHƏRİN QAZISI HAQQINDA (F)

Məhəmməd adlı bir qazımız vardır,
Bütün şəhər əhli ondan bezardır.

Təəssüf adıdır onun Məhəmməd,
Sanki eşşəkdə var bəzəkli zinət.

Bizim şəriəti o verir bada,
Heyf ola ondakı müqəddəs ada.

Dilində deyirsə dininə İslam,
İşilə İslamı eyləyir bədnam.

O, özü Allahdan qafildir, şəksiz,
Xəcalət çəkirik o məl'unla biz.

Bütün əməlləri pis, yaramazdır,
Ona şeytan desəm, yenə də azdır.

Hiyləylə dolu bir əmmaməsi var,
Adı pak, müqəddəs, özüsə mürdar.

Bir qızı istəsə iki şəxs əgər,
Kim rüşvət verərsə ona düzəldər.

Görməmiş zəmanə bu əclaf kimi,
Belini qırsın qoy dinin sahibi.

Oxusa bu şe'ri o əclaf qazı,
Şübhəsiz qalacaq məndən narazı.

Özünü Rüstəmə bənzədib alçaq,
Mənim ünvanıma min ox atacaq.

Deyirəm: Tülkü bəy, dərəsə-xəlvət,
Lə'nət bu qaziyə, min kərə lə'nət.

## DÜNƏN GECƏ QULAĞIMA(F)...

Dünən gecə qulağıma bir səs qəldi qeybdən:
Zəmanədən dostluq tamam yox olmuşdur biləsən.

Acı keçdi bu ay və il mənim üçün dünyada,
Bu məzmunsuz ayım, ilim verdi ömrümü bada!
Əziz ömrüm sərf olundu ahü nalə, fəryada,
Bu aləmdə rast gəlmədim bir vəfalı dosta mən.

Ömür boyu yaxşılıq et, bacarırsan nə qədər,
Mərdanəlik axtarma sən, alçaqlardan, et həzər!
Unutma bu sözlərimi, mə'nasına sal nəzər,
Yaxşı olar ayrılasan zatı qırıq kəslərdən.

Çoxları var, toplamışdır sonsuz malü dövləti,
Bə'ziləri cəhənnəmi, bə'ziləri cənnəti.
Təkəbbürlə dolanırlar, pozurlar hər adəti,
Peyğəmbərəm deyirlərsə, özləridir Əhrimən.

Dövrümüzdə təəssüf ki, qiyməti yox sən'ətin,
Azacıq da dərk eyləmir hər kəs şe'rin ləzzətin.
Bu əsrdə saxlamırlar şairlərin hörmətin,
Nizamini, Firdovsini, Sə'naini yox bilən.

Bu dünyada hər bir işdən xoşdur vəfa, e'tibar,
Qafillərdən, əvamlardan çox üstündür sənətkar.
Cavanmərddə olmalıdır səxa, qüvvət, iqtidar,
Yaxşılıq və pislik qalar bu dünyada hər kəsdən.

Bu aləmin meydanında hər kəs çapır atını,
Ya yıxılır, ya da qurur fərəhlə həyatını.
Ağlı olan təkəbbürlə çəkməz heç öz adını,
Xalq hər kəsin qiymətini özü edər müəyyən.

Qulağıma gəlir, budur, bülbüllərin nəvası,
Ruhu açır bahar çağı yurdumuzun səfası.
Ləzzət verir şe'rü qəzəl, qəsidənin sədası,
Füzulinin, Nəvainin sözünə aşiqəm mən.

Mübarək ay gəldi, mənsə, oldum belə xəstəcan,
Hilal kimi incəlmişəm olmuşam çox natəvan.
Bu mərəzə tapmayıram başqa cürə bir dərman,
Ancaq buna çarə olar qənd ilə çay şəkərdən.

Ətirli, xoş çayların da növü çoxdur dünyada,
Ancaq Papov çayından, bil, üstün yoxdur dünyda.
Başqa qənddən ağ möhürlü qənd yaxşıdır, sal yada,
İftar vaxtı ləzzət görər bu qəndilə çay içən.

"Abi-həyat, peşməyi ye' deyib mənə həkimlər,
Gözləyirəm bu yaxında göndərəcək bir nəfər.
Kaş olaydı bunlar mənə hər zamanda müyəssər,
Mənə qaba və ləbbadə verənlərə çox əhsən.

Dostlarımın görüşündən həmişə mən çox şadam,
Əzizlərin vəsli verir mənə daim xoş ilham.
Bu söhbəti edirəm ki, xoş olsun bizə əyyam,
Yoxsa mənim xislətimdə gədalıq yoxdur əslən.

Bu dünyanın dövlətindən olmasa da nəsibim,
Hər bir şeydən qiymətlidir mənə, dostum, həbibim.
Bu şərtlə ki, İsa dəmli olsun mənim təbibim,
Cana gəlim şirin-şirin dediyin hər sözündən.

Kalamımın məzmununu ağlı olan dərk edər,
Hünərlinin hünərini hünər əhli tez bilər.
İdrak lazım, anlasın ki, necə olar xeyrü şər,
Şe'rimizə qiymət verər ancaq bu vaxt əhli-fənn.

Qasir üçün şe'r yazmaq olmuş daim bir şüar,
Onun təb'i gecə-gündüz dürlü şeir yaradar.
Olmamışdır ömür boyu bir şey üçün təmə'kar,
Təhqir olar pay umsa o bir yaramaz kimsədən.

## MÜSTƏZADLAR

Ey qönçədəhan, simi-bədən dilbəri-tənnaz,
Ey sərvü sərəfraz.

Oldum dəxi qurbanın olum rəhm eylə bir az,
Bəsdir, bu qədər naz.

Yandım, külə döndüm, yanasan sən də mənim tək,
Ey doxtəri-tərsa.

O nakəsilə olma dəxi həmdəmü həmraz,
Vallah belə olmaz.

Adəm kimi çoxdandır olub virdi-zəbanım,
Ya rəbb zəlləmənə.

Amma ki, nə hasil o cəfapişə inanmaz,
Birdən mənə baxmaz.

Sən böylə bilirdin ki, özün aşiq olubsan,
Kül başına olsun.

Dur belə ocağı yandır, yaşdı, alışmaz,
Öz başına olsun.

Min dağı əgər bir nəfəsə canıma qoysa,
Bir uf deməzəm mən.

Amma onu görcə məni yanına qoymaz,
Bir busəni qıymaz.

Barı, hər iki ildə soruş halımı az-maz,
Ya bircə kağız yaz.

Tuti kimi fəryad elərəm xəstəvü rəngur,
Bu künci qəfəsdə.

Bir püstə ilə kimsə məni yadına salmaz,
Bir könlümü almaz.

Ey bülbüli-biçarə, fəqan etmə dəmadəm,
Səbr eylə, dost ələ.

Daim ki, qış olmazmı həmişə belə qalmaz,
Əlbəttə, gəlir baz.

Üz vurma, məni seyri-gülüstana aparma,
Ey həmdəmi-can.

Yüz fəsli-bahar olsa mənim könlümü açmaz,
Bu keydən açılmaz.

Yarım yenə məndən küsüyüb, acıq edibdir,
Ox-ox, aman Allah.

Bilməm nə qılım, çarə nədir bir özün açmaz,
Bir kəlmə danışmaz.

Könlüm evini şükr, qəm eylədi viran,
Saqi sənə qurban.

Dur ver ki, bu sisqa bir-iki camla dolmaz,
Ta düşməsə qanmaz.

Sal qülqülə bu günbədi əflakə xüruş et,
Ey rəfzəni-çabuk.

Mütrüb, dəxi sən şədd bir nəğməvü şəhbuz,
Ey mürgü xoşavaz.

Hər nə deyəcəksən deginən, canıma xoşdur,
Ey zahidi-bədkiş.

Baxma ki, belə acizi miskindi zəbanı,
Hey-hey həzər ondan.

Mövla bili yoxdur özü tək rəndi nəzərbaz,
Əyyari-çəpəndaz.

Dəryayə daş at, ya qayaya sal zərrə danışmaz,
Hərgiz ki, bulaşmaz.

***

Bu fəsldə,saqi, mənə ver badeyi-gülrəng,
Qəlbimi tutub zəng.

Var qəsdi mənimlə, bu zəmanə eyləyir cəng,
Oldum necə diltəng.

Gəl şurə, müğənni, oxu zabil, sölə ahəng,
Vurma bizə neyrəng.

Ahəstə oxu nəğməni, mən tək eləmə ləng,
Yə’ni ola bir həng.

Divanə sifət şişeyi-tə”bimə vurur cəng,
Guya ki, atıb bəng.

Bu yari-cəfapişə məni qıldl pərişan,
Dut zərbi-humayun.

***

Bir yanda çıxıb seyrə pərəstəndeyi-İsa,
Tökmüş yüzə geysü.

Bir yanda düzəlmiş neçə şuxi-şəkərasa,
Qamətləri qırqu.

Bir yanda dağılmış çölə ətfalı-kəlisa,
Çün beççeyi-ahu.

Bir yanda vurur canü dilə milləti-Musa,
Xəncər kimi əbru.

Bir yanda könül damə çəkir düxtəri-tərsa,
Ol gözləri cadu.

Billəm ki, tamaşaya çıxıbdır yenə Sən"an,
Ol aşiqi-məhzun.

***

Yarəb, nə kərəmdir ki, olub saxtə gülşən,
Çün guşeyi-cənnət.

Nərgiz gözü məxmur olub lalə müzəyyən,
Vermiş üzə zinət.

Tutmuş güli-nəsrin bənövşə dəxi süsən,
Sünbül bilə ülfət........................

Bülbül çəkər əfğan, qılır naləvü şivən,
Yox güldə mürüvvət.

Gül şaxəsi yaprağdan açıb şövqilə damən,
Var qəsdi, həqiqət.

Gönçə aça ağzın, tökülə, lə’li-Bədəxşan,
Çün gövhəri-məknun.

***

Bir yanda edir mədrəsə küncündə ibadət,
Şol firqeyi-tüllab.

Gahi zərəbə yəzribu, gəh bəhsi-qiraət,
Gəh məbhəsi-əbvab.

Şövqilə hamı badeyi-ləbriz edib adət,
İçməkliyə tüllab.

Gah şe’rü qəzəldən, gəhi söyləllə hekayət,
Cümlə oldu bitab.

Şurilə oxurlar hamısı ayeyi-cənnət,
Təzvir olu nayab.

Bir yanda müəllimlər oxur ayeyi-Qur’an,
Ya hikmətü qanun.

***

Saqi, yetib əyyami-bahar, oldu gülüstan,
Bu səfheyi-hö’mun.

Qumru eyləyir naləvü bülbül çəkir əfqan,
Ba dideyi-pürxun.

Qoyma ki, qıla bağrımı hər ləhzə mənim qan,
Bu gərdişi-gərdun.

Nəzzarə qıl üşşaqlərə, etgilə dövran,
Bir badeyi-gülgün.

Bir rövzeyi-rizvanə dönüb xütteyi-Şirvan,
Ey qadiri-biçun.

***

Saqi, dur ayağa, mənə ver badeyi-səhba,
Bila cür'ə qılım nuş.

Bir tərhlə gəl gərdişə, ta şişeyi-mina,
Camə edə gürnuş.

Saqi, dur ayağa, ver edim badəsifət nuş,
Ol lə'li-ləbindən.

Həsrətlə sürahi eliyə sağərə kürnuş,
..........................................................

..........................................................
..........................................................

..........................................................
..........................................................

## QİT'Ə (F)

Yeməkdən istəyim bunlardır mənim:
Duz, çörək, pendir və qatıqla soğan.

Ancaq qatığı tapmayıram mən,
Başqalarsa yeyir kabab, fisincan.

Qatıq da naəhlin payına düşüb,
Qaçır mənim kim əhl adamlardan.

Üzü qara olsun bu kasıbların,
Ağlı var tez köçüb getsin dünyadan.

## RÜBAİLƏR (F)

Mənə kömək elə, ey pərvərdigar,
Mənə lütfün ilə, düzəlt ayrı kar.
Qoyma müştərisiz qalsın mətaim
Ya da düzəlt mənə bir ayrı bazar.

***

Ey xuda, elmimdə mahir et məni,
Qəlbimi təmizlə tanıyım səni.
Qasirin təb'inə özün rövnəq ver,
Göndər mətainə qiymət verəni.

***

Zəmanə əhli çox paxıldır, aman,
Onların işləri ziyandır, ziyan.
Səni and verirəm müqəddəsatə,
Yarəb, bizə göndər bir layiq insan.

***

Hamı vüsalını istər, ey nigar,
Kuyinə can atar bütün adamlar.
On dörd gecəlik ay gördüm deyildir,
Hüsnü camalına bərabər, ey yar!

***

Bilirəm dünyadan köçdüyüm zaman,
Bitər qəbrim üstə çoxlu gül, tikan.
Gülləri savabım bitirəcəkdir,
Tikanlar bitəcək günahlarımdan.

Çalışmaq olmasa iş asan olmaz,
Göz yaşı tökməklə kişi ad almaz.
Demirəm sən baxma ay üzlülərə,
Ancaq özünə də fikir ver bir az!

***

Yoxdur zəmanədə mənə layiq yar,
Həsrətdən, nalədən başqa yoxdur kar.
Başqanın içi boş qozu satılır,
Nə üçün şe'rimə yoxdur xəridar?!

## GÖRDÜM YENƏ CANANI...

Gördüm yenə cananımı canan arasında,
Guya ki, durub huriyi-qılman arasında.

Hər kim görə ol qaməti-mövzunu deyər kim,
Bir sərvi-xuramandü gülüstan arasında.

Ox tək qədi-dilcuyi olub canıma peyvənd,
Ney-ney bir əlifdir, yazılıb can arasında.

Gördüm gözünü zülfi-siyahilə, dedim bəs,
Nərgis açılıb sünbüli-reyhan arasında.

Bir zərrə camalından olub Leylidə zahir,
Məcnun, yeri var, qalsa biyaban arasında.

Mə'nada ona cilvə edib eşqi-Züleyxa,
Qoydu neçə il Yusifi zindan arasında.

Hüsnilə sənə Yusif ola bəlkə bərabər,
Vəsf eyləyib Allah, onu Qur'an arasında.

Hər dəm görünür həlqeyi-zülfində camalı,
Bir kuyi-bilurinidü çovkan arasında.

Hər laf vuran kimsəyə aşiq ola bilməz,
Aşiq odu kim, can verə meydan arasında.

Ey kaş, ola bu Qasiri-biçarə müqəssir,
Məhbus ola ol çahi-zənəxdan arasında.

## ƏGƏR ZƏMANƏDƏ...

Əgər zəmanədə min mahruy dilbər, ola,
O kimdi hüsndə, ey məh, sənə bərabər ola.

Tutubdu zülfi-siyahın tək aləmi zülmət,
Götür niqabi yüzündən cahan münəvvər ola.

Qaşındır qüvseyn, xalın həcər, qədin tuba,
Üzün behişt, ləbin səlsəbilü kovsər ola.

Xətadu gər verələr müşki zülfüvə nisbət,
Rəva deyil ki, cahan sərbəsər müəttər ola.

Ölüncə, söyləyəcəkdir cəmalıvün vəsfin,
Füzuli, Hafizi-Şirazi ya ki, Qasir ola.

## EY YARİ-GÜLRUX...

Ey yari-gülrux, sinəmi bil firqətin qıldı kəbab,
Saldı məni həm kuyinə kəc qaşların, qıldı itab.

Gəl bircə lütfilə nəzər eylə məni-biçarəyə,
Çox şaiqəm məh ruyinə, insafa gəl, eylə şitab.

İçdim məhəbbət badəsini, düşdüm bəla girdabına,
Yarəb, məni bu qüssədən eylə xilas, oldum xərab.

Hər dəm fəraqi-yardan, yarəb, bu həsrət gözlərim,
Guya bahar əyyamıdır, ağlar fəğanilə səhab.

Ey kaş, ola cananımın canına bu canım fəda,
Yarəb, bu canan haqqında eylə duamı müstəcab.

Dilbər, məni yandırdı bu nakəs rəqibin tə'nəsi,
Bir bərqəi çək ruyidən düşsün işıqdan afitab.

Ol şuxü cadu gözlərin aldı əlimdən səbrimi,
Ol şirşəkkər ləblərin qoymub dəxi qəlbimdə tab.

Qasir, bu qədr yanmısan eşq atəşinə çəkmə əl,
Dilbəri-tənnazdan gər olsa dərdin bihesab.

## ƏQL BAŞIMDAN ÇIXIB...

Əql başımdan çıxıb, yarın yenə guşin görüb,
Eşkdən çeşmim tökər qan, lə'li-meynuşın görüb.

Xeyli müşküldür meyi-lə'lindən etmək arizu,
Allah, Allah, bir piyalə badənin nuşin gördüm.

Eyb etmin gör qılam divanələr tək min xüruş,
Çün könül meyxaneyi-eşq içrə meynuşin görüb.

Bu səbəbdəndir düşüb bəxtim kövkəb bürcünə,
Ol büti-şəkkərləbin mahi-siyahpuşin görüb.

Rəhmə gəlmişdir, yüzə zülfün pərişan eyləmiş,
Lap mən biçarənin əhvali-məğşuşin görüb.

Aşiqə üşşaq ara bu rütbə bəsdir, dilbərin,
Hər baxanda zülfünə cani-fəramuşin görüb.

Bu vüsalın şükrünü Qasir yəqin etməz təmam,
Xab ara dildarilə həmxabi-ağuşin görüb.

## EDƏNDƏ TÜRƏYİ-ŞƏBRƏNGÜL...

Edəndə türəyi-şəbrəngün ənbərəfşanlıq,
Yetər bu xatiri-viranə yüz pərişanlıq.

Bu qədri aşiqi incitmə, tərki-cövr eylə,
Degil bu qaidə üşşaq içində cavanlıq.

Qiyam edəndə qədin arizün olanda əyan,
Cahansərasər olur sərvü baği-bostanlıq.

Təhəmmül eylə, edən vəqtdə qətli-aşiqə hökm,
Yetişməsün sənə bu babidə peşimanlıq.

Silüb yüzün ərəqin səp həvayə şəbnəm tək,
Təmam səfheyi-afaq ola gülüstanlıq.

Ola əqiqi-ləbin gər nigini-xatəmi-dil,
Zaman-zaman edərəm də’viyi Süleymanlıq.

Cəfa az et mənə, ta verməsün rəqib sənə,
Bu şanu şövkətilə ehtimali-nadanlıq.

Vəfa yolunda bəsi nəqdi-can verir Qasir,
Tapıb həmişə bu sövdadə eyni nöqsanlıq.

Tapılsa gər bu zaman içrə bir vəfa əhli,
Ölən günə kimi eylərdim ona dərbanlıq.

## BƏRGİ-GÜL ARİZİ-ALINDAN.....

Bərgi-gül arizi-alından olubdur mövcud,
Müşkü ənbər, xətü xalından olubdur mövcud.

Xızr üçün abi-bəqa və əbədi nuri-həyat
Qönçeyi-lə'l misalından olubdur mövcud.

Sərvü şümşada bu qaməti-rə'nayi-lətif,
Sənin ol tazə nihalından olubdur mövcud.

Necə sən kimi dilara dili-viranımda
Bağlayıb nəqşi-xəyalından olubdur mövcud.

Məndə bu qədr kim atəş, görünür, sabitdir,
Yə'ni, ol rəşki-zülalından olubdur mövcud.

Bu nəzakət ki, olur sayiri-məhrulərdə
İşveyi-təncü dəlalından olubdur mövcud.

Qasirin sineyi-zarındakı pünhan qəmlər,
Bil sənin şövqi vüsalından olubdur mövcud.

## EY SƏRƏFRAZ...

Et sərəfraz, Qasiri gəl bir səvab elə,
Həsrət çəkən rəqibini sinəkəbab elə!

Bir lütf qıl dübarə, məni eylə sərbülənd,
Bu bədgüman hasidi, hali-xərab elə!

Qoyma görə rəqibi, camalın görəndə sən,
Zülfi-siyahi arizi-mahə niqab elə!

Mənlə düşəndə söhbətə xəndan olub danış,
Düşmənlərə acıqlı-acıqlı xitab elə!

Məndən gələndə xidmətinə lütf qıl rəsul,
Biganədən gələndə danışma, cavab elə!

Görsən əgər nəvaziş elə mən şikəstəni,
Amma rəqib nakəsə çox-çox itab elə!

Əğyarlar sözünə baxıb çıxma rahidən,
Gör döğru yarsan, belə göftarə tab elə!

Çəkdin bu odlu sinəmə dagi-fəraqini,
İnsafa gəlgilən, məni bir qul hesab elə!

Çoxdandı dəyməyibdi dilimə meyi-lətif,
Lə’li-ləbinlə gəl məni məsti-şərab elə!

Heydər məhəbbətinə, mənə etmə çox cəfa,
Məndən də etməsən əgər, onda hicab elə!

Qəsdin əgərçi canımı almaqdadır mənim,
Ol dideyi-siyahını bir nimxab elə!

## DİNDİRSÜN OL RƏQİBİ...

Dindirsün ol rəqibi çəkilləm, o gül yüzyn,
İstər birini mah, birin afitab elə!

Hicrində bəs ki, bir əlil olmuşam, məni,
Məstanə bax, yüzümə dübarə şəbab elə!

Bax bülbül ilə xarə, gülüstanü gülşənə
Ey məhliqa, bu barədə hökmü kitab elə!

Bu ruzigar əhli ilən olma aşina,
Əqvamıdən kəs ülfətini, ictinab elə!

Ey kaş, tez yetəydim nigarın vüsalına,
Yarəb, duayi-Qasiri, sən müstəcab elə!

## DİLBƏR, MƏNİ-SİTƏMZADƏNİ...

Dilbər, məni-sitəmzadəni xar eyləmə!
Hər nanəcibi gəl özünə yar eyləmə!

Qoyma kənar gülşəndən əndəlibini
Gül yarpağını xarə giriftar eyləmə!

Söyləllər dilbərin sənə baxmaz, bu söz nədir?
Ölləm, bu növ'qissəni izhar eyləmə!

Gər məstsən, bu sözdə ayıl, hüşyar ol,
Tuni yerinə zağilə göftar eyləmə!

Salma hicaba bir də o mahi-münəvvəri,
Biçarəyəm, bu gözlərimi tar eyləmə!

İnsafa gəl, dağıtma bu gülzari-eyşimi,
Gülzari-hüsnünün vərəqin xar eyləmə!

Bir para bihəya sözünə vermə əqlini,
Düşmənlərim yatıbdılar, bidar eyləmə!

Al canımı, xilas elə, bir yol qutar məni,
Bir də əsiri-türreyi-tərrar eyləmə!

Zülfün kimi olubdu pərişan bu könlüm,
Qəl şanə çəkmə, bir də məni zar eyləmə!

Gər sorsalar ki, Qasirə, dildar, sən o dəm
Mərdanə söylə kim, bəli, inkar eyləmə!

Billah ki, bil, bu nalə səni dilfikar edər,
Qıl ehtiyat, bir də diləfkar eyləmə!

Bu qədr zülmlər ki, rəva görmüsən mənə,
Barı bu zülmü etməyə iqrar eyləmə!

Qasir, yetər harayına şiri-xuda Əli,
Bir də dəxi bu sözləri təkrar eyləmə!

## ƏRƏQDƏN ARİZİN, EY MAHVƏŞ...

Ərəqdən arizin, ey mahvəş, düşmüş əcəb halə,
Deyərsən bərgi-gül üzrə düzülmüş qətreyi-jalə.

Xəcalətdən bənövşə baş aşağa rusiyah olmuş,
Baxıbdır gülşəni-hüsnündəki müşkin xətü xalə.

Əcəb əhsəndir hüsnün, mən nə növ ilə edim təqrir,
Nə müşkül bəhsdir kim, az gəlir bu hərfi-ə'lalə.

Sənin zülfün məgər dami-bəladır, xalların danə,
Mənim könlüm quşu xof eyləyib hər dəm çəkər nalə.

Yüzün cənnət, qədin tuba, ləbin kövsər, özün huri,
Yetişmək çox çətindir bu təmənnayə, bu amalə.

Camalın səfhəsində həlqeyi-zülfün görən dəmdə,
Dedim guya qəmərdir, bəs alıbdır dövrəsin halə.

Xəyalı-badən ilə Qasir öylə məst olmuşdur,
Əgər yüz min Ərəstu gəlsə, bil, gəlməz dəxi halə.

## BİR PƏRİZADƏ UYUBDUR(N)...

Bir pərizadə uyubdur bu dili-divanə,
Bağlanar axırı zəncirə, düşər zindanə.

Nə pərizad diyarında belə dilbər var,
Nə belə huri tapılmaz, girəsən rizvanə.

Neçə əyyam vüsalilə dolandım nagah,
Bisərü pa dolanıb düşmüşdüm hicranə.

Dil təmənna eləyib vəslinə, nagəh gördüm,
Min xiyal ilə yetib kuyi-səri-cananə.

Bəxt yar oldu, verildi bizə təxt üstə məqam,
...............................................................

...............................................................
Guyiya bəzmimiz ol dəmdə olub şahanə.

## DÜŞDÜ CANIM, BİLMƏDİ...

Düşdü canım, bilmədi, bir xəncərəbru fikrinə,
Çeşminin əfsunu gəlməz heç cadu fikrinə.

Nari-firqətdən olub sinəm ətəş, qıldım fəğan,
Var təmənnayi-ləbin, ondan düşüb su fikrinə.

Əqlü huşi əldən almış, indi can fikrindədir,
Sən nə söylərsən, könül, dildarının bu fikrində?!

Yoxdu heç aqil olan şəxsin yanında surəti,
Düşsə hər kim gündə bir zibavü məhru fikrinə.

Ol qədər kim, cövrü zülm etdi mənə ol dilrüba,
Heç kimin gəlməz yəqin böylə cəfacu fikrinə.

Çıxma dəşti-eşqə, seyd etmə, könül, qıl ehtiyat,
Sən özün bir seydsən, gəl düşmə ahu fikrinə.

Mən cününü sərxoşa heç eyləməz zəncir tab,
Bu səbəbdən Qasirin gəldi o keysu fikrinə.

## EY DİL, XƏBƏRDAR OLGİLƏN...

Ey dil, xəbərdar olgilən, mən aşiqəm bir sərvərə,
Bir xoşsifət, sahib kərəm bir zülfü mişgin pərvərə.

Yoxdur nəziri-bigüman bu aləmi viranədə,
Bənzər o şəkkər ləbləri guya ki, lə’li-əhmərə.

Yoxdur o qədri tab, bu nitqimdə söyləyim ismini,
Bais olur, aşiq seçər icmi dönəndə məxmərə.

Çəkdim cahanın möhnətin, Məcnun kimi oldum cünun,
Cana yetişdim axırı bir namə yazdım dilbərə.

Lütfə gəlib bir dəm edə bəlkə bu dərdimə dəva,
Ta qoymaya naləm yetə hamunü dəştü göylərə.

Bir ləhzə bax mən bikəsə, rəhm elə ahü naləmə,
Ağlar mənim əhvalıma hər dəmdə əhli-məqbərə.

Yox Bakı gərmü sərdidən, billahi, hər ol kimsənə,
Aşiq ola bu dəhridə sən kimi bir xoş mənzərə.

Çeşmin gələndə fikrimə sallam xəyala nərgisi,
Qaşın düşəndə yadıma qıllam nəzarə xəncərə.

Yoxdur hərası zərrəcən, aləm hamı düşmən ola,
Vardır ümidi Qasirin hər dü cahanda Heydərə.

## JALƏDƏN SƏHRADƏ...

Jalədən səhradə çün ləbriz olub, daməni-jaj,
Bu səbəbdəndir özün üştər edər qurbani-jaj.

Jaj bəd heybət deyil, surətdə uştur-xaridən,
Heyf kim, bu mə’nidən agah olmub cani-jaj.

Jaj xadır mədhkulər mədhi mövladan savay,
Mədhi mövlad olur bəc dərd üçün dərman-jaj.

Jində içrə zəndələr viranələrdə vardı künc,
Kim bilir batində var lə’ləi mərcan-jaj.

Jərf bəhri heyrətə qərq oldu Qasir, ya Əli,
Bir təvəccö qıl nəbat içrə ola sultan-jaj.

## Ə'LA, EY BİVƏFA YARIM...

Ə'la, ey bivəfa yarım, gözəllərdə vəfa olmaz,
Sənin tək rəhmsiz namehribanü pürcəfa olmaz.

Ə'la, ey dilbəri-şirinzəbanü mah rüxsarım,
Mənim bu dərdi-bidərmanıma heç bir dəva olmaz.

Hər ol aşıq cahanda xof edə bir qətrə qanından,
Gedər əqli əlindən, fikri, huşi, cabəca olmaz.

Deyər eşqim, gəl eylə sən məni izhar aləmdə,
Və lakin qalmışam sərgəştə bu qəlbim riza olmaz.

Gəl, ey aşiq, gedək meyxaneyi-eşqə, içək badə,
Ətibbaxaneyi-möhnətdə bimarə şəfa olmaz.

Könül, gəl yazgilən ol dilbəri-rə'nayə bir namə,
Məbadə olma qafil, hər zaman badi-səba olmaz.

Gəl, ey hüsnü camalın padişahı, aləmə sərvər,
Şəfəqqət et məni-zarə, bu qədri iddəa olmaz.

Nihanü aşikara vardı çox-çox aşiqi-miskin,
Mənin tək bu cahanda eşqə heç kəs mübtəla olmaz.

Gəl, ey biçarə könlüm, həmrəh ol mən binəva ilə,
Gedək bir intəhasız aləmə orda bəla olmaz.

Yəqin et, ey nigari-məhvəşim, bu ruzigar içrə,
Mənim tək aşiqi-məhzun, sənin tək qəmfəza olmaz.

Sənin, ey şuxi-şəkkərləb, cahana ehtiyacın yox,
Təəccübdür, niyə sən kimi dilbərdə səxa olmaz.

Gəl, ey Qasir, yerində bir qədəm aram otur dinmə,
Çəkil, səbr eylə, sən aşiqdə bu qədri həva olmaz.

## GÖRƏ HƏR KƏS CAMALIN...

Görə hər kəs camalın mahi-aləmtabə meyl etməz,
Ləbin müştaqi hərgiz bu cahanda abə meyl etməz.

Olan hər bəzm ara xürrəm o ləfzi abdarından,
Dəxi batmaz əqiqə, dürrə, lə’li-nabə meyl etməz.

Qaşın tağın görən kimsə keçər bilmərrə canından,
Olur divanə, baxmaz xəncərə, mehraba meyl etməz.

Məhəbbət məhfəlində şad ola hər kim məqalından,
Kəsər ülfət, cahanda söhbəti-əhbabə meyl etməz.

Müzəyyən hüsnünü görməkdən ötrü Qasiri-şeyda,
Bu fikr ilə qalır bidar, daim xabə meyl etməz.

## EY OLAN HƏR İKİ ALƏMDƏ...

Ey olan hər iki aləmdə mənə yari-əziz,
Ey vuran firqəti bu sinəmə bir xəncəri-tiz.

Yandırıb canımı hicrin, necə insafdı bu,
Verəsən ruhuma yüz işvə ilə rahi-giriz.

Ey fədası ola canım o kaman əbrunun,
Tiri-müjganı salıb aləmə qovğayi-sitiz.

Bilmisənmi, sənə mən aşiqəm, ey gül çöhrə,
Ey diləfruz, cigərsuz, əya nəsrinxiz.

Bu yəqinimdi, keçər vadiyi-eşqi bu zaman,
Gər verəm tövsəni-təb"ə cövəlanü məhmiz.

Etdi mən qəmzədəni ayrılığın dilxəstə,
İltifatın yoxumuş bəs mənə, ey mehrəngiz.

Guşeyi-çeşmin edər halımı hər dəmdə xərab,
Canıma şur salır o ləbi-şəkkəramiz.

Nə edim çarə, xudaya, bu dəvasız dərdə,
Məhv edib aləmi ol şanəkəşü ənbərbiz.

Ey mənə tə"nə vuran kimsənə, aram oturan,
Deməyin məst olub Qasiri-biçarəyə siz.

## FƏRAĞINDA GÖZÜMDƏN ÇEŞMƏLƏR...

Fərağında gözümdən çeşmələr oldu rəvan sənsiz,
Əyildi qamətim, ey sərv qədd, oldu kəman sənsiz.

Həqiqət çox yamandır, yardan düşmək cüda, hicran,
Bir az müddətdə eylüb qönçə tək bagrımı qan sənsiz.

Buna çox şad idim kim, baş qoyardım asitanında,
Gədalar tək və leykin olmayaydım biəman sənsiz.

Alır dərd çevrəmi hicran qəmi qılmış məni dilxun,
Qəribəm, qürbət içrə çox keçər halım yaman sənsiz.

Necə bülbül əli güldən üzülsə, ahu-zar eylər,
Onun tək mən də qıllam naləvu ahü-fəqan sənsiz.

Gecə fikr ilə yatmaqdan, səhərlər qüssəvü qəmdən,
Saraldı rəngim, oldu cismi-zarım natəvan sənsiz.

Həyatımda sənin yadından özgə qeyri-zad olsa,
Həram olsun mənə, ey dilrüba, eyşi-cahan sənsiz.

Zebəs köksümdə çəkdim nalələr, cismim dönüb nala,
Olub gülzari-eyşim badi-hicrandan xəzan sənsiz.

Çəkər biçarə Qasir firqətindən daima, dilbər,
Aman sənsiz, aman sənsiz, aman sənsiz, aman sənsiz.

## Ə’LA, EY MAHİ-RÜXSARIM...

Ə’la, ey mahi-rüxsarım, olan bu dəhridə mümtaz,
O zülfi-ənbərəfşanın edib can almaga agaz.

Əgər ol məhcəbini bənzədəm mahə, xəta qıllam,
Səbəb bu mahida var navəku tiri-xədəng əndaz.

Girib gülzarı-işrətdə xuraman, ey gözəl gəzmə,
Xəbərdar ol, gəlir nagəh kənari-dəştidən şəhbaz.

Yəqin et, dəhr ara çox bihəyanı nitqidən sallam,
Əgər mən bikəsə birdəm ola ol dilrüba dəmsaz.

Gətirrəm şurə vəhşü teyrü əflakü səmavati,
Əgər lütfilə baxsa ruyimə, ol dilbəri-tənnaz.

Nəvaziş etsə mən zarə əgər ol yari-bihəmta,
Davam etməz müqabildə nə Sə’di, Hafizi-Şiraz.

Xəyali-digər etmə, zahida, mən aşiqəm, billah,
O məhbubə kitabında onu tə’rif edib sərbaz.

Bu qədri eyləmə təzviri-Qasir, hiylədən əl çək,
Gəl etmə eşqini pünhan, yəqin et, faş olur bu raz.

## BU DƏHRDƏ ƏRBABİ MÜRÜVVƏT[N]...

Bu dəhrdə ərbabi mürüvvət, ələ düşməz,
Mən istədiyim sahibi-himmət ələ düşməz.

Hər bir tərəfə seyr edərəm məhz cəhənnəm,
Dincəlməyə bir guşeyi-cənnət ələ düşməz...

## BƏS Kİ, ƏHSƏNDİR YÜZÜN...

Bəs ki, əhsəndir yüzün heç nəqşi-digər istəməz,
Mən bu vəchilə dedim: bu vəch zivər istəməz.

Əşki-çeşmim səfheyi-ruxsarı qıldı laləgun,
Bir də ol məh surətindən kəsbi-əhmər istəməz.

Mişki-zülfündən sənin əxz eyləyib rütbə bunu,
Bu müşəxxəsdir ki, müşki əzfər ənbər istəməz.

Natəvan canım düşüb qətli-vüsalın əzminə,
Qaşların müştaqıdır, bir ayrı xəncər istəməz.

Lə'lə baxmaz görsə hər kəs qönçeyi-xəndanını,
Bir də bil, məhşər günündə abi-kovsər istəməz.

Naz ilə rəftar edən sərvini görsə bağban,
Bag ara şümşadü azadü sənubər istəməz.

Var nə qədri bu fəna dünyada ömrü dilbəra!
Qasiri-biçarə, səndən qeyri dilbər istəməz.

## OLAN MÜXBİR SƏNİN[N]...

Olan müxbir sənin keyfiyyətindən zarsiz olmaz,
Düşər sevdayi-eşqə, şübhəsiz asarsiz olmaz.

Sənin şeydaların məndən qılıb divanəlik kəsbin,
Bu məzmunun bəyani dəftərü-tumarsiz olmaz.

Binayi-eşq olan kəsdə gərəkdir bu ki təb’ olsun,
Neçün kim, rəsmdir bu, heç bina me’marsız olmaz.

Rəqibi-bihəyaya söylə bizdən çəksin əl, bilsin,
Xədəngi-ahımızda var şərər, xünxarsız olmaz.

Yüzündə zülfünə Əbdül-Əlinin tutmasunlar eyb,
Müşəxxəsdir deyərlər kim, xəzinə marsız olmaz.

Əyər tə’rif qılsam qamətin ol şuxi-sərməstin,
Cahanın gülşənində sərvlər rəftarısız olmaz...

## GƏTDİ ŞÖVQƏ, DİLBƏRA...

Qətdi şövqə, dilbəra, ol surəti-ziba məni,
Gülsitani-hüsnün eylub bülbüli-şeyda məni.

Yusifi-Misri əgər tutdu Züleyxa nəfsini,
Saldı vəhşi tək çölə ol nərgisi-şəhla məni.

Bu qədər kim, nalə var mən bikəsü məhcuridə,
Qorxuram məst eyliyə ol taməni səhra məni.

Düşdü şurun başıma məst oldum, ey şirinsifət,
Axırı Fərhad edər, billah, bu sevda məni.

Qoy yetişsin vəslinə bu aşiqi-biçarəni,
Bu necə insafdır, eşq eyləsin rüsva məni.

Barilaha, bidəva dərdimə sən eylə əlac,
Olmuşam Məcnunsifət, yandırdı bu Leyla məni.

Lal olmuşdum yüzünü görcək ol məhpeykərin,
Getdi küftarə əcəb bu lö'lo'yi-lala məni.

Dilbəra, axırda billəm məsti-layəqəl edər,
Bu bülurin saqi nazik, gərdəni-mina məni.

Dur ayaga, dövr elə bir cami-ləbriz ilə sən,
Şövqə getsin bir zaman bu badeyi-səhba məni.

Aşiqa, gəl bir nəzər eylə, bu türki şe’rimə,
Yandırıbdır bir büti simintəni-yəğma məni.

Bir əlac eylün məni-biçareyi-şeyda üçün
Bilməzəm bimar edib, ol laleyi-həmra məni.

Bir kəminə qətrə tək bir guşədə aram idim
Dilbəra, şurə gətirdün, eylədün dərya məni.

İczilə tutdum yüzümü dərgahına oldum dəxil,
Lütf qıl, sən şad eylə, ey xaliqi-yekta məni.

Qoygilən bir guşeyi-meyxanədə rahət olum,
Bu qədər incitmə sən, ey şuxi-bipərva məni.

Qasiri-biçarənin saldın səməndər tək oda,
Səhlidir bu, eyləyibsən Vamiqü Əzra məni.

## YÜZÜ ZÜLFÜN HƏVƏSİ[N]...

.................................................................
.................................................................

Yüzü zülfün həvəsi, ey sənəm, sövdai,
Qeysi-sərgəşteyi hər Leylü nahar etdi məni.

Bu xətadidə gozün gör nə xətalar eylədi,
İki səyyad kimi tutdu, şikar etdi məni.

İki kafir gözün əz bəs ki, qılıb fitnəvü məkr,
Məzhəbü dinidən, ey mah, kənar etdi məni.

Hər cəfa yetsə sənə, Qasir, o şirin ləbdən,
Nuş söyləmə kim yar zar etdi məni.

## SAHİBA, VƏSF ELƏDİM...

Sahiba, vəsf elədim gör necə dilbər, Həsəni,
Nəzmə çəkdim ol zülfi-müjbər, Həsəni.

O Həsən kim, yüzi isminə müsəmma olmuş,
Eylədim tə'bimi arayişi-zivər, Həsəni.

Həsənin hüsnü nəhayətdə Həsəndir, tutaram,
Hüsndə Yusifi-Misrilə bərabər, Həsəni.

Arizində Həsənin kəşfü kəramətlər var,
Görsə islamə gələr zümreyi-kafər, Həsəni.

Eyləyib zülfi-Həsən müşki-müəttərdən**....**
Ya edib müşki-Xəta böylə müəttər, Həsəni.

Ya Həsən qəndi alıb ağzına, şirin eyləyib,
Yada şirin eləyib qənd müəttər, Həsəni.

Həsənin çöhrəsi ilə eyləyibdir güli rux,
Ya da kim şərh eyləyibdir güli-əhmər, Həsəni.

Olmayıb əsrdə heç kəs bu vəcahətdə ogul,
Doğmayıbdır məlahətdə, nə madər Həsəni.

Taqi-əbrusini mehrab sanıb səcdə edər,
Görsə məsciddə əgər vaizi-minbər, Həsəni.

Gər məni zövqlə səndən tələb etsə Qasir,
Can verib eyləmə, əlbəttə, mükəddər, Həsəni.

Qasira, tə'bini peyvəstə edər müstəhsən,
Ya ki, versə sənə gör saqiyi-gövsər, Həsəni.

## UYMA EY DİL[N]...

Uyma ey dil, qəflətə, az xürdü xab etmək gərək,
Mə'siyətdən fayda yoxdur, səvab etmək gərək.

Zə'fidən cümlə qəvayi-süst cismim natəvan,
Əşki-həsrətlən bədən mülkün xərab etmək gərək.

Sərf qıldın cifeyi-dünyaya nəqdömrüvi,
Bilmədin bu fitnələrdən ictinab etmək gərək.

Karivan bir-bir gedər, biz dalda qaldıq, ey könül,
Bir mətaun varsa əyləşmə, şitab etmək gərək...

## GÖRSƏN, EY BADİ-SƏHƏR[(N)]...

Görsən, ey badi-səhər, cilveyi-cananımızı,
Ona mə’lum elə şərhi-qəmi-hicranımızı.

Belə bir ərzimi ol dilbərə izhar eylə,
Yandırıb hicr odu cismimizi, canımızı.

Hansı dilbər bu qədər aşiqinə zülm eylər,
Necə qıldı bu xaraba dili-viranımızı.

Gecə-gündüz ciyərim yandı, qəmin çəkməkdən,
Kimə izhar eyliyək bu qəmi-pünhanımızı.

Hanı bu şəhridə bir dilbəri-Yusif tə’lət,
Tapılır müştərilər kərm edə bazarımızı...

## YETİB NAMƏN...

Yetib namən məni pəjmürdəhali-dilfikar etdi,
Alıb səbrimi əldən qəlbimi çox biqərar etdi.

Baxanda xirələndi gözlərim xətti-şərifindən,
Gəlib əfğana, bu viran olan könlüm qübar etdi.

Olub məzmunu çün məfhum, şad oldum nəhayətsiz,
Vəli, bir para sözlər könlümü biixtiyar etdi.

Gözümdən namə üstə əşki-gülgunim rəvan oldu,
Cəmali-səfhəni bir ləhzədə bagü bahar etdi.

Məni həsrət qoyan vəsli-nigara bir rəqib olmub,
Mənə bu cövrü zülmi bu həyasız ruzigar etdi.

Sual etdikdə Qasir haləti-canani qasiddən,
Gəlib bülbülsifət göftarrə qəsdin aşikar etdi.

Dedi: Canan gəlir, can istəmək məqsududur səndən,
Nə gəldi canımı alsın, məni çox intizar etdi.

## DİLBƏRA, SALDIN ƏCƏB...

Dilbəra, saldın əcəb fikrətü təşvişə məni,
Az qalıbdır ki, həlak eyliyə əndişə məni.

Sən əzəldən mənim əhvalıma müstəhzərsən,
Himmətim qoymaz əgəm boynumu hər xişə məni.

Dusti-xalis bilib əhvalımı qıldım sənə faş,
Qoyma yalvarmağa hər nakəsi-bədkişə məni.

Niyə səndən ola bəs əksi-müradım zahir,
Həm kabab eyliyəsən, həm çəkəsən şişə məni.

Lütf qıl, səngi-cəfailə vurub sındırma,
Aləmi-mehridə fərz etgilən bir şişə məni.

Yazdığın namə yetişdi mənə, açdım oxudum,
Quyiya parələyib yüz təbərü tişə məni.

Zə'fi-iqbal, ədəmi-tale-nasaziyi-bəxt,
Saldı xəlq icrə əcəb dilə səni, dişə məni.

Bigüman töhməti-bimə'niyi-əfsanəyi-xəlq,
Aparır axırı Rumə səni, Təfrişə məni.

Bəxt yar olmadı, iqbal vəfa eyləmədi,
Qoydu bu il belə bisənətü bipişə məni.

Yoxsa nolmuşdi belə guşeyi-qürbətdə qalam,
Xalq təşbih edə bir sayilü dərvişə məni.

## VERMİŞDİ VƏSL VƏ'DƏSİ...

Vermişdi vəsl və'dəsi, çün yar gəlmədi,
Çox çəkdim intizarı o dildar, gəlmədi.

Qət' oldu səbr riştəsi hicrində dilbərin,
Salmış yüzünə türreyi-tərrar, gəlmədi.

Can nəqdini nisar edər idim ayağına,
Səd heyf eylədi günümü tar, gəlmədi.

Az qaldı intizar məni eyləsin həlak,
Oldum zəifü xəstəvü bimar, gəlmədi.

Yarəb, nolurdü bir yol öpeydim buxağını,
Ta gərm oleydi rövnəqi-bazar, gəlməqi.

Hər busəsinə can verəydim o məhvəşin,
Bilməm neçün bu cinsə xiridar gəlmədi.

Öz əhdimə vəfa eylədim mən əcəb budur,
Qoymuş adını yari-vəfadar, gəlmədi.

## BİR GÜN FƏZAYİ-QƏLBİMƏ...

Bir gün fəzayi-qəlbimə saldım xəyalımı,
Gördüm vurub müayinə ol növ qəzalımı.

Məbhut olub yıxıldım o dəm xaki-payinə,
Bəlkə bu növ'ilən alam ondan vüsalımı.

Nagah baxıb yüzümə, salıb nitqdən məni,
Yıxdı o tövr baxmağı nəxli-nihalımı.

Bildim şüküftələnməyə maildi qönçəsi,
İstər şəfəqqət ilə coruş sən də halımı.

Ərz eylədim hüzuri-şərifinə dərdimi,
Səbrim gedib, alıbsan əlimdən məcalımı.

Billəm ki, yazmaq ilə yetişməz nəhayətə,
Dildar ala mə'quli-cəvabü sualımı.

Qasir, bu qədri etmə şikayət nigardan,
Öz taleim yəqin elə bəd vurdu falımı.

## NƏ TÖKMÜSƏN YÜZƏ...

Nə tökmüsən yüzə ol türreyi-siyahkarı,
Olub zəmanədə mişkin kasad bazarı.

Salıbdır rəxnə yüzün mülki-Çinü Maçinə,
Müsəxxər eylədi zülfün diyari-tatarı.

Sirişki-didəmi mən’ etməyin yağar baran,
Günün yüzü tutulan vəqtdə əbr edər zari.

Gəhi kəmanü, gahi tiğü gah xəncərlən,
Zəman-zəman edüsən mən fəğirə azarı.

Xılas qıl məni bir dəfə tiri-qəmzə ilən
Ki, heç kəs belə öldürməyib günahkarı.

Düşübdü səfheyi-rüxsarə həlqeyi-zülfün,
Bəli, qəra qul olub Kə’bənin pərəstarı.

Yüzündə zülfünü gördüm dedim əbəs sözdür,
Deyəllə qoymuyacaqlar behiştə küffarı.

Görüb o Leyli camalını əl çəkin məndən,
Qoyun düşəm çölə Məcnunsifət, sizi-tarı.

Tutub əlində görər cür’ətilə can nəqdin
Ki, Qasira bu mətain mənəm xiridarı.

## KƏSİLMİŞ DİL DANIŞMAZ(N)...

Kəsilmiş dil danışmaz lal olub gülzaridan ayrı,
Tutulmuş nitq heç göftara gəlməz yarıdan ayrı.

Məni az dindirib, artıb qəmi-hicri-cigərsuzim,
Damar qan gözlərimdən ol büti xuxarıdan ayrı.

İşimdir ağlamaq, ayrılmışam ol məhcamalımdan,
Necə bülbül düşəndə zar olur gülzarından ayrı.

## BƏLAYİ-HİCR ƏLİNDƏN...

Bəlayi-hicr əlindən olmuşam divanə, dildarım,
Dəxi yox çarə, könlüm qəsd eylər canə, dildarım!

İlahi, hicri sal bir dərdə, görsün ləzzəti-hicri,
Olur bir ləhzə kim, məndən cüda məstanə, dildarım!

Düşəndə yadıma çeşmin, axar min çeşmə çeşmimdən,
Könül mə’’murəsin hər dəm qılar viranə, dildarım!

Xəyalım birlə canım kuyinizlə pasibanızdır,
Sənə şayəstədir lütf eyləmək mehmanə, dildarım!

Camalından səba bir buyi-xoş gətdi məşamimə,
Dönüb pəjmürdə könlüm rövzeyi-rizvanə, dildarım!

Sənə hər əhli-dil dünyada, cana, bir nəzər baxsa,
Yəqin üqbada baxmaz huriyü qılmana, dildarım!

Görəndə qamətini yansam mənə eyb etmə adətdir,
Görəndə şəmi-şövqindən yanar pərvanə, dildarım!

Yüzündə, dilbəra, meyxanə bəzmi-aşikaradir,
Qaşın  saqi, ləbin mey, gözlərin peymanə, dildarım!

Xəyalım, quşları ol dami-zülfün aşiyan etməz,
Bu qəsdilə yüzündən dənləsinlər danə, dildarım!

Tutub dünbaleyi-çeşmində canı Qasirin aram,
Baxa həm nərgisə, həm bağa, həm bostana, dildarım!

## BU GÜN KÜÇƏ ARA NAGAH...

Bu gün kuçə ara nagah keçirdim, yarımı gördüm,
Məni yüz min bəlayə tuş edən dildarımı gördüm.

Əlimdə nəqdi-canım cüstü-cüsində idim ol mahin,
Qəzadən kuçə içrə Yusifi-bazarımı gördüm.

Gəzirdim bülbüli-şeydasifət hər bağü bostanı,
Vəli, bir rəhgüzərdə bu güli-gülzarımı gördüm.

Nəzakətlə qoyur hərdəm ayağın, yer çəkər nazın,
Çəkib fəryad, ahəstə belə əğyarımı gördüm.

Baxırdım həsrət ilə hüsnünə ol mahi-rüxsarın,
Yüzündə aşikarə sabitü səyyarımə gördüm.

Baxıb ol dəm yüzünə düşdü taqətdən təni-zarım,
Dönüb tabutə cismim, qət’ olub rəftarımı gördüm.

Gəlib göftarə tuti tək, açıb lə’li-şəkərbarın,
Alıb aramımı itmam edibdir karımı gördüm,

Mənim tək Qasiri-məhzunu min dərdə duçar etdi,
Olub qaib gözümdən dideyi-xunbarımı gördüm.

## ŞÜKRLİLLAH Kİ, DÜNƏN...

Şükrlillah ki, dünən bağ ara xürrəm idim,
Bir neçə mahivəşü simtənə həmdəm idim.

Səf bəsəf huruyi-qılman düzülmüşlər idi,
Bircə o bəzmdə mən zar bəni-adəm idim.

Hər tərəfdən tökülmişdi zülfi-siyahi yüzə,
Qara bəxtim açılıb, cilvələnib biqəm idim.

Məni hərçənd məhəbbət meyi məst etmiş idi,
Leyk göftaridə, rəftaridə müstəhkəm idim.

Hüsnü bağinə o məhbubeyi məhbubələrin,
Bağiban idi gözüm, leyk özüm məhrəm idim.

Bəs lətafət yetirib olmuşudum qətrə sifət,
Bu nəhayətdə necə gül yüzünə şəbnəm idim.

Əhli-ürfani şəbistana manəndi çırağ,
Şüəra sözlərinin zəxminə bir mərhəm idim.

Gər adım Qasir idi, leyk hərifim yox idi,
Dilimin xəncəri dəstimdə, rəvi Rüstəm idim.

## BU QƏZƏL YETKƏC MƏNİM...

Bu qəzəl yetkəc mənim tə’bimə təhrir eylədim,
Öz yaman halımı təhririlə təqrir eylədim.

Ol pərivəş surətin gətdim xəyala bir zaman,
Öylə bildim, afitabı çərxi-təsxir eylədim.

Göz yaşı mə’mureyi könlümü qılmışdı xərab,
İndi bağrım parəsilə yaxşı tə’mir eylədim.

Kuyi-dilbərdən qəza üzdü əlimi zülmlə,
Bu cavan ömrümü verdim badə, həm pir eylədim.

Xabidə gördüm mənə dildar olmuş xəşminak,
Xabidən bidar olub, bərəks tə’bir eylədim.

Çün səba derdi ki, yarın can təmənnasındadır,
Şadlıqdan qəşş edib, səd heyf, tə’xir eylədim.

Qasira, dilbər haçan qətlimə durdu turşru.
Verməyib mən canımı canana təqsir eylədim.

## SƏD ŞÜKR XUDAYA...

Səd şükr, Xudaya, yenə cananımı gördüm,
Ol mah rüxü zülfi-pərişanımi gördüm.

Guya deyəsən çıxmış canımı gördüm,
Çox şayığıdım, tazə gülüstanımı gördüm,
Təşbehi bəla, dinilə imanımı gördüm,
Bir şuxi-diləfkar qəzəlxanımı gördüm.

Yə’ni dodağı qönçəyi-xəndanımı gördüm,
Yox heç qəmim, gözləri məstanımı gördüm,
Lə’lində olan çeşmeyi-heyvanımı gördüm,
Ətrafı Ərazdə məhi-Kən’anımı gördüm.

Çəkməz əlini mürği-səhərxiz çəməndən,
Müşküldü könüllər quşu ayrı ola səndən,
Aşıqlərə feyzi təkəllüm o dəhəndən,
Tuti sifətəm, şübhəsi yoxdur bu bədəndən.

Salmış gözünün gərdişi gərduna fəsadi,
Müngərlərə zəm eyləyən aşiqlərə yadı,
Zahir olur, əlbəttə, bu dildarı təmənnadı,
Bundan ötrü gəzmişəm hər misri bəladı.

Çün ismi onun Əbdüləlidir bişək, ləbi şəkər,
Kiprikləri ox, gözləri nərgiz, qaşı xəncər,
Tutmuş yüzünü şöhrəti afaqi sərasər,
Gercək səni mən söylərəm, ey mahi-münəvvər,

Olmuşdu könül şəhri ara şuri-hüveyda,
Divanəsifət, gəlmişidi başıma sevda,
Sevdası bu divanəliyi etdi peyda,
Hicrində onun olmuşudum bülbülü şeyda.

Könlüm dəxi az eyləgilən naleyi-əfqan,
Bəsdir bu qədər olma gilən hali-pərişan,
Fikrin o idi eyliyəsən canını qurban,
Fəxr eylə, söylə bu sözü, ey natiqi-xoşhal.

## MƏN FƏDAYƏM, SƏNİN OL(N)...

Mən fədayəm sənin ol zülflərin şanəsinə,
Gözünün əşkiylə dolu peymanəsinə.
Mürği-hal aşiq olubdur yüzün danəsinə,
Dami-zülfün ona gər versə aman Əbdüləli.

Neçün mülki-Arazdan, ey əzizi-növbəran,
Bu şeyda Qasirin qəlbinə lövdür pərişan.
Hali-üşşaqə, naleyi-ahü fəqan kəbirdən.
Sən etsən bivəfalıq, etmərik namehribanlıq.

Sənin barəndə, billah, etmədik heç bir yamanlıq biz,
Gör özgə simü zər verdi edərdik canfəşanlıq biz
Edərdik şaneyi-zülfündə, əlhəqq, cani-fəşanlıq biz,
Kəminində eylərdi aşikara pasibanlıq biz.

Rəfiqim, mən kimi məhcur yoxduro qəmxarım,
Sənə dərdi-dilimi yazmışam, ey şuxi-dildarım.
Fəraqından sənin canına and olsun, budur karım,
Xəyalımdır, ənisi-munisim, yarım, dəmdəvarım.

## DÜŞDÜ ƏZİZLƏRİM, ŞƏRAR...

Düşdü əzizlərim, şərar, canıma bu xitabdən,
Nitq kəsildi, lal olub qaldım o dəm cəvabdən.

Bircə tərəhhüm et mənə, mən də olum fəda sənə,
Xəndəni aşıkar elə, şad olum bu babdən.

Salma hicabə ol məhi, cümlə gözəllərin şəhi,
Qəlbimi bircə şad elə, pərdə çək afitabdən.

Qaşların oldu cansitan, eylədi canımı nişan,
Dəmbədəm eylərəm fəğan, dideyi-nimxabidən.

Mahi-müniridir yüzün, qəndü nəbatdır sözün,
Zulfi-müənbərin alıb buyidə müşki-nabidən.

Ləblərinin əsiriyəm, zülfünün dəstgiriyəm
Mən bu dürrün fəqiriyəm, qoyma məni səvabidən.

Aşiqəm ol cəmalına, püşti ləbində xalına,
Gər bələd olsam halına, incimərəm itabidən.

Gəl bir işarə etgilən xəncəri-xunçəkanına,
Bəlkə edə bu canımı parə, qoya zihabidən.

Bir para bihəya ozün aşiqə nisbət eyləyir,
Billahi bigüman onun fərqi yox heç dəvabidən.

Ləzzəti tər buxağının cüşə gəlib məzaqidə,
Məhv edibdi əqlimi, ətr çəkib gülabidən.

Hər iki gülsitanda yoxdu qəmi, əgər ola,
Hər evinin xəmirəsi xaki-Əbu Türabidən.

İstədim öz həbibimin ismini aşikar edim,
Baz nihan eylədim kəsrəti iztirabidən.

Ey büti-biqərini-mən, dilbəri-məhcəbini mən,
Dərdimi ərz etmədim, bil sənə mən hicabidən.

Saqi, əcəl piyaləsi verdi məni-şikəstəyə,
Yoxdu qəmim, əgər çəkə yar üzünü niqabidən.

Etmə məzəmmət aşiqi ey eyliyən utangilən,
Həqqi məzəmmət etməyi tapmadım heç kitabidən.

Məstdü-eyni, lam olu mən kimi bidəram olu,
Hər kəs içə bu dəhridə cür'eyi-bu şərabidən.

Qasir özün bu dəhridə eylə cunun, ol dəli,
Arif olan seçər sənin eşqüvi bu hesabidən.

## NİGARA, BİLMİRƏM XURŞİDSƏN...

Nigara, bilmirəm xurşidsən, ya pareyi-məhsən,
Qərəz, mən binəvanın xütteyi-canında bir şəhsən.

Təhəyyir qalmışam, ey yari-səngindil, məni-zarın,
Verirsən qətlinə fərman, edibsən şad gəh-gəh sən.

Neçə mə'şuqlar öz aşıqın xarü zəlil etdi,
Və lakin xəşmidə, ya lütf qılmaqlıqda bəh-bəhisən.

Edərsən bəndəni xoşhal, əlac eylərsən, ey dilbər,
Yəqin billəm, əgər olsan mənim dərdimə agəh sən.

Əgərçi bəndi-zülfün gərdəni-üşşaqi xəm qıldı,
Zənəxdanın ara amadə qıl, ey yar, bir çəhsən.

Tərəhhüm etməsən, billahi billəm, bülbüli-təb''im,
Gülüstani-məhəbbətdə nə qədr vursa cəh-cəh sən.

Neçün görcək, nigarın vermədin əndamına busə,
Məgər, ey Qasiri-qasir, şüurun yoxdu, əbləhsən?

## SƏNSİZ GÖZÜMƏ TİRƏLƏNİB...

Sənsiz gözümə tirələnib aləmi-rövşən,
Bir fikr xəyalımda mənim yoxdu, məgər sən.

Şahid, buna baxgilən, öz əhvalına bir dəm,
Gör kimilə mənəsən, necə sənilə səni mən.

Hər dəmdə düşər başıma əyyami-mülaqat,
Könlüm eləyib növhə çəkər naleyi-şivən.

Ondan ki, qəza saldı bizi dərdi-fəraqə,
Bu vaxta kimi xəstəvü rəncur bulub tən.

Bir yandan edibdir məni hicran qəmi dilxun,
Bir yandan olub dərd mənə tə'neyi-düşmən.

Görcək yüzün Abbasımın oldum elə şad,
Guya tökülüb gözlərimin şəm'inə roğən.

Hər kimsəneyi-kim salıb Abbası nəzərdən,
Batsın hər iki gözlərinə navəki-suzən.

Ey kaş, Xudaya, nola bu Qasiri-miskin,
Abbas civarında qalıb eyliyə məskən.

## NİGARA, DÖVLƏTİ-HÖKMÜN(N)...

Nigara, dövləti-hökmün ziyad olsun, rəvan olsun,
Həmişə xatirin bəxtinlə şad olsun, cavan olsun.

Gələn vaxtında rəftarə, qədin, ey məh, rəvandır bu,
Ürəkdən, didədən, sərvi-səhi, yad olsun, nihan olsun.

Gətir bir gərdişə ol dideyi-məxmurunu cana,
Gər istərsən cahan bərbad olsun, imtahan olsun.

Nə meydir, bu tökübsən sağərimə məstü mədhuşəm,
Əlində, saqiya, fəryad olsun əl'əman olsun.

Yetişmək intəhayi-eşqə, rəhbərsiz deyil mümkün,
Əgər cismın, qəddin, Qasir, riyad olsun, kəman olsun.

## EY GÖZÜM, CƏHD EYLƏ...

Ey gözüm, cəhd eylə bu dünyada sən bir yar tap!
Yar tapsan, cəhd eylə, yari-vəfadar tap.

Bivəzən tək künclərdə məskən etmək ardır,
Arifi pəhriz edib bikarə gəzmə, kar tap.

Qıl təəmmül, atını səgritmə kuhistanda sən,
İstəsən at çapmaga səhrayə çıx, həmvar tap.

Bülbüli-şeyda kimi gülzar eylə arzu,
Zağsan, bərfərz get sən, bir uçuq divar tap.

Varı yox etmək, çoxu az eyləmək asandır,
Gər igidsən sən azı çox eylə, yoxdan  var tap.

Hasil olmaz xalq ara künci-ibadətçün firaq,
Mümkün olduqca ibadət etməyə, bir ğar tap!

Cahilü nadana həmdəm olma, gəz dana ilən,
Alimü dananı axtar, mərdümi-hüşyar tap!

Elmü sənət kəsb edib sən eylə təhsili-k.mal,
Qasira, sən öz mətain satmağa bazar tap.

## PAKBAZ OL, EY GÖZÜM...

Pakbaz ol, ey gözüm, cəhd eylə, yari-paki tap,
Seyr qıl, ibrətlə bu dünyada bir idraki tap.

Pəndi-pirə huşilən guş eylə qəflət eyləmə,
Xakidən seyr et, təriqi-aləmi-əflaki tap.

Payeyi-rifət tələb qılsan dolan mətlub üçün,
Xak olub izzət xəyalıyla dolansan xaki tap.

Padşahlıq istəsən, tərki-təəllüq et müdam,
Gər hədayi sərfsən, gəz bir giriban çaki tap.

Pudü tari ömründən bir rişteyi-möhkəm qayır,
Risman baziliğə həmrəngi bir çalaki tap.

Payibənd olma cahan mülkündə, əgləş ariyət,
Bəstəri rahət tələb etsən, xəsü xaşaki tap.

Pinəduz ol, sal əzəl bir vəslə öz nəleynövə,
Qeydi-nəfsi-şum üçün bir həlqeyi-fitraki tap.

Piri-salik məqdəmi üzrə qədəm qoy, Qasira,
Pakbaz ol, cəhd elə, əlbəttə, yari-pakı tap.

## ƏGİLMİŞ HƏLGEYİ-GEYSULARIN[N]...

Əgilmiş həlqeyi-geysuların rüxsara düşmüşlər,
Dil əhfarında guya ni'lilərdir, narə düşmüşlər.

Çəmən səhnində sanmun sərvü güldür belə ruhi-əfza,
Yüzünlən qamətindən əkslər gülzarə düşmüşlər.

Yüzün şövqilə güllər əl çəkiblər səhni-gülşəndən,
Olublar dəstə-dəstə kucəvü bazara düşmüşlər.

## HƏMİŞƏ KÖNLÜM OL...

Həmişə könlüm ol məhparənin vəslini yad eylər,
Budur bais, ona bu xəstə canım e’timad eylər.

Edibdir parə-parə könlümü bir az nigahilə,
Müşəxxəsdir bu cadugər cahanda çöx fəsad eylər.

Yüzün göstərcək o gülrux vücudimdən əsər qalmıb,
Gözümdən qayib olcaq dərdimi həddən ziyad eylər.

Bu yoldan dutmuşam şövqilə möhkəm daməni-hicri,
Yəqinimdir məni vəslindən ol məh namurad eylər.

Nə tərsa məzhəbin ol yari-birəhm ixtiyar eylib,
Nə dini-paki-islama həqiqət e’tiqad eylər.

Nədir yarəb, səbəb dilbər məni daim qılıb məhzun,
Rəqibin naz birlə xatirin peyvəstə şad eylər.

Biri yarsın qara bağrım, biri qanımı nuş etsin,
Gözü, kirpikləri birlə bu qəsdə ittihad eylər.

Yəqin kilki-qəza bu dəftəri-aləmdə əzzəldən,
Mənim bədbəxtlər silkində ismimi səvad eylər.

Yazanda səfheyi-divanə hicran şərhini Qasir,
Qələm kipriklərindən, göz qarasından midad eylər.

## NALƏ EDƏR GƏLƏNDƏ(N)...

Nalə edər gələndə mövsimi-bülbül-bahar,
Gülşən-ara açılırlar laləvü sünbüli bahar.

Aşiqi-dilbər gərək, qəddi-sənubər gərək,
Şişeyi-sağər gərək, eyliyə qülqüli bahar.

Yetişdi şirin Dadaş, danışdı şirin Dadaş,
Necə oldu şirin Dadaş, lə'li-ləbi gül bahar.

Eyləmə də'vayi-eşq mənəm xaki-payi eşq,
Qasirə sevdayi-eşq, Şakirə bir gül bahar.

## XABİDƏN NAZİLƏ...

Xabidən nazilə, Qasir, səni bidar eylər,
Elə kim, naleyi-bülbül gülü hüşyar eylər.

Çünki bir ləhzə sənin firqətinə yox tabım,
Dur ayağa, mənə hicrin bu qədər kar eylər.

Baxma hərgiz yüzümə gözləri xabaludə,
Çünki baxsan, məni-biçarəni bimar eylər.

Durgilən təbrikə, bir şuxi-cəfapişə gəlir,
Məsti tavuz kimi gör necə rəftar eylər.

Nə deyim görməmişəm bir belə xurşid camal,
Yüzünün şəşəəsi gözlərimi tar eylər.

Gözlərilə gəhi can almağa eylər iyma,
Qaşlarilə gəhi qan tökməyi izhar eylər.

Bilmirəm mən, bu necə şüxü pəri peykərdir,
Məni hər ləhzədə yüz dərdə giriftar eylər.

Səndə, ey şux, necə nazü nəzakətdir bu,
Qasiri həşrə kimi zaru-diləfkar eylər.

## QÖNÇƏ GÖRSƏ LƏBİNİ...

Qönçə görsə ləbini agzını pünhan eylər,
Lalənin bağrını lə'lin həvəsi qan eylər.

Güli- rüxsarına bülbüllər olubdur mail,
Gecə-gündüz bu səbəbdəndi ki, əfğan eylər.

Arizin içrə yəqin zülfünü görmüş sünbül,
Gülşən içrə səri-zülfünü pərişan eylər.

Verir İsa kimi yüz mürdeyi-sədsaləyə can,
Hər zaman ləblərini kim, şəkərəfşan eylər.

Bu cəfapişə əlindən cigərim qan olmuş,
Hər baxanda yüzümə könlümü viran eylər.

Bu qədər cövrü cəfa çəkmisən ol dilbərdən,
Qasir, axırda sənin dərdinə dərman eylər.

## AÇILMIŞ GÜLŞƏNİ-BƏXDİM...

Açılmış gülşəni-bəxtim gəlibdir şurə, naz eylər,
Mənə ol dilrüba əhli-vəfa rəsmini saz eylər.

Gəzər biganələr kuyində hərdəm eylər ol məhru.
Məgər mən bikəsü biçarəyə lütfini az eylər.

Yəqin bədməstliyindəndir, sənin qarətgəri-hüsnün,
Baxanda çeşmim içrə din evini tərkü taz eylər.

Gələndə gərdişə ol nərgisi-caduyi-əfsungər,
Görəndə kafiri sədsaləni əhli-namaz eylər.

Xədəngindən fələklər, ey pəri-peykər, düşüb xofə,
Qaşından, ey mələksima, mələklər ehtiraz eylər.

Sənin tək bir güləndamın vüsalın istəyir Qasir,
Qoyub torpağa başın, iczilə, razü niyaz eylər.

## MƏNƏ HƏR DƏM NƏLƏR OL...

Mənə hər dəm nələr ol türreyi-ənbərəfəşan eylər,
Qılar həm ruzigarım tirə, həm bagrımı qan eylər.

Əcəb səyyaddır xalın, tumari-zülfü dam etmiş,
Çəkib dil mürğini, ol damə salmış, natəvan eylər.

Nə halət bilmirəm, yüz vermiş ol zülfi-siyahkara,
Bulud tək tirələnmiş gün yüzün gözdən nihan eylər.

Qaşın, kipriklərin, zəxmin və rənci-zülfü pürtabın,
Mənim tək dərdə dözməz görsə hər kim tərki-can eylər.

Sual eylə səri-zülfündən, ey məh, bu qara bəxti,
Nədir bais görək üşşaq ara bixaniman eylər.

Xilafi-rəsmimiş söyləyirlər kafir cənnətə getməz,
Nədir bəs arizin üzrə qara zülfün məkan eylər.

Səri-zülfündə canı eylədim sövda, zəhər tapdım,
Bu sevdadan məgər hər kimsə sud istər, ziyan eylər.

Pərişanhal olub zülfün kimi bu Qasiri-nalan,
Əyilmiş qaşların tək çeşminə qəddin kəman eylər.

## Kİ, EY NİGARA, RUXİ-ƏHMƏRİM...

Ki, ey nigara, ruxi-əhmərin ol laləyə bənzər,
Vəli, o nərgisi-cadu gözün piyaləyə bənzər.

Sənin yüzün qəmərə, şək yoxdu, ey məhi-ənvar,
Gözün bu canıma qəsd eyləyib, dütaləyə bənzər.

Sənin o lə'li-şəkkər, yəni gül dodaqlarına bil,
Yəqinim oldu ki, rəngi ləyəndə qaliyə bənzər.

Sənin ləbin o ləbə gəc düşübdü nöqtəsi bərəks.
Qələtdi, qoy onu aşiq dililə yaliyə bənzər.

Gəl indi vergilə sən mətləbimi, taki çəkim əl,
Gələndə nitqə sözüm, billah, ahü naləyə bənzər.

Mənim bu səfheyi-təbim səni mühübbün ilə,
Xuda güvahıdı, bir möhrü olan qəbaləyə bənzər.

Tərəhhüm eylə, aya, əksi-Leyli, billahi, Qeysə,
Bu qədr Qasiri sən qoymagilə, laləyə bənzər.

## HƏR LƏHZƏ VƏLVƏLƏ CANIMA OL...

Hər ləhzə vəlvələ canıma ol çeşmi-şəhladan düşər,
Suziş dili-suzanıma, ol ruyi-zibadan düşər.

Çəksən o məhrüxsaridan, ey gülüzarım, pərdəni,
Heç şəkk yoxdur nurdan ay, gün, təcəlladan düşər.

Dilbər, behiştin ne'məti yetsin vüsala yadıma,
Bu istibahi-pakidən bu cami-minadan düşər.

Ey dil, qəm etmə bir para nakəs keçibdir həddidən,
Eyləyibdi tüğyan, axırı billəm ki, baladan düşər.

Dildar lütf etsə mənə, yazan, o söz ki, söylərəm,
Vallahi, belə bilmişəm, bir qətrə dəryadan düşər.

Bu vaxtlarda Qasiri-biçarəyə, qıl bir nəzər,
Gər yetməsə məqsudinə bil nitqi guyadan düşər.

## RİŞTEYİ-ZÜLFÜN OLUB XƏM-XƏM...

Rişteyi-zülfün olub xəm-xəm, əcəb zəncirdir,
Qaşları tiği-bəla, çeşminə pür tədbirdir.

Mən həqiqət bilmərəm nərgisdi bu çeşmin və ya,
Bir silah badam kim, ətrafı durmuş tirdir.

Bəs ki, şirindir sözün, oldu məgər bir qənd tək,
Kipriyin tiri-cəfa, əbruların şəmşirdir.

Kövkəbi-bəxtim yatıb, ya rəbb, nədir bəs çarəsi,
Ey qəza etdin mənə sən bu necə təqdirdir.

Rəsmidir ahunu seyd eylər, tutar səyyadlar,
Bu nigarın gözlərinin adəti nəxcirdir.

Rubəru baxmaq xətadır səfheyi-rüxsarına,
Çox təkəllüm eyləmək sənlən böyük təqsirdir.

Qıl həzər ahımdan, ey məhru, xəbərdar eylərəm,
Naleyi-zarım mənim bişübhə aləmgirdir.

Çoxdu dərrakəm, mənə, vaiz, nəsihət eyləmə,
Eşq rəhbər, fikir vazeh, əql mürşid pirdir.

Qasira, bu qədri kim, sən dəm vurarsan eşqdən,
Ya həqiqətdir sözün xəlq içrə, ya təzvirdir.

## DİL MEYLİNİ BİR TİRREYİ...

Dil meylini bir türreyi-şəbgirə salıbdır,
Divanəyə bax kim, özünü girə salıbdır.

Nahaq yerə saldı özünü dami-bəlaya,
Bu qana bulaşmış məni təqsirə salıbdır.

Könlüm yüzünün Kə'bəsinin tövfinə getcək,
Şam əhli tutubdur onu, zəncirə salıbdır.

Əfsungəri-çeşmin hələbi-arizin içrə,
Çəkmiş həbəşi qulları təsxirə salıbdır.

Kipriklərinin qəsdi budur, qanımı töksün,
Bilməm nə səbəb var, niyə tə'xirə salıbdır.

Dün guşimə bir nalə səsi yetdi çəməndən,
Bu nalə mənim könlümü tə'sirə salıbdır.

Dil verdi sənin zülfi-pərişanına dilbər,
Xali-siyəhin Qasiri təzvirə salıbdır.

## HƏR ZAMAN MƏCLİSƏ Kİ...

Hər zaman məclisə ki, badeyi-külfam gəlir,
İşrət əhlinə anın etdiyi bayram gəlir.

Gənci-Qarunu tapıb, rütbeyi-Cəmşidə yetir,
Hər kimin pir əlindən əlinə cam gəlir.

Dilbərin zülfü rüxün gördü dili-şeydani,
O zamandan bəridir sübh gedir, şam gəlir.

Razi-eşqi deməniz hər kəsə, ey aşiqlər,
Püxtələr söhbəti napüxtələrə xam qəlir.

Cismdən əl götürüb can çıxar istiqbalə,
Bilsə can almağa ol şuxi-güləndam gəlir.

Olmadı vəsl müyəssər mənə olmaz, heyhat,
Qurtarıb omrümüz, günlər keçir, axşam gəlir.

Qəsdi-cənnətlə yüzün tövfinə derlər, zahid,
Təmeyi-xamilə bağlub o da ehram gəlir.

Mürği-dil seydi üçün arizə düşmüş zülfün,
Yoxsa səyyaddü, almış ələ bir dam gəlir.

Buyi-zülfünü səba gətdi dilaramı üçün,
Ta bilə xəstə könüllər ki, dilaram gəlir.

Qasira, möhnəti-əyyamə təhəmmül eylə,
Sığın Allaha, dayan, gör nə sərəncam qəlir.

## YÜZÜNDÜ ZÜLFÜLƏ...

Yüzündü zülfilə, ya mahi çardəhi şəbdir,
Belə müşəxxəs olur kim, qəmər dər əqrəbdir.

O höqqeyi-dəhənindirmi, ya ki çeşmeyi-nuş,
O tüng şəkkərdir adı, ey nigar, ya ləbdir.

Nə dilrübasən, ey mahi rux, sənin mehrin,
Qülubi-cümleyi-üşşaqidə mürəkkəbdir.

Nə cəzm edib dili-dağıdar çoxdandır,
Quyudi-zülfünə pabənd olub müəzzəbdir.

Edib vücudumu eşqin bəsani-xakistər,
Nə şərh edim bunu, bir can güdaz mətləbdir.

Ələddəvam edirəm nalə, eyləməz tə"sir,
İlahi, bu necə iqbaldır, nə kövkəbdir.

Bu doğrudur ki, olur əhli-eşq divanə,
Bu aşiqə nəzər et, lütf elə, müəddəbdir.

Yazıbdı vəsfini Qasir, bevəchi-əhsən ilə,
Mühəssənatilə hər misrei ləbaləbdir.

## BU DƏRDİLƏN ƏRİYƏN...

Bu dərdilən əriyən dil sitəm nişanəsidir,
Bu parə-parə könül qəmlər aşiyanəsidir.

Bu çak-çak ürəyim məxzəni-məhəbbətdir,
Bu qan ilə dolu sinəm göhər xəzinəsidir.

Mənim ki, yoxdu başımda cününluq asarı,
Qərəz, o Leylini görməkliyin bəhanəsidir.

Vəfa diyarını bilmərrə seyr edən könlüm,
Dübarə badiyeyi-eşqinin rəvanəsidir.

Alıb mübəddəl edən vəslimi fəraqə mənim,
Bu çərxi-bədrəvişin məkr edən zəmanəsidir.

Nigarımın gözü saldı məni bu şurə və ya,
Fələkdə Zöhrənın ol nəğmeyi-çəğanəsidir?

Bu dəhrdə gətirən şurəəndəlibləri,
Bu Qasirin qəzəli, şe’ri-aşiqanəsidir.

## UGRADIM BİR SƏNƏMƏ...

Ugradım bir sənəmə, bəs deyəsən ahudur,
Nəzər saldım gözünə, gördüm iki cadudur.

Qəddü əndamına diqqətlə tamaşa qıldım,
Qaməti sərv idi, əndamı hamı pərqudur.

Dövreyi-lə’li-ləbində var idi bir neçə xal,
Çeşməsar üstə düzəlmiş, deyəsən hindudur.

Sinəsində iki zad pirəhən içrə gördüm,
Çox təsəvvür elədim, gördüm iki limudur.

Yüzünə baxcağın öz əksimi gördüm zahir,
Bilmədim seyr elədi, ya ki, yüzü güzgudur.

Gəldi göftara məni-zarilə, gördüm dəhənin,
Deyəsən, höqqeyi-yaqut dolu lö’lödür.

Dedim, ey şux, bu əfi nədü mina üzrə,
Dedi, xof etməgilən, silsileyi-geysudur.

Qasirin canı fəda, hər bu rəviş yarilərə,
Elə yarın müjəsi, tiri-kəmanəbrudur.

## NİGARİ-ALƏMARA...

Nigari-ələmara xidmətində hər zəman, yarəbb,
Neşün bu bikəsi-məhcurunun xar olmadı bir kəs.

Gəlib, ey Qasiri-biçarə, dilbər lütfü ehsana,
Qəm etmə, heç bəzmtək bəxt didar olmadı bir kəs.

## YENƏ BAŞIMA ŞÖVQİ-VƏSLİ...

Yenə başıma şövqi-vəsli-yari-sərvqəd düşdü,
Havayı-çeşmi-cadu, zülfi pürçin, xalə xəd düşdü.

Cahan mülkini qismət eylədim zahidlə, ey yaran,
Ona məscid, mənə meyxanələr küncü rəsəd düşdü.

Mənə olmazdı mümkün vəslə yetmək hicridən, amma,
Səri-kuyində, cana, şö'leyi-ahim bələd düşdü.

Məni İskəndəri-eşqin çəkərdi abi-heyvanə,
Vəli yə'cuci-hicran gəldi ortalıqda sədd düşdü.

Əzəl canan yolunda can verən yəğmayə mən oldum,
Ey aşiqlər, gəlin ardımca, yol açıldı, rədd düşdü.

Kəlamüllaha etdim məsləhət təcriddən otrü,
Mənimçün istixarə "qul-hüvəllahi əhəd" düşdü.

Həzər qıl, qoyma hər biganəni baxsın o rüxsarə,
Dilim sınsın, xüda nəkərdə, bəlkə, çeşmi-bəd düşdü.

Səni mənlə görübdür həmnişin əğyari-bədkirdar,
Məazəllah, yenə ortalıga büğzü həsəd düşdü.

Görəndə, dilbəra, kim ləblərində vardı təbxalə,
Könül əfkar olub, amma ki, çeşmimə rəməd düşdü.

Gözəllər aşiq incitməzdilər, amma sən incitdin,
Bu qanun səfheyi-afaqə səndən ta əbəd düşdü.

Sənə bu Lənkəran mülkü vətəndir, bilmişəm cana,
Nə qılsln çarə, Qasir, bu diyarə nabələd düşdü.

## DƏRGAHİ-HƏQQƏ[N]...

Dərqahi-həqqə sübhü məsa eylədim sipas,
Ol yari görməgimdən ötür etdim iltimas.

Layiqdir aşiqə ki, edə zəhməti qəbul,
Qəlbində yox nigarı kimi zərreyi-həras.

Ey can alan, o lə’llərini lə’li-nabidən,
Nərgisdən eylərəm sənin ol çeşmini qiyas.

Seçdi səni görənlər ara, eylədi pəsənd,
Bu əqli biqərinə bu qəlbi-həqşünas...

## EY KÖNÜL, CANDAN TƏMA' KƏS...

Ey könül, candan təma' kəs, vüsləti-canana bax,
Tut gədalıq damənin, fəqr əhlinə şahanə bax!

Misri-eşq içrə əgər şahlıq təmənna eyləsən,
Mahi-Kən'an tək düşüb çahi-qəmə, zindanə bax!

Olmuşam Məcnunsifət, bir Leylinin avarəsi,
Qalmışam tənha biyabanda, təni-üryana bax!

Ariz üzrə saçların düşmüş, el eylər vahimə,
Hər görən söylər ki, gənc üstündəki sö'banə bax!

Mən təmənnayi-vüsal etməkdə bu dövri-fələk,
Tazədən saldı məni fikrü qəmü hicranə bax!

Gəldi canə cismi-zarim, bəs ki, çəkdim nalələr,
Ey niqarım, qıl nəzər, bu naleyi-pünhanə bax!

Turşru baxmaqla can almaq xəyalın var isə,
Canım asanraq çıxar, baxsan mənə, məstanə bax!

Bir pərizadə məni hər kimsə bilsə mailəm,
Kim deməz Qasir olubdur aşiqü divanə bax!

## EY NİGARİ-MƏHVƏŞİM...

Ey nigari-məhvəşim, mən ki, sənə kətdim pənah,
Qoymagilən mən çəkim bu kureyi-qəlbimdən ah.

Bilmirəm qəlbin sənin daşdır, tərəhhüm etmədən,
Eyləyibsən bəxtimi zülfi-siyahın tək siyah.

Bir eşit əzzəl mənim dərdimi, ondan hökm elə,
Qoyma çəksin üstümə ol qəmzeyi-çeşmin sipah.

Çox da incitmə, bu məhzun canıma bir rəhm qıl,
Mən olum bircə rəiyyət, olgilən sən bircə şah.

Ol qədər kim firqətindən çəkmişəm ahü fəqan,
Gər inanmırsan, varımdır bir neçə adil güvah.

Bir mürüvvət eyləyin məhcürə, ey dilbər sənə,
Yoxdu, billah, bu cahan içrə mənim tək xeyrixah.

Badeyi-gülrəngi, Qasir, nuş qıl hər sübhü şam,
Olma qafil, məstlikdən, eyləmə heç iştibah.

## ÇOX ZAMANDIR Kİ (F)...

Çox zamandır ki, təmənna eylərəm bir gülsitan,
Həsrətindən eylərəm bülbül kimi ahu fəqan.

Yatmaram ol gözləri şəhla xəyalilə, fəqət,
İstərəm olsun mənimçün sünbülü gül, ərməğan.

Öylə ki, çatdım gülüstanə, yetişdim məqsədə,
San ki oldum bircə anda mən müzəffər, kamran.

Allahın lütfilə yarım rəhm qıldı halıma,
Bu canım qurbanı olsun kuyinə hər dəm, hər an.

Mən həya etdim ləbindən nazlı yarın, yoxsa ki,
Göz yaşımla daşları yaqut edərdim durmadan.

Mən pərişan eylərəm ariflərin əhvalını,
Onlara mə'şuqəmin saçlarını versəm nişan**...**

Görmədim bir əhl adam qiymət verə əş'arimə,
Ol səbəbdən şe'rimi yazdım əvamlardan nihan.

Qorxuram, Qasir, nigarın xatiri məğşuş ola,
Yoxsa öylə ah çəkərdim, odlanardı kəhkəşan.

## ƏZİZ ÖMRÜM GÖR NECƏ[F]...

Əziz ömrüm gör necə tələf oldu anbaan,
Çox təəssüf, taleyim alt-üst oldu durmadan.

Öz halıma o qədər ağladım ki nəhayət,
Ceyhun kimi çay oldu axan bu göz yaşımdan.

Arzu edər aşiqlər çatsınlar yar vəslinə,
Hurim isə bilməyir harda qalıb bu qılman.

Yar qəddin o qədər abü tabla vəsf etdim,
Rövnəq gəldi təb'imə, sözlərim oldu rəvan.

Əgər görsə əhali Leyli üzlü yarımı,
Bilərlər ki, nə üçün Məcnun oldum bu zaman.

Heç kəs onun ağzının sirrini bilə bilməz,
Bunu bilər Əflatun, ya da mənim tək Loğman.

Vüsalını unutmaq istədim, eşqim artdı,
Qasirin əqli burda tapdı beləcə nöqsan.

## NƏ SƏBƏBDİR QAÇMISAN[(F)]...

Nə səbəbdir qaçmısan məndən belə, ey şux nigar!
Heç qalarmı himmət əhli söylə bir yardan kənar?

Sən bilirsən mən səni can bilmişəm öz qəlbimə,
Kim edər şən qəlbimi qüssə, qəmə dərdə duçar?

Mən şəfanı istərəm o gül dodaqdan qəlbimə,
Şirinim, Xosrovuna himmətlə ver dərman, nolar?

Yaxşı mə'lumdur mənə bu aləmin şüru şəri,
Sən məni mə'zur qıl, bilmə məni bie'tibar.

Dövrümüzdə Əhrimənlər hökm edir daim bizə,
Allaha bax, sən barı etmə cəfa, ey gül'üzar!

Sən işıqlı şamısan bu məclisin nur saç bizə,
Axı hər bir kəs səni indi bilir küllixtiyar.

Qasirin min dərdə olmuş mübtəla, gəl, ey təbib,
Lütf edib dərman elə bu xəstən olsun bəxtiyar.

## GƏL BU QƏDƏR NAZ ELƏMƏ[F]...

Gəl bu qədər naz eləmə ey əzizim, ruhum, canan,
Gah örtürsən camalını, zülfün ilə gah açırsan.

Gah qapından qovlayırsan hiddət ilə məni, sonra,
Lütf edərək çağırırsan geriyə, ey vəhşi ceyran.

Sən həmişə vəfalıydın öz əhdinə, bəs nə oldu,
Rəhmsizcə zülm edirsən aşiqinə zaman-zaman.

Qəmzən ilə, nazın ilə hər an məni incidirsən,
Nə olar gəl bir busəylə könlümü al, dincəlsin can.

Axı neçün qət’ etmişsən dostlarından ülfətini,
Biganəyə ülfət olub buraxırsan belə nöqsan?

Qasir bu gül üzlülərə, bülbül kimi nəğmə deyir,
Qəzəl yazır, tərанəsi eşidəni edir heyran.

## BU QƏDƏR Kİ, MƏNƏ(F)...

Bu qədər ki, mənə cəfa eyləyirsən, gözəl canan,
Məgər sən heç qorxmayırsan səni gözəl yaradandan?

Möhkəm zəncir həlqəsidir dedim qara zülfünə mən,
Əgər səhvə yol vermişəm, özün keç bu günahımdan.

İstədim ki, canı sənə qurban verib rahat olum,
Lakin dostlar qoymadılar, narazıyam mən onlardan.

Axı candan əziz nə var, qədəminə nisar edim,
Ey gözəllər padişahı, sənindir bu ürək, bu can.

Hər nazənin sənin kimi işvə etmək bacarmayır,
Vəslə və’də verəndə də vəfan olmur heç bir zaman.

Görünür heç nəsib olmaz mənə sənin vəslin gözəl,
Qismətimdir mənim demək həsrət ilə dolu hicran.

Yazıq Qasir dərgahına gəlib səndən kömək dilər,
Onun ürək nəvasını dinlə, lütf et, ol mehriban!

## DEDİLƏR, BU YARDAN SƏNƏ(F)...

Dedilər, bu yardan sənə yar olmaz,
Belə gözəllərdə e'tibar olmaz.

Mən onun vəslini istərəm ancaq,
Başqası könlümdə bərqərar olmaz.

Kim mənə vəslindən muştuluq versə,
Canımı verərsəm, mənə ar olmaz.

Ay üzlüm, üzündən pərdəni qaldır,
Üzünü açmasan, xoş bahar olmaz.

Camalın məst edib ruhumu, söylə,
Kim görsə hüsnünü biqərar olmaz?!

Çoxları aşiqəm deyirsə, lakin,
Sənə mənim kimi bir şikar olmaz.

Dilbərin zülfündən əl çəkmə, Qasir,
Gülşəndə bunun tək gül'üzar olmaz.

## KEÇDİ ƏYYAMİ-CAVANLIQ[F]...

Keçdi əyyami-cavanlıq, ömrümü aldı xəzan,
Bilmədim keçdi necə bu ayü il, yaxşı-yaman.

Heyf olsun ömrümə, əfsus keçdi gənclik,
Mən qocaldım, əllidən keçdi yaşım, getdi təvan.

İllər ilə, ayları vurdum başa dünyadamən,
Aydan il və gündən ay az oldu, etdim mən fəğan.

Halıma saldım nəzər, gördüm ağarmışdır başım,
Əllidən yaş keçdisə, mümkünmü adlanmaq cavan?!

Çox vəfasız oldu ömrüm, göz qıpımda keçdi o,
Sür'ətə baxdıqda gördüm əlli il oldu bir an.

Öz halımdan mən xəbərsiz hey pozuldu əhvalım,
Əhsən olsun ol ayıq şəxsə ki, oldu kamiran.

Sə'y qıl hüşyarlıqla köç bu mənzildən könül!
Köçdü burdan aqilü cahil, hesabsız karvan.

Körpüdür bu hey keçir burdan gədavü padişah,
Qoy deyim: asan keçər şahdan gədalar hər zaman.

Bəsdir artıq yatmısan qəflət içində, bir ayıl,
Köçdü yoldaşlar götür, azuqə, sən də ol rəvan!

Çox zaman asdım qulaq mən bülbülün avazına,
Gül solub, bülbül də susdu, gör pozuldu bustan.

Qasira, cananına çatmaq dilərsən, düş yola,
Canını qurban elə bu yolda sən də durmadan.

# YÜZ BƏLA ÇƏKDİM[(F)]...

Yüz bəla çəkdimsə də, əl çəkmədim didardən,
Keçmişəm candan yolunda, dönmərəm ilqardən.

Yarımın kuyindən əsla bircə an da dönmərəm,
Min bəla gördümsə də mən naxələf əğyardən.

Çox cəfalar verdisə zalım rəqibim canıma,
Heç şikayət etmədim bir ləhzə bu rəftardən.

Beynimə ləzzət verir yar zülfünün ətri müdam,
Min şükür ki, almadım töhmət əsən ruzigardən.

Çox içirtdi zəhrlər dünyada bu çərxi-fələk,
Çəkmədim əl bircə an da sevdiyim dildardən.

Xəsmlə etdim müdara, dostları tutdum əziz,
Dönmədim əhdü vəfadan, verdiyim iqrardən.

Rast gələndə müşkilə səbr eylədim mərdlər kimi,
Çəkmədim minnət gədadan, varlıdan, sərdardən.

Anlamaz zahid dilər gülzari-cənnət, qoy deyim,
Yarımın vəsli mənə üstündür hər gülzardən.

Sevgilim etsə mənə lütfilə mümkün vəslini,
Razı qallam dərdimə dərman edən qəmxardən.

Qoy kor olsun gözləri bu Qasiri-biçarənin,
Almamışdır tutiya çün xaki-payi-yardən.

## YAR HÜSNÜNƏ BAXMALIYAM(F)...

Yar hüsnünə baxmalıyam məhəbbətlə hər bir zaman,
Nəzər çəkmək olarmı heç belə gözəl gülüstandan?

Dodağının altında var gizli kövsər suyu şəksiz,
Heç bənzəməz bu suya bil şöhrət tapmış abi-heyvan.

Dodağının bir busəsi ucuz olmaz qiymətdə bil,
Busəsinə qurban olsun gərək sevən yüzlərcə can.

İşvə-nazla Qasirə hər söylədiyi şirin sözü,
Qiymətlidir Bədəxşanın ən dəyərli yaqutundan.

## HƏR KƏS, SƏNİN CAMALINI(F)...

Hər kəs, sənin camalını mənə tə’rif edirsə yar,
Elə bil ki, təsvir edir güllü çəmən, gözəl bahar.

Məhvəşimin əsir olsa hər kim qara zülflərinə,
Xəyal edir sünbül, reyhan, yasəmənə düşüb güzar.

Hər kəs görsə nigarımın yaqut rəngli ləblərini,
Nə yad edər Bədəxşanı, nə Yəməni xatırlayar.

Şikar üçün çıxsa əgər gözlərinin ceyranları,
Əhrimən tək qeyzə gəlib pələngləri edər şikar.

Min dəfə xoş gələr mənə xəlvət yerdə görüşməyi,
Nə ki, açıq bir məclisdə mənə gizli baxa niqar.

Əgər onun ay camalı işıq salsa gülşən içrə,
Bütün güllər: nərgiz, lalə, görünər çox cazibədar.

Qasir əgər olsa yarın mənzilinin pasibanı,
Hesab edər özünü o, bu dünyada ən bəxtiyar.

## BİR GÖRÜŞLƏ ELƏDİ(F)...

Bir görüşlə elədi şad məni şux ceyran,
Etdi aşiqlərini bircə baxışla heyran.

Gecə gördüm qəməri göydə bürünmüş buluda,
Dərk qıldlm ki, çıxıb gəzməyə nazla ceyran.

Çox çətindir ki, əlindən canı azad etmək,
Hər tərəfdən siyirib xəncəri istər ala can.

Gözlərimdən bu axan qan deyil, əsla, dilbər,
Ciyərim parçaları gözdən axır su kimi, qan!

Düşür hey vurğun ürəklər gözəlin məhbəsinə,
Zülfün hər qıvrımı bir qəlbdə olubdur zindan.

Dilbərin rəsmi deyildir edə ox kirpiyini,
Sanca öz aşiqinin qəlbinə bu oxlardan.

Qasirin boynuna bir tovq olub eşqi budur,
Qumru tək nalə edər, hey qoparar ahü fəğan.

## BİLMİRƏM, YARIM NEÇİN(F)...

Bilmirəm, yarım neçün bir qədər tənnazdır,
Daima şüğlü onun eyşü tərəbdir, nazdır.

Görməyə gəldimsə bu sərv qaməti, gül üzlünü,
Ruhum uçdu, bilmədim ah bu necə pərvazdır?!

Şəhrə düşdü söhbəti gün üzlü yarın ay aman,
Şöhrəti tutdu cahanı, bəh nə xoş avazdır!

Heç kəsə bundan sonra vəsf etmərəm mə'şuqəmi,
Çünki insanlar bu gün çox hiyləgər, qurnazdır.

Qasirin ay üzlülər vəsfindədir əş'arı çün,
Sadiq aşiqlər yanında hər sözü mümtazdır.

## YAR MƏNİM SİRRİMƏ(F)...

Yar mənim sirrimə məhrəm olandan bəri,
Oldu, həqiqət, mənim işlərimin rəhbəri.

Mərhəməti yarımın etdi məni şadman,
Sildi ürəkdən qəmi dilbərimin şakəri.

And verirəm Allaha, naz eləmə ey nigar,
Etdi bu nazın məni gör necə gic, sərsəri.

Vurduğun odlar budur, qəlbimi pürxun edib,
Canımı alsa belə xoş gəlir hər neştəri.

Xanəqah içrə tamam məst idi, gördüm hamı,
Əhli-namaz idi bu rindlərin əksəri.

Təkcə cəhənnəm mənə məskən olar, şübhəsiz,
Qismətim olmaz mənim dadlı behişt kövsəri.

Düşdü mənim yadıma qisseyi-Mahmud, Ayaz,
Eşqi edib Mahmudu sevdiyinin nökəri.

Öylə ki, yar Qasiri rədd elədi kuydən,
Sübhə qədər inlədi yad edərək dilbəri.

## MEHRİ VƏFA İLƏ YENƏ[F]...

Mehrü vəfa ilə yenə gəldi bizim cananımız,
Onun şux sərv qamətilə bəzəndi bu kaşanımız.

Soruşmayın bu biçarə aşiq, nə cür hala düşdü,
Bilməyəndə o nazlı yar ki, buradır öz xanəmiz.

Çox çətindir, o bu yoldan qəflət ilə gəlib gecə,
Çox ehtimal, sərxoş imiş o dilbəri-məstanəmız.

Çoxdan bəri unuduldu Məcnun, Fərhad hekayəti,
Bundan sonra dil əzbəri olacaq öz fəsanəmiz.

Dilbərimin eşqi ilə cuşa gəlsə hər bir e’zam,
Olmayacaq qəlbimizdə məskən salan biganəmiz.

Kim içərsə bircə qətrə hərarətli meyimizdən,
Biləcəkdir ki, məsciddən şərəflidir meyxanəmiz.

Vəfa toxmu ək Qasirin qəlbində, ey Pərvərdigar,
Məhsul verə ta sevgidən, məhəbbətdən hər danəmiz.

# LÜĞƏT

## A

***AB*** (f) - Su.
***ABDAR*** (f) -Sulu/ məlahətli/ axıcı.
***AĞAZ*** (f) - Başlama/ başlanğıc.
***AFAQ*** (ə) - Üfüqlər/ aləm/ dünya/ horizont/ üfüq/ görüş dairəsi/ mənzərə/ görünüş.
***AFTAB*** (f) - Günəş.
***AHAD*** (ə) - Vahidlər/təklər.
***AHU*** (f) - Ceyran.
***ALƏMTAB*** (ə+f) - Aləmə işıq verən.
***ALİTƏBAR*** (ə+f) - Böyük nəsil və nəslə mənsub olan/ əsilzadə.
***ALİCAHAl*** (ə) - Uca rütbəli/ yüksək mənsəbli.
***ALUD*** (f) - Bulaşıq/ bulanlıq.
***AM/AMM*** (ə) - Kütlə/ xalq/ ümumxalq/ kütləvi/ avam/ qara camaat/ seyid olmayan.
***AMAC*** (f) - Nişanə/ hədəf/ nişangah.
***ANİ*** (ə) - Azacıq bir zamanda/ çox tez/ göz yumub açınca olan.
***ARA*** (f) - Bəzəyən/ zinətləndirən/ şənləndirən.
***ARAYİŞ*** (f) - Bəzək/ zinət.
***ARİ*** (ə) - Çılpaq/ yalın/ boş/ məhrum.
***ARİF*** (ə) - Bilən/ tanıyan/ bilik/ sahibi.
***ARİFAN*** (ə) - Arifcəsinə/ bilikli adamlar kimi.
***ARİZ*** (ə) - Təbii və əsli olmayan/ sonradan əmələ gələn/ yanaq/ şikayətçi/ ərizəçi/ üz verən/ baş verən/ rast gələn/ təsadüfi hal.
***ASİ*** (ə) - İtaət etməyən/ üsyançı/ günahkar/ özündən çıxan/ coşan.
***AŞÜFTƏ*** (f) - Həyacanlı/ qarmaqarışıq/ dəlicəsinə aşiq/ vurğun.
***AZƏR*** (f) - Od/ atəşgəda/ atəşgah/ oda qulluq edən mələk.
***AZİM*** (ə) - Qəsd edən/ qərar verən/niyyət edən/ yollanan/ yola düşən.
***AZİMİ*** (ə) - Böyük/ ali.
***AZURDƏ*** (ə) - İncimiş/ əziyyət görmüş/ qəmli.

# B

***BAB*** (ə) - Qapı/ məsələ/ mövzu/ kitablarda əsərin bölünmüş olduğu hissələr/ fəsil/ dərgah.
***BAB*** (f) - Layiq/ yaraşan/ tay/ cür/ xüsus.
***BAD*** (f) - Külək/ yel/ boş yer/ yox olma/ məhv olma/ qoy olsun.
***BADƏXOR*** (f) - Şərab içən.
***BADİ-SƏBA*** (f) - Səba yeli/ meh/ şimal-şərqdən əsən lətif, yüngül səhər küləyi.
***BAH*** (ə) - Cinsi əlaqə/ şəhvət həvəsi.
***BAK*** (f) - Qorxu.
***BAQİ*** (ə) - Qalan/ daimi/ həmişəlik/ əbədi/ qalıq/ kəsir/ əskik/ axirət/ o biri dünya.
***BAL*** (f) - Qanad.
***BALIQ*** (ə) - Yetişmiş/ həddi-buluğa çatmış.
***BARXAN*** (f) - Əhd/ iqrar/ söz vermə.
***BARİLLAH*** (ə) - Yaradan Allah.
***BATİN*** (ə) - İç/ iç üz/ iç tərəf/ gizli/ açıq olmayan.
***BATİNİ*** (ə) - Daxili/ iç.
***BAVÜCUD*** (f) - İzafət birləşmələrinin birinci tərəfi olaraq müxtəlif tərkiblərdə işlənilir/ buna.../ bununla...
***BAZ*** (f) - Açıq.
***BEYT*** (ə) - Ev.
***BEYT-ÜL-HARAM*** (ə) - Müqəddəs ev.
***BƏBR*** (f) - Bəbir/ pələng.
***BƏD*** (f) - Pis/ yaman.
***BƏDƏL*** (ə) - Əvəz/ bir şeyin yerini tutan, onu əvəz edən şey/ dəyər/ qiymət/dəyişmə.
***BƏDƏNDİŞ*** (f) - Pis fikirli/ pis düşünən.
***BƏDGÜ*** (f) - Pisliyə danışan/ hər kəs haqqında pis sözlər söyləyən/ iftiraçı/ qeybətçi.
***BƏDTƏR*** (f) - Daha pis/ daha yaman.
***BƏDZAT*** (f+ə) - Qeyri-qanuni doğulan/ əsli-kokü məlum olmayan/ dəcəl/ nadinc.
***BƏĞƏL*** (ə) - Qoltuq/ qucaq.
***BƏHA*** (f) - Parlaqlıq/ işıqlıq/ gözəllik/ qəşənglik/ qiymət/ dəyər/ qiymətindən artıq.
***BƏHƏRHAL*** (f) - Hər halda.
***BƏXT*** (f) - Səadət/ tale.
***BƏQA*** (ə) - Daimilik/ əbədilik/ davam etmə/ dəyişməzlik.
***BƏNDƏR*** (f) - Liman.
***BƏNİ*** (ə) - Oğullar/ övladlar/ nəsil/ tayfa.
***BƏRADƏR*** (f) - Qardaş.
***BƏRƏKS*** (f+ə) - Əksinə etmək/ tərsinə etmək
***BƏRİ*** (ə) - Sağalmış/ qurtulmuş/ pak/ təmiz/ bəraət qazanmış/ qurtulmuş kənar/ iraq/ azad.
***BƏRQ*** (ə) - İldırım/ şimşək/ parıltı/ parlama.
***BƏS*** (f) - Kifayət/ kafi/ kifayət qədər.
***BƏSƏR*** (ə) - Görmə/ göz.

***BƏSİ*** (f) - Çox/ çoxluq/ olduqca çox.
***BƏSİRƏT*** (ə) - Gözüaçıqlıq/ dərrakəlik/ diqqətlik.
***BƏSTƏR*** (f) - Yataq/ yorğandöşək/ lək.
***BƏZL*** (ə) - Bol-bol sərf etmə/ əsirgəmə/ bağışlama.
***BƏZM***(f) - Məclis/ eyş-işrət/ keyf.
***BƏZZAZ*** (ə) - Arşın malı satan.
***Bİ*** (f) - İnkar bildirən ön şəkilçi.
***BİBALU PƏR*** (f) - Qolsuz/ qanadsız.
***BİCA*** (f) - Yersiz/ nahaq yerə/ əbəs/ yaramaz/ boş/ mənasız
***BİDAR*** (f) - Oyaq/ ayıq/ sayıq/ hüşyar.
***BİƏNDƏZƏ*** (f) - Ölçüsüz/ əndazəsiz.
***BİHƏMTA*** (f) - Tayı və bərabəri olmayan/ tayı və bənzəri olmayan/ misli olmayan.
***BİHUDƏ*** (f) - Boş/ faydasız.
***BİLA*** (ə) - Son şəkilçi olan isimlərin əvvəlinə gətirilərək "inkar" "yoxluq" (sız, siz, suz, süz) mənasını verir.
***BİLƏND/BÜLƏND*** (f) - Yüksək/ uca.
***BİL-KÜLL/BİLKÜLLİYƏ*** (ə) - Büsbütün/ bütünlüklə/ tamamilə/ hamılıqla.
***BİLMƏRRƏ*** (ə) - Birdəfəlik/ tamamilə/ bütünlüklə.
***BİMAR*** (f) - Xəstə/ naxoş.
***BİMEHİ*** (f) - Məhəbbətsiz.
***BİNA*** (f) - Görücü/ görən/ gözüaçıq/ sayıq.
***BİNAĞUŞ*** (ə+f) - Qulağın dibi/ lap yaxın.
***BİNAMÜ NİŞAN***(f) - Adsız-sansız/ şöhrətsiz/ heç kimin tanımadığı.
***BİNƏMƏK*** (f) - Duzsuz.
***BİNƏV*** (f) - Yazıq/ fağır/ zavallı/ kasıb/ əlsiz-ayaqsız/ köməksiz.
***BİNƏZİR*** (f+ə) - Misilsiz/ tayıbərabəri olmayan.
***BİPƏR*** (f) - Qanadsız.
***BİPƏRÜ BAL*** (f) - Hərəkətdə sərbəst olmayan/ aciz.
***BİRAYA*** (f) - Qədərsiz/ hədsiz/ həddən artıq.
***BİSƏRÜ*** (f) - Başsız.
***BİŞƏK*** (f) - Şəksiz.
***BİTTƏMAM*** (ə) - Tamamilə/ bütünlüklə.
***BİYABAN*** (f) - Səhra/ çöl.
***BÖRK*** (f) - Papaq.
***BOZORQ*** (f) - Böyük.
***BU*** (f) - İy/ qoxu.
***BUM*** (f) - Ölkə.
***BUM*** (ə) - Bayquş.
***BÜRHAN*** (ə) - Dəlil/ isbat/ sübut.
***BUSTAN*** (f) - Bağ/ meyvə bağı/ bostan/ güllük.
***BÜD*** (ə) - Varlıq/ həyat.
***BÜXL*** (ə) - Paxıllıq/ xəsislik.
***BÜĞZ*** (ə) - Sevməmə/ ədavət/ kin/ nifrət.
***BÜNYAD*** (f) - Özül/ kök/ əsas/ bina/ təməl.
***BÜRDƏ*** (ə) - Ərəblərin geydiyi. uzun paltar.
***BÜRRAN*** (f) - Kəsici/ kəsən/ iti.
***BÜRUZ*** (ə) – Üzə çıxma/ meydana çıxma.

# C

***CABƏCA*** (f) - yerbəyer/ yerliyerində.
***CADDƏ*** (ə) - Böyük yol/ baş yol.
***CAH*** (ə) - Yer/ mənsəb/ məqam/ rütbə/ hörmət.
***CAHİL*** (ə) - Oxumamış/ savadsız/ anlamaz/ qanmaz/ avam/ nadan/ cavan/ gənc/t əcrübəsiz.
***CAN*** (f) - Ruh/ ürək/ könül/ yaşayış/ həyat/ qüvvət/ qüdrət/ güc/ əsil/ mahiyyət/ sevgili/ əziz.
***CANA*** (f) - Canım/ əzizim/ sevgilim.
***CANİB*** (ə) - Yan/ tərəf/ cəhət.
***CƏDƏL*** (ə) - Mübahisə/ qalmaqal/ qovğa/ çəkişmə/ dalaşma.
***CƏFACU*** (ə+f) -Cəfa çəkən/ əziyyətə duçar olan.
***CƏHİ*** (ə) - Bilməməzlik/ nadanlıq/ kəclik/ tərslik.
***CƏLİS*** (ə) - Birlikdə oturan/ yoldaş.
***CƏMAL*** (ə) - Gözəllik/ göycəklik/ gözəl üz/ qəşəng sifət.
***CƏNG*** (f) - Vuruş/ döyüş/ dava.
***CƏZB*** (ə) - Özünə çəkən.
***CƏZM*** (ə) - Kəsmə/ qət etmə/ qəti qərarlaşdırma.
***CİDAL*** (ə) - Dava/ müharibə meydanı/ döyüş yeri/ dava meydanı
***CİFƏ*** (ə) - Leş/ qoxumuş cəmdək/ sərvət/ var dövlət.
***CİFT*** (f) – Cüt/qoşa/ tay/ yoldaş/ həyat yoldaşı/ sıxlıq/ kiplik.
***CİLVƏGAH*** (ə)+(f) - Cilvələnən/ görünən yer.
***CİLVƏGƏR*** (ə+f) - Parlayan/ parıltılı/ işıldayan.
***CÖVƏLAN*** (ə) - Dolaşma/ gedib-gəlmə/ dolanma/ hərlənmə.
***CÖVG*** (ə) - Yığıncaq/ dəstə/ qrup.
***CÖVHƏR*** (ə) - Zat/ mahiyyət/ əsil/ maya/ təbiət/ xassə/ qılınc/ bıçaq/ cəvahir/ qaş-daş/ essensiya.
***CÖVHƏRFÜRUŞ*** (ə+f) - Cövhər satan.
***CÖVR*** (ə) - İncitmə/ zülm/ cəfa.
***CÖVZ*** (ə) - Qoz.
***CUD*** (ə) - Comərdlik/ əli açıqlıq.
***CUDNUMA*** (ə+f)-Comərdlik göstərən.
***CUŞ*** (f) - Qaynama/ coşma.
***CÜBBE*** (ə) - Uzun ətəkli/ enli üst paltar.
***CÜDA*** (f) - Ayrı/ ayrılmış/ uzaq düşmüş.
***CÜR'Ə*** (ə) - Bir udumda içiləcək şey/ bir qurtum içki.
***CÜRM*** (ə) - Günah/ təqsir/ qəbahət/ yazıq/ fağır.
***CÜST*** (f) - Axtarma/ araşdırma.
***CÜZ*** (ə) - Parça/ qisim/ hissə/ quranın otuzda bir hissəsi.

# Ç

***ÇAH*** (f) - Quyu/ çənə çuxuru/ zənəxdan.
***ÇAK*** (f) - Yırtıq/ cırıq.
***ÇAKƏR*** (f)-Nökər/ qulluqçu/ kölə.
***ÇAK-CAK*** (f) - Parça-parça/ cırıq-cırıq/ üzülmüş/ köhnəlmiş/ köhnə.
***ÇAQQU*** (f) - Biçaq.
***ÇALAK*** (f) - Cəld/iti/ yeyin.
***ÇE*** (f) - Nə?
***ÇEŞM*** (f) - Göz.
***ÇƏP*** (f) - Sol.
***ÇƏNQALİ*** (f) - Pəncə/ caynaq/ doğanaq/ ağac və ya dəmir halqa/ əyri/ halqavari.
***ÇİN*** (f) - Qıvrım/ qırış/ qırışıq/ bürüşük/ bürüşmə/ toplayan/ yığan/ dərən.
***ÇU*** (f) - İndi ki/ kimi/ tək/ təki.
***ÇUB*** (f) - Ağac/ taxta/ əl ağacı.
***ÇÜN*** (f) - Necə ki.

# D

***DAD*** (f) - Ədalət/ insaf/ qarşılıq/ əvəz/ cəza/ haray/ yardıma çağırış.
***DAD-RƏH*** (f) - Ədalət yolu.
***DAL*** (ə) - Ərəb əlifbasında hərif adı/qocalmış/beli bükülmüş.
***DAM*** (f) - Tor/ tələ/ cələ/ həbsxana/ hiylə/ kələk/ ev heyvanı/ heyvan/ ov quşu.
***DAMAD*** (f) - Kürəkən.
***DAMƏN*** (f) - Ətək.
***DANA*** (f) - Bilici/ çox bilikli/ alim.
***DANA*** (ə) - Ağıllı/ alim.
***DANƏ*** (f) - Toxum/ danə/ ədəd/ seçmə/ gilə/ mənşə.
***DANƏNDƏ*** (f) - Bilikli/ bilici.
***DAR*** (ə) - Ev/ yer/ məkan/ məqam.
***DARİSSƏLAM*** (ə) - Dinclik evi/ Nəcəf və Bağdada verilmiş ad/ cənnət.
***DAVƏR*** (f) - Münsif/ arbitr/ münsiflər məhkəməsi/ məhkəmə hakimi/ Allah.
***DƏBİSTAN*** (f) - İbtidai məktəb/ mədrəsə.
***DƏCƏL*** (ə) - Qəlp/ saxta/ hiylə/ xəbislik/ hiyləgər/ xəbis.
***DƏHƏN/DƏHAN*** (f) - Ağız.
***DƏHR*** (ə) - Zaman/ zamana məxsus /dövr/ dünya/ aləm/ təbiət/ tale/ fələk/ axirətə inanmayan.
***DƏLAL***(ə) - Naz/ işvə.
***DƏLAYİL*** (ə) - Dəlillər/ sübut.
***DƏMBƏDƏM*** (f) - Hər an/ hər zaman/ dəqiqəbədəqiqə.
***DƏNDN*** (f) - Diş.
***DƏNİ*** (ə) - Alçaq/ rəzil.
***DƏR*** (f) - Qapı.
***DƏRBAN*** (f) - Qapıçı.
***DƏRƏCAT*** (ə) - Mərtəbə/ rütbə.
***DƏRƏKƏ*** (ə) - Uçurumun dibi/ aşağı dərəcə/ aşağı pillə/ cəhənnəmin dibi.
***DƏRHƏM*** (f) - Qarma-qarışıq/ baş-ayaq/ alt-üst/ kədərli/ kədərlənmiş.

***DƏRÖHDƏ*** (f+ə) - Öhdəsində olma/ boynuna çəkmə/ zamin olma.
***DƏRVİŞ*** (f) - Fağır/ yoxsul.
***DƏST*** (f) - Əl/ ovuc/ bir-birini tamamlayan bir neçə şey.
***DƏSTƏ*** (f) - Qulp.
***DƏŞT*** (f) - Səhra/ çöl/ biyaban.
***DƏ'Vİ*** (ə) - Dava/ tələb/ iddia.
***DƏVİ/DƏVA*** (ə) -Dava/ dərman/ əlac.
***DİBAÇƏ*** (ə) - Müqəddimə/ kitabın naxışlarla bəzəkli olan ilk səhifələrindən hər biri.
***DİD*** (f) - Göruş/ görüşmə.
***DİDAR*** (f) - Üz/ camal/ görmə/ ziyarət etmə/ görüş.
***DİDE/DİDƏ*** (f) - Göz.
***DİGƏRKÜN*** (f) - Başqa cür/ başqa növ/ halı pozğun/ alt-üst/ bərbad.
***DİK*** (f) – Qazan.
***DİQQ*** (ə) - Vərəm.
***DİL*** (f) - Ürək/ qəlb/ zövq/ həvəs/ cəsarət.
***DİLBƏND*** (f) - Əziz/ sevimli.
***DİLBƏR*** (f) - Ürək açan/ könül açan/ sevgili.
***DİLCUYİ*** (f) - Ürəyi ələ alan/ nəvazişli/ əhval soruşan/ insana yovuşan.
***DİLDAR*** (f) - Könül alan gözəl/ sevgili/ ürəkli/ cəsur/ürəyə hakim.
***DİLƏFRUZ*** (f) - Sevindirən/ şadlandıran/ şənləndirən.
***DİLFİKAR*** (f+ə) - Ürəyi yaralı/ qəlbi yaralanmış/ ürəyi sınmış/ dərin kədəri olan.
***DİLGİR*** (f) - Ürəyi tutqun/ qəmli/ halı pozğun/ bezmiş/ incikli/ incimiş.
***DLXAH*** (f) - Ürək sevən/ könül istəyən.
***DİLXƏSTƏ*** (f) - Ürəyi incik/ incimiş/ ruhu sarsılmış.
***DİLKƏŞ/DİLKEŞ*** (f) - Ürək çəkən/ könül cəlb edən.
***DİLPƏSƏND*** (f) - Ürəyə yatan/ könül bəyənən.
***DİRƏXT*** (f) - Ağac.
***DİRİN*** (f) - Qədim zaman/ keçmiş/ çoxdan/qədimli.
***DİLSUZ*** (f) - Ürəkyandıran/ çox təsirli/acıma.
***DİLŞAD*** (f) - Ürəyi şad/ könlü şad/ qəlbi sevinclə dolu
***DİLTƏNG*** (f) - Ürəyi darıxmış/ qəlbi sıxılmı.
***DİVANƏ*** (f) - Dəli.
***DOXTƏR*** (f) - Qız.
***DÖHR*** (ə) - Zaman/ dövr/ dünya/ aləm/ təbiət/ tale/ fələk.
***DUAKU/DUAQU*** (ə) - Duaçı/ dua edən.
***DUD*** (f) - Tüstü.
***DUDİMAN*** (f) - Xanədan/ sülalə.
***DÜGAH*** (f) - İki vaxt/axşam-səhər/ klassik muğamların birinin adı.
***DUR*** (f) - Uzaq.
***DURÇİ*** (ə) - Kiçik qutu/ sandıqça.
***DUŞ*** (f) - Keçən gecə/ dünənki gecə.
***DÜRC*** (ə) - Kiçik qutu/sandıqç
***DÜRR*** (ə) - İnci/ kimsə tərəfindən söylənmiş söz.

# E

***E'CAZ*** (ə) - Aydın danışma/ xariqə/ möcüzə/ qabiliyyət/ acizləşmə/ qüvvətsizləşmə.
***EHYA*** (ə) - Bərpa etmə/ canlandırma/ təzədən abad etmə/ qüvvət və təravət vermə/ yenidən vücuda gətirmə/ ramazanda (orucluqda) gecə ayıq qalıb ibadətlə məşğul olma.
***E'TİDAL*** (ə) - Bir bərabərdə olma/ bir ölçüdə olma/ mülayimlik.
***E'TİKAF*** (ə) - Təklikdə yaşama/ günəşindən olan/ yalqızlıqda həyat keçirən.
***EYD*** (ə) - Bayram.
***EYT*** (ə) - Göz/ çeşmə/ bulaq/ bir adamın zatı/ əsl/ sırf/ xalis/ varlıq/ gözə görünməyən varlıq.
***EYZAN*** (ə) - Yenə/ elə/ həmçinin/ bir dəxi/ cür/ elə.
***E'ZAZ*** (ə) - Əzizlər/ əzizləmə/ hörmət etmə.

# Ə

***ƏBCƏD*** (ə) - Qədim ərəb əlifbasında ilk dörd hərf.
***ƏBƏVEYN*** (ə) -Ata-ana/ valideyn.
.***ƏBLƏH*** (ə) - Axmaq/ ağılsız/ sarsaq.
***ƏBNA*** (ə) - Oğullar.
***ƏBR*** (f) - Bulud.
***ƏBRƏ*** (f) - Paltar və papağın iç üzü.
***ƏBSAR*** (ə) - Gözlər.
***ƏBYAT*** (ə) - Beytlər
***ƏBVAB*** (ə) - Qapılar.
***ƏCƏB*** (ə) - Təəccüb/ heyrət/ mat qalma/ qəribə/ əcaib/ nə yaxşı.
***ƏCUZƏ*** (ə) - Qoca qarı/ pis xasiyyət və pis gorünüşlü qoca qarı/ fani dünya.
***ƏDA*** (ə) - Tərz/ üsul/ şivə/ naz/ davranış/ tövr/ ödəmə/ vermə/ etmə/ qılma/ ifa etmə.
***ƏDƏM***(ə) - Yoxluq/ ölüm/ olmama.
***ƏDKƏM*** (ə) - Dilsiz/ lal.
***ƏDND*** (ə) - Çox rəzil / çox alçaq
***ƏDU*** (ə) - Düşmən.
***ƏF'AL*** (ə) - İşlər.
***Ə'Fİ*** (ə) - Zəhərli ilan/ dişi ilan.
***ƏFLAK*** (ə) - Fələklər.
***ƏFRAD*** (ə) - Fərdlər.
***ƏFRAZ*** (f) - Qaldıran/ yüksəldən/ ucaldan.
***ƏFRİŞ***(ə) - Döşəmə/ döşənmə.
***ƏFSURDƏ*** (f) - Bürüşmüş/ solğun/ ruhdan düşmüş.
***ƏFŞAN*** (f) - Səpən/ səpələyən/ saçan.
***ƏFŞİRE/FŞÜRƏ*** (f) - Şirə/ cövhər.
***ƏFVAC*** (ə) - Dəstələr/ bölüklər.
***ƏFZƏL*** (ə) - Artıq/ daha artıq.
***ƏĞYAR*** (ə) - Yadlar/ özgələr
***ƏHBAB*** (ə) - Dostlar/ sevimli/ istəkli.
***ƏHİBBA*** (ə) - Dost.
***ƏHNA*** (ə) - Oğullar.

***ƏHYA*** (ə) - Dirilmə/ yeniləşmə/ bərpa etmə.
***ƏXBƏR*** (ə) - Xəbər.
***ƏXTƏR*** (ə) - Ulduz/ bəxt/tale.
***ƏİMMƏ*** (ə) - İmamlar/ ruhani şəxslər.
***ƏKRƏM*** (ə) - Kəramətli.
***ƏQD*** (ə) - Bağlama/ qurma/ tərtib etmə/ təşkil etmə/ nigah/ kəbin kəsmə.
***ƏQDAM*** (ə) -Qədəmlər/ addımlar.
***ƏLAM*** (ə) – Əlamətlər/ nişanlar/ bayraqlar.
***ƏLƏF*** (ə) - Quru ol/saman.
***ƏLFAZ*** (ə) - Sözlər/ ifadə.
***ƏLFƏRAQ/ƏLFİRAQ*** (ə) - Ayrılıq/ hicran.
***ƏLHƏQQ*** (ə) - Doğrusu/ həqiqətən/ doğrudan.
***ƏLİF*** (ə) - Ülfət edən/ aşna/ dost/ düzbədən/ qədd-qamət.
***ƏLQAB*** (ə) - Ləqəblər.
***Ə'MAL*** (ə) - İşlər/ əməllər.
***ƏMİRÜLMÖMİNİN*** (ə) - Möminlər əmiri.
***ƏMMAR*** (ə) - Əmr edən/ çağıran.
***ƏMVAC*** (ə) - Ləpələr/ dalğalar.
***ƏMVAL*** (ə) - Mallar.
***ƏMVAT*** (ə) - Meyitlər.
***ƏNASİR*** (ə) - Ünsürlər.
***ƏNBAN*** (f) - Yol dağarcığı/ dəri/ meşin.
***ƏNBAR*** (f) - Orta/ şərik.
***ƏNBƏR*** (ə) - Kaşalot adlı heyvanın ifrazından hasil edilən gözəl ətir.
***ƏNBİYƏ*** (ə) - Peyğəmbərlər/ nəbilər.
***ƏNCAM*** (f) - Son/ nəhayət/ aqibət
***ƏNDAZ*** (f) - Orta/ şərik.
***ƏNDƏLİB*** (ə) - Bülbül.
***ƏNDƏR*** (f) - İçərisində/ içində.
***ƏNDİŞƏ*** (f) - Düşüncə/ fikir/ dərd/ qayğı/ maraq.
***ƏNDUH*** (f) - Qəm/ qüssə/ kədər/ qayğı.
***ƏNDÜŞTHÜMA*** (f) - Barmaqla göstəriləcək dərəcədə məşhur/ diqqəti cəlb edən.
***ƏNGƏBİNƏ*** (f) – Bal.
***ƏNİS*** (ə) - Yaxın adam/ yoldaş/ həmdəm.
***ƏRAQ*** (ə) - Tər/ araq.
***ƏRBAB*** (ə) - Yiyə/ sahib/ mülkədar.
***ƏRBƏ*** (ə) - Dörd.
***ƏRCÜMƏN*** (ə) - Məclis/ cəmiyyət/ toplanış
***ƏRMƏQAN*** (f) - Hədiyyə.
***ƏRSƏ*** (ə) - Meydan/ düzən.
***ƏRŞ*** (ə) - Qüllə/ taxt-tac/ ən üca yer/ göy/ səma.
***ƏRUS*** (ə) - Gəlin..
***ƏRZƏL*** (ə) - Ən rəzil/ çox alçaq adam.
***ƏSB*** (f) - At.
***ƏSBAB*** (ə) - Paltarlar
***ƏSƏL***(ə) - Bal.
***ƏSĞƏR*** (ə) - Daha kiçik/ ən kicik.
***ƏSHAB*** (ə) - Sahiblər/ tərəfdarlar/ müsahiblər/ həmsöhbətlər.
***ƏSHƏB*** (ə) - Ağımtıl.
***ƏSHƏL*** (ə) - Daha hasan/ çox asan.
***ƏSNA*** (ə) - Ara/ aralıq/ an.
***ƏSRAR*** (ə) - Sirlər.
***ƏŞHƏR*** (ə) - Sənət yoldaşı/ həmməslək/ oyun yoldaşı/ düşmən/ rəqib.
***ƏŞXAS*** (ə) - Şəxslər/ adamlar.

***ƏŞK*** (f) - Göz yaşı.
***ƏTA*** (ə) - Vermə/ veriş/ bağışlama/ bəxşiş.
***ƏTFAL*** (ə) - Tifillər/ uşaqlar/ cocuqlar.
***ƏTİBBAXANƏ*** (ə+f) - Həkimxanə.
***ƏUMMƏ*** (ə) - İmamlar.
***ƏVAM*** (ə) - Adi xalq kütləsi/ xalqın savadsız hissəsi.
***ƏVAR*** (ə) - Eybəcərlik/ çirkinlik.
***ƏVƏLLA*** (ə) - İanə edilmiş əmlak üstündə nəzarət/ bir adamın dostluğunu qazanmaq üçün təşəbbüs.
***ƏYYAM*** (ə) - Günlər/ zaman/ zəmanə/ dövr.
***ƏYYİHƏNNAS*** (ə) - Ey adamlar/ ey camaat.
***ƏZ*** (f) - ...dan/ ...dən.
***ƏZBƏS*** (f) - O qədər ki.
***ƏZİMÜŞŞƏN*** (ə) - Şəni böyük olan/ dərəcəsi yüksək olan.
***ƏZRA*** (ə) - Bakirə/məşuqə.
***ƏZRƏQ*** (ə) - Göy rəng/mavi.

# F

***FAİDƏMƏND*** ə(+f) - Fayda/ mənfəət görən.
***FANİ*** (ə) - Puç olan/ qalmayan/ həmişəlik olmayan/ çox zəif/ gücsüz/ əldən düşmüş.
***FAŞ*** (f) - Meydana çıxmış/ ifşa olunmuş/ açıq/ aşkar.
***FAZİL*** (ə) - Fəzilət sahibi/ fəzilətli/ gözəl əxlaqa malik olan/ üstün/ yüksək/ artıq/ çox
***FE'L*** (ə) - İş/ hərəkət/ əməl/ həqiqət/ gerçəklik/ fitnə/ fəsad.
***FEYZ*** (ə) - Bolluq/ bərəkət/ nemət/ müvəffəqiyyət/ xeyir/ fayda/ ləzzət/ həzz.
***FƏHM*** (ə) - Anlayış/ anlaq/ idrak/ zəka/ anlama.
***FƏHMƏN*** (ə) - İdrakca/ fikirdən
***FƏQAN*** (ə) - Fəryad/ nalə.
***FƏLƏK*** (ə) - Göy/ asiman/ tale/ bəxt.
***FƏRAHƏM*** (f) - Toplu/ yığcam/ toplanmış/ düzəlmş.
***FƏRAQ/FİRAQ*** (ə) - Ayrılıq/ hicran.
***FƏRAMUŞ*** (f) - Unutma/ xatirdən çıxarma.
***FƏRD*** (ə) - Vacib/ zəruri/ vacib olan işlər.
***FƏRDİ*** (f) - Edilmiş iş/ əməl/ əkilmiş tarla.
***FƏRXƏNDƏ*** (f) - Uğurlu/ xoşbəxt.
***FƏR'İ*** (ə) - İkinci dərəcəli.
***FƏRİD*** (ə) - Tək/ misilsiz/ taysız.
***FƏRMAİŞ*** (f) - Buyuruq/ əmr.
***FƏRRAŞ*** (ə) - Xidmətçi.
***FƏRSUDƏ*** (f) - Köhnəlmiş/ bürüşmüş/ bürək/ əzik.
***FƏRŞ*** (ə) - Döşənəcək/ ayaq altına salınacaq şey/ döşəmə/ yer üzü.
***FƏRZ*** (ə) - Sanma/ hesab etmə/ vacib olan işlər/ vacib/ zəruri.

***FƏRZƏND*** (f)- Oğul/ övlad/ uşaq.
***FƏZİLƏT*** (ə) - Dəyər/ qədər/ məziyyət/ ləyaqət/ hünər/ bilik/ mərifət/ istedad/ kamillik/ üstünlük/ gözəl əxlaq/ əliaçıqlıq/ comərdlik/ səxavət.
***FƏZL*** (ə) - Ləyaqətli/ üstün.
***FİQH*** (ə) - Şəriət məsələlərindən bəhs edən elmlərdən biri.
***FİLFÖVR*** (ə) - Dərhal/ həmin saat/ o saat/ tez.
***FİLHƏQİQƏT*** (ə) - Həqiqətən/ doğrudan/ gerçəkdən.
***FİLMƏSƏL*** (ə) - Məsələn/ misal olaraq/ xalq arasında məhşur olan.
***FİLVAQE*** (ə) - Həqiqətən/ doğrudan/ olduğu kimi.
***FİRİŞTƏ*** (f) - Mələk/ məlaikə/ məsum/ günahsız/ çox gözəl və mülayim təbiətli.
***FİRQƏ*** (ə) - Bilik/ dəstə/ partiya.
***FÖVQ*** (ə) - Üst/ yuxarı.
***FÖVRƏM*** (ə) - Dərhal/ həmin saat/ tələsik/ tezliklə.
***FÖVT*** (ə) – Əldən qaçırma/ əldən çıxarma/ ölüm.
***FRAQƏT*** (ə) – Vaz keçmə/ əl çəkmə/ istirahət/ boş vaxt.
***FÜRUŞ*** (f) - Satan/ satış/ satma.
***FÜTÜVVƏT*** (ə) - Gənclik/ cavanlıq/ comərdlik/ səxavət/ əliaçıqlıq/ mərdlik/ igidlik.
***FÜZUl*** (ə) - Artıq/ lazımsız söz və ya şey/həddi aşma/ haqsız iş və ya hərəkət/ yersiz danışma/ danışığının yerini bilməyən.

# G

***GAH*** (f) - Zaman/ vaxt/ yer/ məkan.
***GƏNC*** (f) - Xəzinə/ dəfinə/ qızıl/ gümüş/ daş-qaş.
***GƏR*** (f) - Əgər.
***GƏRÇİ*** (f) - Hərçənd/ buna baxmayaraq/ hər nə qədər olsa.
***GƏRDƏN*** (f) - Boyun.
***GƏRDİŞ*** (f) - Əldən-ələ gəzmə/ gəzinti/ seyr/ dolanma.
***GƏRM*** (f) - İsti/ qaynar/ məşqul/ məşqul olan/ bazarı yaxşı olan/ alveri yaxşı olan.
***GİLƏ*** (f) - İki dağ arasında olan yol.
***QİRAN*** (ə) - Yaxınlıq/ ulduzların bir-birinə yaxınlaşması.
***GİRD*** (f) - Çevrə/ dönmə/ dolanma.
***GİRDAR*** (f) - Çayda və ya dənizdə qarşı-qarşıya cərəyanların burulduğu yer/ su burulğanı/ təhlükəli yer/ xətalı yer.
***GİRİBAN*** (f) - Yaxa.
***GİRYAN*** (f) - Ağlayan/ ağlaya-ağlaya/ ağlayaraq.
***GÖFTGÜ*** (f) - Söhbət/ danışıq.
***GUŞ*** (f) - Qulaq/ diqqət.
***GÜLGÜN*** (f) - Gülrəngi/ qızılgül rəngində olan/ al.
***GÜNCAYIŞ*** (f) - Tutum/ meyl/ həvəs.
***GÜRZ*** (f) - Toppuz.
***GÜŞAD*** (f) - Geniş/ açıqlıq.

***GÜVA*** (ə) - Qüvvətlər.
***GÜZAR*** (f) - Qoyan/ qoyma.
***GÜZƏR*** (f) - Keçmə/ yol getmə/ əl çəkmə.
***GÜZƏRGAH*** (f) - Keçilənlər/ həyat.

# H

***HADİ*** (ə) - Doğru yol göstərən/ düz yola çağıran/ bələdçi.
***HALAT*** (ə) - Hallar.
***HALƏT*** (ə) - Hal/ cürət/ vəziyyət/ keyfiyyət.
***HALİK*** (ə) - Həlak olan/ məhv olan/ puç/ batmış/ ümidsiz.
***HARAM*** (ə) -Yasaq edilmiş/ qadağan edilmiş/ toxunulmaz/ müqəddəs.
***HASİD*** (ə) - Həsəd aparan/ paxıl.
***HAŞA*** (ə) - Üzdən iraq/ bizdən uzaq/ Allah göstərməsin.
***HATƏM*** (ə) - Qət edən/ əmr edən/ qanunverən/ ərəb əsatirində çox səxavətli adam/ comərd/ əliaçıq/ səxavətli.
***HATİF*** (ə) - Qışqıran/ bağıran/ səslənən/ qeybdən gələn səs/ vicdan səsi.
***HAYİL*** (ə) - Dəyişmiş/ dəyişilmiş/ dəyişdirilmiş/ maneə/ çəpər/ hasar/ əngəl.
***HECAZ*** (ə) - Klassik muğam adı.
***HEYBƏT*** (ə) - Qorxu/ dəhşət/ hörmət/ izzət/ ləyaqət/ etibar/ nüfüz.
***HEYDƏR*** (ə) - Aslan/ şir/ igid/ cəsur/ Həzrət Əliyə verilmiş ad.
***HEYVAN*** (ə) - Dirilik/ sağlıq/ həyat etmə/ dua/ tərif etmə.
***HƏBLÜLMƏTİN*** (ə) - Möhkəm/ davamlı iş/möhkəm bağ/ səmimi dostluq.
***HƏCƏR*** (ə) - Daş.
***HƏLLACI*** (ə) - Pambıq atma sənəti/ duru şeyləri ölçmək üçün ölçü/ qab.
***HƏMAQUŞ*** (f) - Qucaqlaşma/ bir-birini qucaqlama.
***HƏMCƏLİS*** (f+ə) - Birgə oturub duran/ tay-tuş.
***HƏMDƏM*** (f) - Həyat yoldaşı/ ürək yoldaşı/ səmimi dost/ sirdaş.
***HƏMDƏST*** (f) - Birgə çalışan/ yoldaş/ köməkçi.
***HƏMƏL*** (ə) - Quzu/ astronomiyada 12 bürcün birisidir/ həməl bürcü/ quzu bürcü.
***HƏMXABƏ*** (f) - Arvad/ qadın/ zövcə.
***HƏMİYYƏT*** (ə) - Ruh yüksəkliyi/ şərəf hissi/ qeyrət.
***HƏMMAL*** (ə) - Hambal.
***HƏMRAH*** (f) - Yoldaş/ həmyol.
***HƏMRAZ*** (f) - Sirdaş.
***HƏNG*** (f) - Qəsd/ niyyət/ səslər və rənglər arasında olan harmonik uyğunluq.
***HƏNUZ*** (f) - Hələ/ hələ ki/ indi/ indicə/ bu saat.
***HƏRAZ*** (f) - Qorxu/ qorxma/ hürkmə/ qorx!/ çəkil!/ saqın!

***HƏRASAN*** (f) - Qorxaq/ hürkək.
***HƏRCAY*** (f) - Hər yerdə olan/ xüsusi bir yeri olmayan/ sərsəri/ dərbədər/ boş/ nahaq.
***HƏRƏM*** (ə) - Misir ehramları/ qadağan olunmuş yer/ ərli qadın/ müqəddəs yer/ ziyarətgah.
***HƏRGİZ*** (f) – Heç vaxt/ heç bir zaman/ əsla.
***HƏRİF*** (ə) - Sənət yoldaşı/ həmməslək/ kef oyun yoldaşı/ gücdə bilikdə bərabər olan/ düşmən/ rəqib.
***HƏSƏB*** (ə) - Adlı-sanlı/ ad-san/ əsilzadə.
***HƏSİD*** (ə) - Həsəd aparma.
***HƏŞƏM*** (ə) - Maiyyət/qulluqçu və nökərlər.
***HƏVADİS*** (ə) - Hadisələr.
***HƏZAR*** (ə) - Min/ bülbül.
***HƏZARAT*** (ə) - Həzrətlər/ ağalar/ cənablar.
***HİCR***(ə) - Ayrılıq/ ayrılma.
***HİKMƏT*** (ə) - Həkimlik/ filosofluq/ fəlsəfə/ gizli sirr/səbəbi anlaşılmaz olan/ hakimanə söz/ məsəl/ qəribə şey/ əcaib.
***HİLAL*** (ə) - Bir neçə gecəlik təzə ay/aypara/ klassik şerdə gözəlin qaşı mənasında.
***HİMMƏT*** (ə) - Çalışma/ çapalama/ səy/ cəhd/ comərdlik/ qəsd/ yüksək fikirlər/ düşüncələr.
***HÜDHÜD*** (ə) - Şinəbub/ şanəpipik/ hophop.
***HÜMMAN*** (ə) - Hümmət sahibi/ çalışqan adam.
***HÜNƏR*** (f) - Məharət/ ustalıq/ elm/ fənn/ incəsənət.
***HÜSN*** (ə) - Dözəllik/ camal/ yaxşılıq.
***HÜŞYAR*** (f) - Ayıq/ sayıq/ ağıllı/ fərasətli/ diqqətli/ dəqiq.
***HÜVEYDA*** (f) - Bəlli/ aşkar/ zahir.
***HÜZZAİ*** (ə) - Hazırlı/ hazırlanmada iştirak edən.
***HÜZZAR*** (ə) -Hazırlar/ hazır olanlar/ iştirak edənlər.

# X

***XAB*** (f) -Yuxu/ röya/ yuxu görmə.
***XAB*** (ə) - Xov/ narın tük.
***XABİKƏH*** (f) - Yataq/ üstüaçıq taxt/ çarpayı/ yataq otağı.
***XAH*** (f) - İstər/ istərsə/ istəyən/ arzulayan.
***XAHƏR*** (f) - Bacı.
***XAK*** (f) - Torpaq/ tər/ yer kürəsi/ ölkə/ diyar/ çürümüş/ yox olmuş/ torpaq olmuş.
***XAKİSTƏR*** (f) - Kül.
***XAKSAR*** (f) - Torpağa çevrilmiş/ çürümüş/ zəlil/ xar.
***XALİ*** (ə) - Boş/ yiyəsiz/ sərbəst.
***XALİQ*** (ə) - Xəlq edən/ yaradan/ yaradıcı.
***XAMƏ***(f) - Qələm/ üslub.
***XAN*** (f) - Karvansara/ süfrə/ xonça/ oxuyan/ oxucu.

***XANƏDAN*** (f) -Ailə/ ocaq/ sülalə/ qonaqsevən/ qonaqpərəst.
***XANƏXARAB*** (f+ə) - Evi dağılmış/ evi yıxılmış/ fəlakətə uğrayan/ bədbəxt.
***XAR*** (ə) - Zəlil/ həqir/ alçaq/ tikan.
***XAR XƏSU*** (f) - Çör-çöp.
***XASS*** (ə) - Xüsusi/ ayrıca/ əlahiddə/ məxsus/ aid olan/ imtiyaz/ xüsusi/ şəxsi.
***XASSƏ*** (ə) - Bir adama ya bir şeyə məxsus olan hal/ xasiyyət/ xüsusiyyət.
***XASSÜ AM*** (ə) - Qocalardan tutmuş uşaqlara qədər/ hamı/ camaat.
***XAŞAK*** (f) - Çör-çöp/ zir-zibil/ xırım-xırda.
***XƏBBAZİ*** (ə) - Çörək bişirmə/ çörəkçi.
***XƏBİS*** (ə) - Alçaq/ yaman/ yaramaz.
***XƏDD*** (ə) - Yanaq/ üz/ qırış/ qırışıq.
***XƏDƏNG*** (f) - Ağcaqovaq/ ox.
***XƏFA*** (ə) - Gizlilik/ məxfilik/ gizli şey/ sirr.
***XƏLAQ*** (ə) - Yaradıcı/ qurucu/ Allah.
***XƏLAYİQ*** (ə) - Bütün canlılar/ məxluqat/ xalq/ xasiyyət/ xislət/ kəniz/ xidmətçi qız.
***XƏNDAN*** (f) - Gülən/ gülər/ şən/ şad/ gülə-gülə/ gülərək/ tam açılmış gül.
***XƏR*** (f) - Eşşək.
***XƏRİ*** (f) - Xərifləmiş/ qocalıqdan səfehləmiş.
***XƏRİDAR*** (f) - Alıcı/ satın alan/ müştəri.
***XƏRİF*** (ə) - Payız fəsli/ xəzan.
***XƏRQUŞ*** (f) - Dovşan.
***XƏSTƏ*** (f) - İncimiş.
***XƏSÜ/XƏSÜ-XAR*** (f) - Çör-çöp.
***XƏYYAT*** (ə) - Dərzi.
***XİLAİ*** (ə) - Zidd/ qarşı/ əks/ ixtilaf/ ziddiyət.
***XİFFƏT*** (ə) - Xəfiflik/ yüngüllük/ dərd/ kədər/ yelbeyinlik/ pərtlik.
***XİLQƏT*** (ə) Yaratma/ yaradılış/ təbiət.
***XİRDƏ*** (ə) - Bez və ya qumaş parçası/ dərvişlərin geydiyi üst paltar/ cübbənin altından və gecə köynəyinin üstündən geyilən pambıqlı paltar.
***XİRƏ*** (f) - Bulanıq/ bulanmış/ çaşqın/ mat/ bihudə/ əbəs/ boş/ tərs/ kobud olan.
***XİRƏD*** (f) - Ağıl/ fikir/ huş.
***XİRİDAR*** (f) - Ağıl sahibi/ ağıllı.
***XİSALİL***(ə) - Xasiyyətlər.
***XİSLƏT*** (ə) - Xasiyyət/ təbiət.
***XİŞ*** (f) - Öz-özü/ qohum əqrəba.
***XOR*** (f) - Günəş.
***XOŞA*** (f) – Nə gözəl/nə yaxşı.
***XOŞBU*** (f) - Xoş iyli/ ətirli/ rəqib/ bərabər olan
***XOŞBULƏR*** (f) - Xoş iyli/ xoş ətirli
***XOŞDİL*** (f) - Şad/ şən
***XOŞXİSAL*** (ə) - Xoş xasiyyətlər
***XOŞXÜRRAM*** (f) - Gözəl yeriş/ nazlana-nazlana yeriş
***XOŞLİQA*** (f+ə) - Siması gözəl
***XPŞMƏQAL*** (f+ə) - Xoşsöhbət/ söhbətcil
***XOŞNUD*** (f) - Razı/ məmnun
***XOŞTƏR*** (f) - Daha yaxşı
***XU*** (f) - Xasiyyət/ qılıq.

***XUB*** (f) - Yaxşı/ əcaib/ qəribə/ gözəl/ göyçək.
***XUBRU*** (f) - Gözəl üzlü.
***XUD*** (f) - Öz/ özü/ dəbilqə.
***XUN*** (f) - Qan.
***XUNXAR*** (f) - Qaniçən/ zalim/ qəddar.
***XUNİ CİYƏR*** (f) - ciyər qanı/ dərd/ qəm.
***XUNRİZ*** (f) - Qan tökən/ zalım.
***XURİŞ*** (f) - Ərzaq/ yemə içmə.
***XURŞİD*** (f) - Günəş.
***XUŞƏ*** (f) - Başaq/ sünbül/salxım.
***XUŞAÇİN*** (f) - Başaqçı/ sünbül yığan.
***XÜLQ*** (ə) - Xasiyyət/ təbiət.
***XÜNAB*** (f) - Qan yağdıran/ çox ağlayan/ çox göz yaşı tökən/ qaniçən/ zalım.
***XÜRD*** (f) - Kiçik/ balaca/ xırda/ nazik.
***XÜRDİ*** (ə) - Xasiyyət/ təbiət.
***XÜRDÜ XAB*** (f) - Yeyib-yatma/ rahatlıq.
***XÜRRƏM*** (f) - Sevinc/ şad/ şən.

# İ

***İBA*** (ə) - Razı olmama/ qəbul etməmə/ rədd etmə.
***İBRAZ*** (ə) - Zahirə çıxarma/ aşkara çıxarma/ büruzə vermə/ təzahür etmə.
***İCTİNAB*** (ə) - Sığınma/ çəkinmə.
***İDBAR*** (ə) - Yaratma/ ixtiraetmə/ icad etmə/ kəşf etmə/ ixtira/ icad/ kəşf.
***İDDA*** (ə) - Ədəd/ möhlət.
***İĞMAZ*** (ə) - Böhtan/ qeybət/ göz yumma/ görməməzliyə qoyma.
***İXLAS*** (ə) - Təmiz məhəbbət/ sədaqət/ ürəyi təmizlik/ səmimiyyət.
***İQD*** (ə) - Boyunbağı/ düzülmüş inci/ cəvahir və c.
***İQRAR*** (ə) - Qərarlaşdırma/ yerləşdirmə/ söyləmə/ vəd etmək/ danışıq/ təsdiq etmə/ qəbul etmə/ boynuna alma/ etiraf etmə/ təsdiq/ etiraf.
***İKRAH*** (ə) - İyrənmə/ nifrət etmək.
***İLLƏT*** (ə) - Xəstəlik/ naxoşluq/ qüsur/ əskiklik/ nöqsan/ dəlil/ əsas/ sübut/ səbəb/ məqsəd/ qayə.
***İMSAK*** (ə) - Nəfsini saxlama/ pəhriz saxlama/ qənaət.
***İNBİSAT*** (ə) - Yayılma/ genişlənmə/ sevinmə/ fərəhlənmə/ ürəyi açılma.
***İNHİRAF*** (ə) - Dönmə/ doğru yoldan çıxma/ bir tərəfə meyl etmə/ dəyişmə/ pozulma/ xarab olma/ qırılma.
***İNKİSAR*** (ə) - Qırma/ sınma/ tabe olma/ ram olma/ könlü qırılma/ ürəyi qalma.
***İNQİLAB*** (ə) - Bir haldan başqa hala düşmək.
***İNTİXAB*** (ə) - Seçmə/ bir şeyin ən yaxşısını ayırma/ bir heyətə, qurultaya üzv seçmə.

***İNTİHA*** (ə) - Sona çatma/ axıra yetişmə/ tükənmə/ bitmə/ son/ axır/ nəhayət.
***İNZİVA*** (ə) - Bir guşəyə çəkilmə/ dünyadan əl çəkmə.
***İRŞAD.*** (ə) - Doğru yol göstərmə/ doğru yola çəkmə.
***İSAL*** (ə) - Çatdırma/ yetirmə.
***İSTADƏ*** (f) - Dayanmış/ durmuş.
***İSTEHBAB*** (ə) - Sevmə/ bəyənmə/ xoşlama.
***İSTE"MAL*** (ə) - İşlətmə/ işləmə.
***İSTİQBAL*** (ə) - Gələcək/ qarşılama/ gələn adamın qarşısına çıxma.
***İİSTİĞNA*** (ə) - Əlindəki ilə kifayətlənmə/ qane olma/ etinasız olma/ etina etmə/ maddi cəhətdən təmin olma/ heçbirşeyə ehtiyac duymayan.
***İSTİĞFAR*** (ə) - Bağışlanmasını istəmə/ üzr istəmə.
***İSTİXARƏ*** (ə) - Dindar şəxslərin görüləcək bir işin xeyirli olub-olmayacağını bilmək ücün quran, təsbeh və sairə ilə fal açmaq.
***İŞRƏT*** (ə) - Kef çəkmə/kef.
***İŞTİBAT*** (ə) - Səhv/ yanlış/ şübhələnmə/ şəkk etmə/ xəsislik/ bərklik/ canına qıymama/ ramazanda orucun başlanması.
***İŞTİYAQ*** (ə) - Arzu etmə/ çox istəmə.
***İTAB*** (ə) - Məzəmmət etmə/ danlama.
***İTMAM*** (ə) - Tamamlama/ axıra çatdırmaq/ sona yetirmək.
***İTTIHAD*** (ə) - Birləşmə/ birlik/ ittifaq/ həmfikir.
***İTTİSAF*** (ə) - Vəsf etmə/tərifləmə.
***İZHAR*** (ə) - İfadə etmə/ meydana çıxarma/ aşkar etmə.
***İZZ*** (ə) - Əzəmət/ şan/ ləyaqət.
***İZZƏT*** (ə) - Qiymət/ qədr/ etibar/ şərəf/ qüdrət/ qüvvə/ cəlal/ hörmət/ heysiyyat/ vüqar.

## J

***JAJ*** (f) - Hədyan/ çərən-pərən.
***JALƏ*** (f) - Şeh.
***JƏRF*** (f) - Dərin.
***JİNDƏ*** (f) - Yırtıq/ yamaqlı/ solğun.

## K

***KAFİR*** (ə) - İslam dinini tanımayan/ müsəlman olmayan/ itaətsiz/ üsyankar/ cüvəllağı/ qırışmal.
***KAH*** (f) - Saman.
***KAMİL*** (ə) - Bişkinlik/ yetkinlik/ nöqsansızlıq/ mükəmməllik/ tamlıq.
***KAR*** (f) -İş/ qazanc/ fayda/ təsir/ peşə.

***KAVIŞ*** (f) - Arama/ artırma/ tədqiqat/ qazıntı.
***KAZİB*** (ə) - Yalançı/ yalan danışan/ fırıldaqçı.
***KƏBƏTEYN*** (ə) - Kəbə və Qüdsdəki ibadətgahların birgə adı.
***KƏBİR*** (ə) - Böyük/ ulu/ yaşlı/ qoca/ mühüm/ ciddi.
***KƏC*** (ə) - Əyri/əyilmiş/səhv/ xəta/ tərs/ nəhs/ alçaq keyfiyyət.
***KƏFAF*** (ə) - Yaşamaq üçün vəsait/ dolanacaq.
***KƏFFAF*** (ə) - Çəkmətikən.
***KƏLB*** (ə) - İt/ qapan it/ quduz it.
***KƏM*** (ə) - Neçə/ nə qədər.
***KƏM*** (f) - Əskik/ az/ nöqsan/ pis/ yaman.
***KƏMƏRBƏST*** (f) - Beli bağlı/ beli bağlanmış/ qulluq etmək/ hazır.
***KƏMTƏR*** (f) - Lap az / azca/ etibarsız.
***KƏRD*** (f) - Edilmiş iş/ əməl.
***KƏRƏ*** (ə) - Alicanablıq/ comərdlik/ lütf/ mərhəmət/ bağışlama.
***KƏRR*** (a) - Müharibədə bir dəfə geri çəkildikdən sonra təkrar hücum etmə/ hücum.
***KƏRRAT*** (ə) - Dəfələr/ dəfələrlə.
***KƏSAFƏT*** (ə) - Bulanlıq/ sıxlıq/ qalınlıq/ natəmizlik/ çirkinlik/ pintilik.
***KƏSB*** (ə) - Qazanma/ qazanc/ ələ gətirmə/ sənət/ məşğuliyyət.
***KƏSTƏR*** (ə) - Çoxluq/ bolluq/ artıqlıq/ həddən ziyadəlik/ qələbəlik/ basabas.
***KİBR*** (ə) - Böyüklük/ böyük olmaq/ lovğalanma/ qürurlanma.
***KİFAF*** (ə) -bəs olma.
***KİNAYƏT*** (ə) - Doğrudan-doğruya söylənilib, dolası ilə bir mənanı ifadə edən söz/ toxunan söz.
***KİRDAR*** (f) - İş/ əməl/ hərəkət/ güc/ qüvvət/ qayda/ təhər/ tərz.
***KİZB*** (ə) - Yalan.
***KÖVKƏB*** (ə) - Göy cismlərinin hər biri/ ulduz.
***KÖVSƏR*** (ə) - Dini əfsanəyə görə cənnətdə bir bulaq adı.
***KU/KUY*** (f) - Harda/ hansı/ küçə/ məhəllə/ keçiləcək yer/ oyun topu.
***KUH*** (f) - Dağ.
***KUR*** (f) - Kor.
***KUŞT*** (f) - Ət.
***KÜDURƏT*** (ə) - Bulanıqlıq/ tutqunluq/ qəm/ qüssə/ dərd.
***KÜLAH*** (f) - Papaq.
***KÜLAHDU*** (f) - Papaqçı.
***KÜLBƏ*** (ə) - Qamış ev/daxma/ kasıb evi/ matəmxana/ yasxana/ bu dünya/ təndirin havakeşi.
***KÜR*** (f) - Kürə/ mədən ocağı/ dəmirçi ocağı/ yeraltı su yatağı.
***KÜRSİ*** (ə) - Ərşin altındakı göy təbəqəsi/ taxt /mərkəz.
***KÜRUR*** (ə) -Təkrarlama/ birşeyin bir-biri ardınca olması/ yarım milyon.

# Q

***QAİL*** (ə) - Deyən/ söyləyən/ inanan/ etiraf edən.
gətirən/ yola çıxan/ yola düşən/elçi
***QAFİYƏPƏRDAZ*** (ə) - Qafiyə düzəldən/ qafiyə uyduran/ qafiyəbaz/ şair.
***QAFİL*** (ə) - Qayıdan/ bağlayan/ xəbərsiz/ diqqətsiz/ etinasız.
***QALİB*** (ə) - Üstün gələn/ qələbə çalan/ daha qüvvətli.
***QASİD*** (ə) - Məktub aparıb
***QAYƏT*** (ə) - Son/ nəhayət/ axır/ nəticə/ məqsəd/ hədd/ dərəcə/ çox/ çoxlu
***QAYİB*** (ə) - Hazır olmayan/ gözdən uzaq olan/ harada olduğu məlum olmayan.
***QAYİBANƏ*** (ə+f) - Qiyabi.
***QAZ*** (f) - Yarım dinar qiymətində pul.
***QEYBAN*** (ə+f) - Qeybi bilən/ qeybdən xəbər verən/ gələcəkdə olan hadisələri xəbər verən.
***QƏBA*** (ə) - Üst paltar.
***QƏBİH*** (ə) - Pis/ çirkin/ yaraşıqsız/ yöndəmsiz/ pis/ yaramaz.
***QƏDD*** (ə) - Boy/ qamət.
***QƏFLƏT*** (ə) - Xəbərsiz.
***QƏHR*** (ə) - Qəzəb/ hirs/ hiddət/ zorlama/ tabe olma/ dilxorluq/ pərtlik.
***QƏLLƏ*** (ə) - Taxıl/ arpa-buğda.
***QƏMƏR*** (ə) - Ay.
***QƏMFƏZA*** (ə+f) - Qəm artıran/ qəm gətirən.
***QƏNDİL*** (ə) - Çıraq/ çıl-çıraq/ sünbül kimi sallanmış çiçək/ alma növü.
***QƏNİ*** (ə) - Varlı/ dövlətə malik/ zənqin.
***QƏSƏM*** (ə) - And/ and içmə.
***QƏT*** (ə) - Kəsmə/ biçmə/ ayırma/ üzmə/ qırma/ ayırd etmə.
***QƏVAYİD*** (ə) - Qaydalar.
***QƏVAL*** (ə) - Danışıq/ uzunçu/ nağılçı/ nağıl/ söyləyən.
***QƏZAL*** (ə) - Ceyran balası/ buynuzları hələ çıxmayan ceyran/ gözəl.
***QIRTAS*** (ə) - Yazılacaq ağ kağız.
***QİSSƏ*** (ə) - Hekayə/ povest.
***QİT'Ə*** (ə) - Parça/ hissə/ qism/ ölkə/ məmləkət/ azı iki beytdən ibarət şeir parçası.
***QİYAS*** (ə) - Tutuşdurma/ müqayisə/ bənzətmə/ ölçü/ müqayisə nəticəsi.
***QOFTİ KU*** (f) - Söhbət/ danışıq.
***QÖVL*** (ə) - Söz/ danışıq/ söz vermə/ vəd etmə.
***QUL/ĞUL*** (ə) - Qulyabani.
***QULAM*** (ə) - Oğlan/ oğlan uşağı/ qul/ kölə..
***QÜLLƏ*** (ə) - Təpə/ zirvə.
***QÜLÜ*** (ə) - Qəlblər/ könüllər/ ürəklər.
***QÜRS*** (ə) - Dairəvi şey/ girdə şey.
***QÜTR*** (ə) - Ölkə/ tərəf.
***QÜVVƏ*** (ə) - Zor/ güc/ bacarıq/ istedad/ hiss/ duyğu/ quvvətlər

